**Azərbaycan Milli Elmlər Akademiyası**
**A. A. Bakıxanov adına Tarix İnstitutu**



# ŞƏKİ

*Biblioqrafik göstərici*

*Tarix-diyarşünaslıq materialları*



Bakı - 2019

*AMEA A.A.Bakıxanov adına Tarix İnstitutu Elmi Şurasının qərarı ilə çap olunur*

Layihə rəhbəri və elmi redaktor:
**Yaqub Mahmudov**
*Əməkdar elm xadimi, AMEA-nın həqiqi üzvü, Dövlət Mükafatı laureatı*

Redaktor: **Afaq Tahirova**

Tərtibçi: *f.ü.f.d.* **Zakirə Əliyeva**

**Şəki.** *Biblioqrafik göstərici. Tarix-diyarşünaslıq materialları.* Bakı: Turxan NPB. – 2019. - 552 s.

*Biblioqrafik göstərici Azərbaycanın keşməkeşli tarixə, zəngin ədəbi-mədəni irsə, yüksək sənətkarlıq məktəblərinə, şücaətli igidlərə və mütəfəkkir, tarixi şəxsiyyətlərə, füsunkar təbiətə malik olan Şəki bölgəsinə dair tarix-diyarşünaslıq materiallarını əhatə edir. Kitab Şəkinin öyrənilməsinə maraq göstərən araşdırıcılar, alimlər, tələbə və magistrantlar və region ilə yaxından tanış olmaq istəyən geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.*

Ş $\frac{0502000000-059}{(TNP)\ 2019}$



*Azərbaycanın hər bir şəhəri, hər bir kəndi bizim üçün əzizdir, doğmadır. Elə bir rayon yoxdur ki, mən orada olmayım. Dəfələrlə olmuşam və bundan sonra da olacağam. Hər bir rayon üzrə proqramlar var, vəsait ayrılır. Ancaq elə tarixi şəhərlər var ki, onların Azərbaycan tarixində, Azərbaycan xalqının formalaşmasında, Azərbaycanda dövlətçilik əsaslarının yaradılmasında xüsusi rolu vardır. Şəki o şəhərlərdəndir...*

***İlham Əliyev***
*Azərbaycan Respublikasının Prezidenti*

*Every city, every village of Azerbaijan is dear to us. I have been in all the districts. I have been for several times and, I will continue to visit. There are programs for each district and funds are allocated. But there are historical cities that have a special role in the history of Azerbaijan, in the formation of the Azerbaijani people, in the establishment of the statehood in Azerbaijan. Sheki is one of those cities ...*

***Ilham Aliyev***
*President of Azerbaijan Republic*

*Каждый город, каждое село Азербайджана дороги нам. Нет такого района, где я не побывал. Бывал неоднократно, буду посещать и впредь. По каждому району есть программы, выделяются средства. Но есть такие исторические города, которым принадлежит особая роль в истории Азербайджана, формировании азербайджанского народа, создании основ государственности в Азербайджане. Одним из таких городов является Шеки...*

***Ильхам Алиев***
*Президент Азербайджанской Республики*

# TƏRTİBÇİDƏN

Müstəqillik qazandığımız əsrimizdə elmi biblioqrafik fəaliyyət sahələrinə yeni rakursda, milli ədəbi-mədəni, mənəvi, tarixi dəyərlərimiz baxımından yanaşılması mühüm vəzifələrdəndir. Bu vəzifə müasir biblioqrafiyanın tədqiqatçı funksiyasının qarşısına da yeni tələblər qoyur. Azərbaycanın tarixi keçmişi və gələcəyi arasında ən müxtəlif sahələrdə biblioqrafik körpülər qurmaq, ciddi, etibarlı, əlverişli şəkildə sistemləşdirilmiş informasiya mənbələrindən əbədi yaşayacaq və daim inkişafda, zənginləşməkdə olacaq təməllər yaratmaq milli biblioqrafiya elmimizin bəşəri missiyasıdır. Həsr edildiyi mövzudan asılı olmayaraq, mükəmməl tərtib edilmiş hər hansı biblioqrafik vəsait həm tədqiqat funksiyasını daşıyır, həm də zəngin informativ mənbə kimi, paralel olaraq elmi nəzəri təcrübi əhəmiyyət kəsb edir.

Hazırda Azərbaycanın müxtəlif bölgələrinin tarixinə, arxeologiya və etnoqrafiyasına, təbii-coğrafi şəraitinə, yeraltı və yerüstü sərvətlərinə, mədəni həyatına, ədəbiyyatına və s. həsr edilmiş elmi, kütləvi, ensiklopedik nəşrlər işıq üzü görməkdədir. Bütün bu yeni və artıq mövcud olan çap məhsullarını və digər informasiya mənbələrini əhatə edə biləcək, Azərbaycan regionlarının daha mükəmməl və əhatəli öyrənilməsi məqsədinə xidmət edəcək tarix-diyarşünaslıq xarakterli biblioqrafik bələdçilik edəcək nəşrlərə ehtiyac vardır. Bu məqsədlə müasir Azərbaycan tarixşünaslığının görkəmli nümayəndəsi, AMEA-nın həqiqi üzvü, Dövlət Mükafatı laureatı, akademik Yaqub Mahmudovun təşəbbüsü və elmi rəhbərliyi ilə A.A.Bakıxanov adına Tarix İnstitutunda işçi qrupu yaradılmış və bu istiqamətdə nəşrlərin biblioqrafik tədqiqatlarının aparılmasına qərar verilmişdir. Həmin qəbildən öyrənilməsinə ehtiyac duyulan və biblioqrafik tədqiqinə qərar verilmiş ilk region Azərbaycanın özünəməxsus tarixi keçmişi, zəngin ədəbi-mədəni irsi, füsunkar təbiəti ilə seçilən Şəki olmuşdur.

Azərbaycan Respublikasının Prezidenti Cənab İlham Əliyev bu region səfəri zamanı çıxışında qeyd edirdi: "Azərbaycanın hər bir şəhəri, hər bir kəndi bizim üçün əzizdir, doğmadır. Elə bir rayon yoxdur ki, mən orada olmayım. Dəfələrlə olmuşam və bundan sonra da olacağam. Hər bir rayon üzrə proqramlar var, vəsait ayrılır. Ancaq elə tarixi şəhərlər var ki, onların Azərbaycan tarixində, Azərbaycan xalqının formalaşmasında, Azərbaycanda dövlətçilik əsaslarının yaradılmasında xüsusi rolu vardır. Şəki o şəhərlərdəndir. Bu gün Şəkinin gələcək inkişafı ilə bağlı konkret proqramlarımız vardır. Bu proqramlar əvvəlki dövrdə də olmuşdur. Regionların sosial-iqtisadi inkişafı Dövlət Proqramının icrası nəticəsində böyük işlər görülmüşdür. Növbəti mərhələ daha da ciddi, təsirli olmalıdır. Nəticələr də daha da gözəl olmalıdır".

AMEA-nın həqiqi üzvü, akademik Yaqub Mahmudovun ideya müəllifliyi, elmi məsləhətçiliyi ilə ərsəyə gəlmiş bu kitab Azərbaycan Respublikasının Prezidentinin qeyd etdiyi kimi Regionların sosial-iqtisadi inkişafı Dövlət Proqramı çərçivəsində "daha da ciddi, təsirli və gözəl nəticələr əldə etmək" yolunda atılmış uğurlu addımların tarixi güzgüsüdür.

Azərbaycan biblioqrafiyaşünaslığında tarix-diyarşünaslıq xarakterli bu ilk elmi informativ-biblioqrafik nəşrdə Şəkinin tarixinə, arxeologiya və etnoqrafiyasına, coğrafiyasına, ədəbi-mədəni, siyasi-iqtisadi, elmi həyatına və müasir inkişaf səviyyəsinə dair materiallar öz əksini tapmışdır. Daxil edilən materiallar nəşr növlərinə görə (kitablar, qəzet və jurnal məqalələri, elmi əsərlər, internet resursları və s.) müxtəlif xarakterli materialları əhatə edir. Regionun tarixini, ictimai-siyasi həyatını, ədəbi-mədəni mühitini, sosial-iqtisadi inkişaf mərhələlərini və s. izləmək məqsədi ilə müxtəsər oçerklərlə təqdim edilən biblioqrafik siyahılar xronoloji axarda təqdim edilmişdir.

*Zakirə Əliyeva*
*Fil.ü.f.d., dosent*





# I HİSSƏ

## TARİXDƏ ŞƏKİ

Şəki Azərbaycanın ən qədim şəhərlərindən biridir. Şəki bölgəsində Azərbaycan xalqının formalaşmasında mühüm rol oynamış kimmer-iskit-sak türkləri hələ eramızdan əvvəl VIII əsrdən başlayaraq toplu halda məskən salmışlar. Arxeoloji qazıntı materialları ilə yanaşı qədim Aşşur (Asssuriya), Roma-yunan mənbələrində bu barədə zəngin faktik materiallar vardır. «Tarixin atası» Herodotun (e.ə. 484-425) «Tarix» əsərində, Ksenofontun (e.ə. 434-355) «Anabasis»ində, Strabonun (e.ə. 63-b.e. 23) «Coğrafiya»sında, Plininin (27-79) «Təbii tarix»ində, Plutarxın (46-127) «Paralel tərcümeyi hallar» əsərində, Klavdi Ptolemeyin (87-165) «Coğrafiya»sında bu barədə olduqca qiymətli məlumatlar vardır.

Müasir Şəki (Saki // Şaki) şəhərinin bölgədəki «Sakan» adlı tarixi vilayətin, Zaqatalanın, tarixi Sakasenanın adları məhz həmin Sak türklərinin yadigarlarıdır. İlk mənbələr sübut edir ki, Şəki ən azı 2700 illik tarixə malikdir. Ulu öndər Heydər Əliyevin təşəbbüsü ilə 1300 illiyi qeyd olunmuş «Kitabi-Dədə Qorqud» dastanlarından dövrümüzədək yadigar qalmış «Daşüz» (Daş Oğuz, Dış Oğuz) yer adı da məhz Şəki bölgəsindədir.

Azərbaycanın ən qədim şəhərlərindən biri olan tarixi Şəki /Şako, Şake, Şakkan və s./ vilayəti özünün eyni adlı mərkəzi ilə Azərbaycan Albaniya dövlətinin şimal-qərbində, Qafqaz sıra dağlarının ətəyində, Qəbələ vilayətindən şimal-qərbdə yerləşirdi; bu vilayət qərbdən və cənub – qərbdən tarixi Kambisena vilayəti ilə, şimal-şərqdən Lpiniya, cənub-şərqdən isə Qəbələ ilə həmsərhəd idi. Belə güman edilir ki, antik dövrdə Ay-Selena ilahəsinin məbədi Şəki vilayətində yerləşirdi. Şəkidə albanlarla, utilərlə yanaşı iskit və sakların nəsilləri də yaşayırdı və bu, «Şəki» toponimində öz əksini tapmışdır.

Bir çox Azərbaycan şəhərləri kimi, Şəki də qala divarları ilə əhatə olunmuşdu. VII əsrin ortalarında Azərbaycan ərəblərin aramsız hücumlarına məruz qalan zaman Salman ibn Rəbiə, ərəb tarixçisi əl-Bəlazurinin yazdığına görə, Beyləqanı, Şəmkiri, Qəbələni ələ keçirən ərəblər "Şəkkanın və əl-Kəmibəranın sahibləri ilə cizyə ödəmək şərti ilə sülh bağladı". Xəlifə I Validin dövründə (705-715) Albaniyanı bir dövlət kimi ləğv edən, buranı Xilafətin canişinliklərindən birinə çevirən ərəblər bölgəyə ağalığı saxlamaq üçün Şəkini özlərinin strateji bazası etdilər. Məhz bu dövrdə adı tez-tez Tiflisdən Telaviyə, oradan da Bərdə və Bab əl-Əbvaba aparan ticarət yolunun üstündə yerləşən Şəki şəhəri və eyni adlı vilayət Xilafətin şimal hüdudlarında mühüm rol oynamağa başladı.

Ərəb xilafətinin zəifləməyə başladığı VIII əsrin sonu-IX əsrin əvvəllərini Şəki məlikliyinin siyasi tarixinin başlanğıcı hesab etmək olar. XI əsrin əvvəllərinədək Şəki məlikliyi müstəqil siyasi vahid kimi mövcud olmuşdu. Moisey Kalankatlının məlumatına görə, "887-ci ildə Qriqor Hammam "dağılmış Alban padşahlığını bərpa" edərək, yalnız adı qalmış Arran vilayətinin bir hissəsində - tarixi Albaniyanın vilayətlərindən olan Şəkidə, hakimiyyəti ələ aldı. IX əsrin sonu, X əsrin əvvəlləri Sacilərin Cənubi Qafqazda fəallaşdığı dövrdür. Şəkidə hakimiyyətini saxlaya bilmiş Qriqor Hammam Cənubi Qafqazın əksər hissəsini tabe etmiş Sacilərdən vassal asılılığını qəbul etmişdi". X əsrin 60-cı illərində Sənəkərim Şəkidə hakimiyyəti ələ aldı. O, Sanariya vilayətini (yəni Kaxetini) də vahid hakimiyyəti altına aldı. Sənəkərim Kürün sağ sahil bölgələrindən bəzilərini də öz mülklərinə qataraq, bununla "Alban taxt-tacının bərpaçısı" adını qazana bildi. Sənəkərimin "albanların hökmdarı" adını qəbul etməsini kilsə böyük razılıqla qarşıladı, Alban katolikosunun özü yeni hökmdarın başına tac qoydu. Bu, Sənəkərimin müstəqillik əldə etdiyini təsdiq etməklə yanaşı, onun tarixi Albaniya ərazisinə iddiasını da əsaslandırırdı. Şəki məlikliyinin güclənməsi və onun hakiminin başına Alban hökmdarına məxsus tacın





qoyulması qonşu müsəlman və xristian hakimlərinin diqqətinə səbəb oldu. Salari hökmdarı İbrahim ona tac və başqa qiymətli hədiyyələr, Tao hökmdarı David Kuropalat isə padşahlıq çələngi və tünd qırmızı rəngli uzun padşahlıq xələti göndərdi. Sənəkərimin hakimiyyətinin tanınması təsadüfi olmayan mühüm siyasi hadisə idi.

X əsrin sonlarında Sənəkərimin ölümü Şəki məlikliyinin zəifləməsinə səbəb oldu. Vəziyyətdən istifadə edən abxaz hökmdarı III Baqratın 1009-cu ildə Şəki torpaqlarını talan etdi. Şəki hakimləri mənbənin verdiyi məlumata görə, "əvvəlki hakimlər yenidən öz ölkələrinə sahib oldular". Bu vaxtdan başlayaraq Səlcuq hücumlarınadək Şəki məlikliyi daxili müstəqilliyini saxlaya bildi. Axsartanın hakimiyyəti dövründə Səlcuq yürüşlərinin başlanması ilə əlaqədar «Cənubi Qafqazda, o cümlədən Şəki və onun ətraflarında mühüm hadisələr baş verir. Şirvan – gürcü münasibətlərinin kəskinləşdiyi bu dövrdə Şəki yaxınlığındakı bəzi qalaların, o cümlədən Şəkinin özünün əldən – ələ keçməsi Sultan Alp Arslanın hücumları ilə dayandırılır. 1067-ci ildə Şəki hakimi II Axsartan Səlcuq sultanı Alp Arslanın hüzuruna gələrək öz mülklərinin qorunması naminə, hətta islamı qəbul edərək, səlcuqlara bac verəcəyinə boyun olur. «Bununla belə sonrakı illərdə də Şəki və onun ətrafındakı qalalar uğrunda mübarizə davam edirdi.

Şəkinin sonrakı dövr tarixi bilavasitə Səlcuqlar, eləcə də Şirvanşahlar dövləti ilə bağlı olsa da, mənbələr ilk monqol hücumundan dərhal sonra, 1221-ci ildə, gürcülərin Şəki və Qəbələni ələ keçirməsi haqqında məlumat verir. Ən-Nəsəvinin yazdığına görə, 1227-ci ildə sultan Cəlaləddin Mənqburnı "Səfiəddin Məhəmməd ət-Tuğraini Şirvanın şəhərləri olan Şəki və Qəbələnin vəziri təyin etdi. Bu şəhərləri gürcülər Şirvan sahibindən bir neçə il əvvəl, hələ güclü olduqları vaxt tutub almışdılar". Beləliklə, Şəki məlikliyinin I dövrü öz müstəqilliyini müvəqqəti olsa da tam itirdi və həmin müstəqillik bir neçə əsr sonra yenidən bərpa olundu.

XIII əsrin ortalarında Azərbaycanın digər şəhərləri kimi Şəki şəhəri də Elxanilər dövlətinin tərkibində qaldı. XIV əsrin 30-cu illərində Elxanilər dövlətinin tənəzzülü və parçalanması nəticəsində bir sıra müstəqil dövlətlər meydana çıxdı. Azərbaycanın şimalında Şirvanşahlarla yanaşı Şəki hakimləri də daxili müstəqillik əldə etdilər və Oyrat qəbiləsi hakimiyyətə gəldi. Həmin dövrdən başlayaraq Şəki hakimləri ölkənin siyasi həyatında yaxından iştirak edir, öz müstəqilliklərini mühafizə etmək uğrunda mübarizə aparırlar. Bu mübarizədə Şəki-Şirvan, Şəki-Gürcüstan və Şəki-Teymuri münasibətləri az rol oynamamışdı.

V.Z.Piriyevin məlumatına görə, tarixçi Budaq Qəzvini 1324-cü il hadisələrindən bəhs edərkən yazmışdır ki, Əmir Çobanın oğlu Şeyx Mahmud Gürcüstan ərazisi ilə birlikdə Şirvan və Şəki vilayətlərinin də hakimi idi. Əbubəkr əl-Qütbi əl-Əhəriyə əsaslanan V.Z.Piriyev yazır ki, 1328- ci ildə Sultan Əbu Səid tərəfindən Şirvan və Şəki hakimi təyin olunmuş Əqbəti, öz oğlu ilə birlikdə 1338-ci ilə qədər həmin ərazinin hakimi olaraq qalmışdı. Adları çəkilən Şəki hakimləri müvəqqəti hakimlər olmuşdular. Belə ki, 1338-ci ildə Elxanilər dövlətində taxt-tac uğrunda mübarizənin güclənməsi Şəkidə Oyratlar nəslindən olan yerli hakimlərin güclənməsinə şərait yaratdı. Monqolların Azərbaycana yürüşləri zamanı monqol ordusunun tərkibinə qatılan türk tayfalarından biri də Oyratlar idi. Türk tarixçisi Z.V.Toğanın fikrincə, Oyratlar mənşəcə Uyğur türklərindən olmuşdu. 1239-cu ildə monqolların Azərbaycanı işğal etməsindən sonra ölkənin idarəsi Oyrat tayfasından olan Arqun Ağaya tapşırıldı. Bu dövrdə Şamaxı və Şəki ətrafında məskunlaşmış Oyratlar Kür hövzəsinin ən çoxsaylı və qüdrətli tayfalardan biri olmuşdu.

XIV əsrin II yarısında Şəki Şirvanşahların nüfuz dairəsində olmuşdu. Şirvanşahların XIV əsrin 80-ci illərindəki tarixində Şəkinin xüsusi mövqeyi vardır. Belə ki, 1382-ci ildə Şirvanda baş verən xalq hərəkatı nəticəsində hakimiyyətdən salınmış Şirvanşah Hüşəngin əvəzinə Şəkidə kiçik torpaq sahibi kimi fəaliyyət göstərən I Şeyx İbrahim taxta çıxarıldı və bu hal





Şirvan-Şəki münasibətlərinin gələcək inkişafına müsbət təsir göstərdi.

XIV əsrin sonunda Şəki hakimliyinin tarixində Teymur dövrü xüsusilə seçilir və müstəqillik mübarizəsi baxımından daha da səciyyəvidir. Teymuri tarixçisi Ş.Ə.Yəzdinin yazdığından bəlli olur ki, Əmir Teymur hələ ilk yürüşü dövründə (1386-1388) Şəki vilayətinə gəlir və ətraf ərazilərə qoşun hissələri göndərir. Onun sərkərdələrindən əmir Məhəmməd Dərviş Bərlas böyük dəstə ilə Şəki dağlarına daxil olur və oradakı camaatı itaətə cəlb edir, ərazini qarət edir. Əmir Teymur II yürüşü dövründə də (1392-1397) Gürcüstan istiqamətindən yenidən Şəkiyə daxil olur və Şeyx Nurəddin Sarıbuğanı çoxlu qoşun ilə dağlıq ərazilərə göndərir. Şəki hakimi Seydi Əli Orlat mülkünü və əmlakını atıb gedir. Şeyx Nurəddin isə onun evlərini, düşmən qəlbi kimi dağıtdı və xaraba qoydu, tarac yelinə verdi və yandırdı.

Əmir Teymurun oğlu Miranşahın Xoy ətrafında atdan yıxılaraq başından zədələnməsi sonra gördüyü lüzumsuz işlərin, yersiz hərəkətlərin təsiri Şəkidən də yan ötməmişdi. Ş.Ə.Yəzdinin yazdığına görə, o, 1395-ci ilin payızında Seydi Əli Orlatın müxalif çıxdığını zənn edib, yoxlamadan Şəkiyə qoşun çəkdi və onun vilayətini qarət etdi. Miranşahın bu hərəkəti Şəki hakiminin hiddətinə səbəb oldu. Ş.Ə.Yəzdi yazır ki, Seydi Əli islam şüarı ilə tanınsa da, onun vilayətini tarac etdikləri üçün gürcülərlə ittifaqa girdi və mühasirədə cana gəlmiş və sümüyünə bıçaq dirənmiş Sultan Tahiri xilas etmək məqsədilə Əlincəyə yollandı. Onlar Azərbaycan vilayətinə daxil olub müsəlmanların ərazisini dağıtmağa və təcavüzə əl atmağa başladılar. Sultan Səncər bu vəziyyətdən xəbər tutan kimi qala önündən çəkildi və Təbrizə gedərək hadisəni Miranşaha çatdırdı. Miranşah oğlu Əbu Bəkri güclü qoşun hissələri ilə həmin fitnəni yatırmağa göndərdi. Müttəfiqlər Sultan Tahiri azad edərək geri döndüyü zaman Əbu Bəkrin qoşunu onları haqladı. Tərəflər arasında vuruşma baş verdi. Miranşahın Şəkini qarət etməsini unutmayan

Seydi Əli Orlat intiqam almaq məqsədilə şəxsən Əbu Bəkrə hücum etdi, lakin döyüş zamanı oxla vurularaq öldürüldü. Buna baxmayaraq, Şəki-gürcü qoşunu Əbu Bəkrin ordusunu məğlubiyyətə uğratdı.

Şübhəsiz ki, Şəki hakiminin bu hərəkəti onun Teymurilərlə münasibətinə öz təsirini göstərdi. Ş.Ə.Yəzdi yazır ki, bir müddət əvvəl Şəki vilayətinin valisi Seydi Əli Orlat gürcü qoşunu ilə ittifaq bağlayıb Əlincə qalasına gəlmişdi və həyatına nadanlıq gətirmişdi. İndi onun oğlu Seydi Əhməd atasının günahı üzündən Əmir Teymurun intiqamından qorxaraq narahat hala düşmüşdü. O, Şirvanşah Şeyx İbrahimə pənah apardı. Şeyx İbrahim padşaha layiq bağışlanma üçün onu Əmir Teymurun hüzuruna gətirdi və günahlarının bağışlanmasını xahiş etdi. O, özü ilə qiymətli hədiyyələr gətirdi və 6 min at verdi. Əmir Teymur Seydi Əlinin günahını bağışladı, atasının mənsəbini və yerini ona bağışladı.

Əmir Teymurun ölümündən sonra Azərbaycanda onun varisləri arasında ciddi mübarizənin başlanması teymurilərin hakimiyyətini zəiflətdi. Bundan yararlanan Şəki hakimi Seydi Əhməd Teymuri asılılığından çıxaraq öz müstəqilliyini bərpa etdi. O, bu zaman Azərbaycan torpaqlarını teymurilərdən azad etmək uğrunda mübarizə aparan Şirvanşah Şeyx İbrahimin yaxın müttəfiqi kimi bu prosesdə iştirak etdi.

1410-cu ildə Qara Yusifin Azərbaycan Qaraqoyunlu dövlətini yaratması və 1412-ci ilin dekabrında Kür çayı sahilində Şirvanşah İbrahimi və müttəfiqləri Şəki hakimi Seydi Əhməd və gürcü çarı Konstantini məğlub etməsi ilə Şəki hakimliyi Qaraqoyunlu hökmdarının asılılığına düşdü. Tezliklə Şəki hökmdarı Qaraqoyunlu dövlətində baş verən çəkişmələrdən istifadə edib, öz müstəqilliyini bərpa etdi.

XV əsrin 40-cı illərində Şəki hakimiyyində Orlatlar sülaləsinin hakimiyyətini Qarakeşiş oğlu sülaləsi əvəz etdi. Hacı Seyid Əbdülhəmid «Şəki xanları və onların nəsilləri» adlı əsərində bu sülalə ilə bağlı yazır: «Rəvayətə görə, bu sülalənin banisi Əlican





adlı bir şəxs olmuşdur. O, yerli feodalların köməyi ilə Şəki vilayətində hakimiyyət başına keçərək burada 13 il (1444-1457) hakimlik etmişdir».

XV əsr qaynaqlarının təsdiq etdiyi kimi Şəki hakimliyi XIV əsrin sonu-XV əsrdə öz daxili müstəqilliyini qoruyub saxlamaq uğrunda mübarizə aparmışdı. Onlar nominal müstəqilliklərini saxlamaqla yanaşı, ayrı-ayrı vaxtlarda Azərbaycanın Şirvanşahlar, Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin nüfuz dairəsində qalmışdı. Buna baxmayaraq, Şəki hakimliyi uzun müddət tarixi ənənələrini qoruyub saxlamışdı.

Böyük İpək yolu üzərində yerləşən Şəki bütün Yaxın və Orta Şərqdə ipəkçiliyin vətəni idi: Hələ XIII-XIV əsrlərdə İtaliya tacirləri müntəzəm olaraq Şəkidən ipək alıb aparmışlar. İtaliya arxivlərindəki XIII-XIV əsrlərə aid şərq ipəyi növləri içərisində «Şəki ipəyi» («Setta Shaki») xüsusi olaraq qeyd olunurdu. «XV əsrdə Azərbaycanın xarici ticarət əlaqələrinin genişlənməsi, xüsusən Azərbaycan ərazisindən keçən beynəlxalq karvan yollarının daha da canlanması Azərbaycan şəhərlərinin, o cümlədən Təbriz, Şamaxı, Şəki və başqa şəhərlərimizin iqtisadi həyatına müsbət təsir göstərdi. ... Məhz Avropa-Asiya ticarətində əlaqələndirici rol oynadığı üçün Təbriz Yaxın və Orta Şərqin ən böyük ticarət mərkəzinə çevrildi. Ön Asiya ticarət mərkəzləri vasitəsilə İtaliyadan gətirilən mahud və şüşə məmulatı, Şəki, Şirvan, Gürcüstan, Gilan və Yəzdin xam və toxunulmuş ipəyi... məhz Təbriz bazarlarında satılırdı».

1501-ci ildə mərkəzləşdirilmiş Azərbaycan Səfəvi dövlətinin yaranması ilə Şəki hakimliyi I Şah İsmayılın vassal asılılığına düşdü. I Şah İsmayılın sağlığında Şəki hakimi Həsən bəy ilə Səfəvi hökmdarının münasibəti normal olmuşdur. Tarixçi Budaq Qəzviniyə görə, 1519-cu ildə Şah İsmayıl Təbriz qışlağında olarkən bu əzəmətli şahın görüşünə gələn qonşu ölkə hakimləri arasında Həsən bəy Şəkki də olmuşdur. Lakin 1524-cü ildə Şah İsmayıl üçün gözlənilməz bir hadisə baş verdi. Azacıq əvvəl Şəkidə ov edən Şah İsmayıl geri qayıdarkən, Şəki-Ərdəbil

yolunda olan Səfəvi hökmdarına xəbər verdilər ki, Kaxetiya hakimi Levan xan yenidən Şəkiyə hücuma keçmiş və Həsən bəy öldürülmüşdür. Şah İsmayıl geri qayıdıb Levanı cəzalandırmaq istədisə də, özü qəfildən vəfat etdi və bu gürcü çarı cəzalanmamış qaldı. Şəki hakimi Həsən bəydən sonra Şəki ölkəsinin başçılığına onun oğlu Dərviş Məhəmməd xan keçdi.

1538-ci ildə Şah Təhmasib tərəfindən Şirvanşahlar dövlətinə son qoyulması Şəki hakiminin Səfəvi şahı ilə münasibətlərinə öz təsirini göstərdi. O.Ə.Əfəndiyev yazır ki, Şirvan şahının şəxsində öz müttəfiqini itirən Şəki hakimi ölkəsinin müstəqilliyini saxlamaq naminə Şah Təhmasiblə gərginləşən münasibətini yaxşılaşdırmaq yolunu tutdu. Dərviş Məhəmməd xan hətta, Şirvanşahlar dövlətinin süqutundan bir il sonra Səfəvilərə yaxın qohum oldu və Şah Təhmasibin bacısı, mərhum Şirvanşah II Xəlilullahın dul qadını Pərixan xanımla evləndi. Lakin, bu şahzadə xanımın vəfatından sonra (təxminən 1547 - ci il) çox təəssüf ki, Şəki hakimi ilə Səfəvi şahının münasibətləri yenidən korlandı. Kərim ağa Fateh yazır ki, Dərviş Məhəmməd xan atası kimi şaha qulluq etmədi. Şirvan vilayətinə şahın qoşunu gəlib dava edəndə Məhəmməd xan da qoşun götürüb gedib Şirvanda qızılbaş qoşununa qarşı vuruşdu. Şah Təhmasib Dərviş Məhəmməd xanın bu hərəkətindən qəzəblənərək onu tənbeh etməkdən ötrü Şəkiyə qoşun yeritdi. 1551-ci ildə Gələsən-Görəsən qalasının ələ keçirilməsi ilə Şəki hakimliyinin müstəqilliyinə son qoyuldu. Şah Təhmasib tərəfindən Toygün xan Qacar Şəkiyə hakim təyin edildi.

XVI əsrin sonlarında Azərbaycanın əksər əraziləri kimi, Şəki bölgəsi də Osmanlı ordusu tərəfindən işğal edildi. 1603-1607-ci illərdə Şah Abbas tərəfindən Osmanlılar tərəfindən işğal edilmiş Azərbaycan torpaqları azad edildi. 1606-cı ildə Səfəvi şahı tərəfindən Şirvanın azad edilməsi üçün göndərilən ordunun tərkibində Şəki hakim Şahmir xan da var idi. A.A.Bakıxanov yazır ki, Şahmir xan «Şəkinin qədim valiləri nəslindən olub, bir müddət şahın hüzurunda idi». T.Musəvinin qənaətə görə, Şahmir xandan sonra Şəki hakimi Aslan Sultan olmuşdur. II Şah Abbas dövründə Şəkini Abbasqulu Sultan və məlik Səfiqulu idarə etmişdi. T.Musəvinin qənaətinə görə, «o dövrdə Şəki ölkəsi nisbətən müstəqil məliklik» hesab olunurmuş. T.Musəvi «Zeyli-tarixi-aləmarayi-Abbasi» əsərinə əsasən müəyyənləşdirmişdir ki, Məlik Səfiqulunun vəfatından sonra oğlu Səfərqulu Şəkinin məliyi olmuş, XVII əsrin sonlarında isə bu vəzifə Səfiqulu ailəsinə mənsub olmayan Məlik Həsənə verilmiş, Məlik Həsən vəzifədən kənar edildikdən sonra Məlik Səfərqulunun oğlu Məhəmmədxan bəy Şəki ölkəsinə məlik təyin edilmişdir.



Şəki. Biblioqrafik göstərici. Tarix-diyarşünaslıq materialları

E.Çələbinin verdiyi məlumata görə, daşdan tikilmiş Şəki qalası təpənin üstündə ucaldılmışdı. Qalanın Şirvan və Gəncə adlı iki darvazası var. Burda minlərlə ev, yeddi məscid, bir neçə karvansara, hamam və bazar vardı. Şəki qala divarlarının xaricində ipək istehsalı ilə məşğul olan müəssisələr və ipək istehsalı ilə məşğul olan geniş bağlar mövcud idi. E.Çələbinin qeyd etdiyinə görə, şəhərdə 3000 evdə 20.000-ə yaxın əhali yaşayırdı.

XVIII əsrin ortalarında Şəkidə Nadir şah rejiminə qarşı Hacı Çələbinin rəhbərliyi altında başlanan mübarizə 1743-cü ildə müstəqil Şəki xanlığının yaranması ilə nəticələndi. 1744-1745-ci illərdə Nadir şah Əfşar Gələsən-Görəsən qalasında mövqe tutmuş Şəki üsyançılarının iradəsini qıra bilmədi. Yalnız 1746-cı ilin martında ərzaq çatışmazlığı nəticəsində qalada yaranmış ağır vəziyyətlə əlaqədar Hacı Çələbi Nadir şahın hakimiyyətini tanıdığını bildirdi. 1747-ci ildə Nadir şahın öldürülməsi ilə onun yaratmış olduğu möhtəşəm imperiya dağıldı. Bundan istifadə edən Haçı Çələbi xan Şəki xanlığının müstəqilliyini bərpa etdi. Onun hakimiyyəti dövründə (1743-1755) Şəki şəhərində məscid, mədrəsə, hamam və b. ictimai binalar tikildi.

Şəki şəhəri 1765-ci ilə qədər orta əsr şəhəri kimi, qala divarları ilə əhatə olunmamışdı. Buna görə də, düşmən hücumu zamanı əhali Gələsən-Görəsən qalasına çəkilirdi. 1765-ci ildə şəhər qala hasarları ilə əhatə olundu. Şəhərin iki darvazası var

idi. 1772-ci ildə Kiş çayının daşması nəticəsində qədim Şəki şəhəri demək olar ki, tamamilə dağıdıldı. Şəhər əhalisinin bir qismi tələfata uğradı, bir hissəsi isə başqa yerlərə köçüb getdi, bir qismi isə indiki şəhərin yerləşdiyi ərazidə məskən salmışdı. Qısa müddət ərzində şəhər bərpa edilmişdi. Şəki şəhərini şərqdən qərbə axan Qurcanaçay iki hissəyə - şimal hissəsinə və cənub düzənlik hissələrinə bölür. Ticarət mərkəzinin formalaşması ilə əlaqədar şəhər çayın bir tərəfi ilə inkişaf etmişdir.

Şəki memarlıq tikintilərindən ibarət gözəl təbiət guşəsi kimi qavranılır. Sözsüz ki, buna səbəb özünəməxsus dağ mənzərəsi ilə bərabər təbiətlə sıx bağlanan planlaşdırma xüsusiyyətləridir. Demək olar ki, hər bir bina bağla və hasarla əhatə edilmişdir, Şəkinin küçələri dövrəyə düzülmüş evlərlə haşiyələnmir, barı və hasar divarları arası ilə əyri-üyrü dolanır. Ərazinin bərk dərə-təpəlik olması Şəkinin planlaşdırılmasının ümumi xarakterinə xeyli təsir göstərmişdir. Küçələrin istiqaməti Böyük Qafqaz dağ silsiləsinin qolları ilə təyin olunurdu. Bəzi küçələr şəhərdən şimalda yerləşən hündürlüklərin relyefinə paralel gedirdi. Şəhərin baş küçəsinin formalaşmasına Qurcanaçay və Dəyirmanarxın istiqaməti təsir göstərirdi. 1862-ci ildə Şəkinin tərtib olunmuş planında şəhərin 14 məhəlləsi öz əksini tapmışdır: 1.Çaqqal dərəsi, 2.Gileyli, 3. Dəmirçi bulağı, 4. Gəncəli, 5. Sarı torpaq, 6. Otaq eşiyi, 7. Ağvanlar, 8. Duluzlar, 9. Dodu, 10. Bağmanlar, 11. Sərkərlər, 12. Dabbaqxana, 13. Təzə kənd, 14. Köhnə kənd.

Şəkinin əsas şəhər tikinti xüsusiyyəti gözəl təbii şəraitlə, tikintinin ətraf mühitlə müvəffəqiyyətli əlaqəsi, yaşıllığın şəhərin görünüşündə əsas komponent kimi istifadəsi, gil borularla çəkilmiş su kəmərindən su ilə yaxşı təmin olunması ilə təyin olunurdu. Şəkini başqa şəhərlərdən fərqləndirən bir cəhət də onun çox səliqəli olmasıdır. Şəkinin bu xüsusiyyətini XIX əsrin ortalarında şəhərdə olmuş A.P.Zisserman belə təsvir edirdi: “Şəhər çox gözəl mənzərəli kiçik dağ çayının başlanğıcında yerləşmişdir: tikintilər böyük qoz və tut ağaclarından ibarət yaşıl





bağlar arasında gizlənir. Dağ tərəfə iki verstə qədər uzanıb gedən mərkəzi küçədə dükan, emalatxana yerləşir ki, bu emalatxanalarda da Şərq adətinə görə bütün işlər çox vaxt bir dəstə bekar sakinlərin gözü qabağında görülürdü... Bəzi küçələr döşənib, qalanları isə təbii xırda çınqılla örtülmüşdür, odur ki, Şəkidə heç vaxt palçıq olmur, belə nadir üstünlüyə çox təəssüf ki, Rusiya şəhərlərində çox az rast gəlirik. Ümumiyyətlə. Şəki gözəl mənzərəsi, nisbətən səliqəsi, canlılığı, boğucu istiliyin olmaması, axşamlar isə bağlarda bülbüllərin cəh-cəh vurması ilə çox xoş təsir bağışlayır”.

Şəki xanlığın siyasi mərkəzi olmaqla bərabər mühüm sənətkarlıq və ticarət mərkəzi idi. Şəhərdə yüzlərlə dükan və 5 karvansara fəaliyyət göstərmişdi. Ticarət üçün müxtəlif şəhər və ölkələrdən gələn tacirlər bu karvansaralarda yerləşirdilər. XVIII əsrdə Şəkidə memarlıq və rəssamlıq yüksək inkişaf etmişdi. Azərbaycan memarlıq və rəssamlıq sənətinin ən görkəmli abidələrindən biri olan Şəki xan sarayı tikilmişdir.



1805-ci il Kürəkçay müqaviləsinə əsasən Şəki xanlığı Rusiyadan vassal asılılığına düşdü. 1806-cı ildə şəkili Səlim xanın Rusiyanın müstəmləkə rejiminə qarşı qaldırdığı üsyan yatırıldı və o xan hakimiyyətindən uzaqlaşdırıldı. 1819-cu ildə İsmayıl xanın ölümü ilə Şəkidə xan üsul-idarəsi ləğv olundu və Şəki əyaləti yaradıldı.

1840-cı ildə Kaspi vilayətinin tərkibində Şəki qəzası yaradıldı. Qəza 1846-cı ildən Şamaxı quberniyasının tərkibinə daxil oldu və Nuxa qəzası adlandırıldı.

XIX əsrin II yarısında çar hökumət orqanları şəhəri idarə etmək üçün onu iki məhəlləyə Şəki və Qışlaq məhəllələrinə böldü. Bu dövrdə Qışlağın ərazisi hələ şəhər ərazisi ilə birləşməmişdi. Qala, qala ətrafı, ticarət və sənaye müəssisələri olan hissəsi şəhərin mərkəzi hesab olunur və iki hissəyə bölünürdü: yuxarı və ya ticarət hissəsi, aşağı hissə. Şəhər ətrafı hissələri Yuxarıbaş, Gəncəlibaşı və Nuxa-Qışlaq hesab edilirdi.

Yuxarıbaş hələ XVIII əsrin sonu XIX əsrin əvvəllərində, Qaladan şərqə doğru salınmışdı.

Şəki ərazisi getdikcə böyüdüyü üçün çar hökumət orqanları şəhərdə əlavə iki inzibati məhəllə yaratdı və 1860-1865-ci illərdə şəhər artıq iki məhəlləyə deyil, 4 məhəlləyə bölünürdü. Birinci məhəlləyə Qala və onun ətraf yerləri, ikinci məhəlləyə şəhər ətrafları daxil edilmişdi və buranın əhalisi əsasən kənd təsərrüfatı ilə məşğul idi. Üçüncü məhəlləyə dabbaqxana daxil idi. Buraya başqa sənətkarlıq sahələri, o cümlədən boyaqçılıq daxil idi. Dördüncü məhəllə haqqında sənədlər məlumat vermir. Görünür, bu məhəlləyə tacir və sənətkarların yerləşdiyi baş küçə və onun ətrafları daxil idi.

XIX əsrdə Şəki mühüm sənətkarlıq və ticarət şəhəri idi. Sənətkarlığın təkəlduz (paltar və ev əşyaları üzərinə ipək sapla tikiş) sahəsi Azərbaycanda təkcə Şəkidə yayılmışdı. Şəkidə göndəri istehsalı, dulusçuluq, metal-işləmə, dəmirçilik xüsusilə inkişaf etmişdi.

XIX əsrin II yarısında Şəki Azərbaycanın mühüm ipəkçilik sənayesi mərkəzinə çevrildi. "Azərbaycan Lionu" adlandırılan Şəkinin ipək fabriklərinin əksəriyyəti texnikanın son nailiyyətləri əsasında qurulmuşdu.

1859-cu ildə Nuxa qəzası Bakı quberniyasının, 1868-ci ildə isə Yelizavetpol quberniyasının tərkibinə daxil edildi. 1920-ci il may ayının 5-də Şəkidə sovet hakimiyyəti quruldu. 1930-cu ildə Azərbaycan SSR-nin inzibati ərazi bölgüsündə dəyişiklik edildi və Nuxa rayonu təşkil edildi. 1963-cü il yanvar ayının 4-də Nuxa rayonu ləğv edilərək ərazisi Vartaşen (Oğuz) rayonuna verildi, respublika tabeçiliyində Nuxa şəhəri yaradıldı. 1965-ci ildən yenidən müstəqil Nuxa rayonu təşkil edildi. 1968-ci ildən yenidən Şəki rayonu, mərkəzi isə Şəki şəhəri adlanmağa başladı.

Şəhərdə inşa olunan qədim karvansaralar, qalalar, müxtəlif müdafiə qurğuları, ictimai binalar, hamamlar, məscidlər və minarələr, xüsusi memarlıq üslubuna malik olan yüzlərlə imarətlər, o cümlədən Xan sarayı, Şəkixanovların evi və başqa tarixi





abidələr Azərbaycan mədəniyyətinin nadir inciləridir. Bütün bunlar Şəkini Azərbaycanın ən qədim mədəniyyət mərkəzlərindən birinə çevirmişdi. Şəki bütövlükdə muzey–şəhərdir. Bu baxımdan qədim memarlıq ənənələrini bütöv halda qoruyub saxlamış Şəki bütün Azərbaycanda açıq səma altında yeganə şəhər– muzeydir.

## THE HISTORY OF SHAKI

Sheki is one of the oldest cities of Azerbaijan. The Kimmer – Iskit - Sak Turks who played an important role in the formation of the people of Azerbaijan settled down beginning from the VIII century before J.C. in Sheki region. Along with the archaeological excavations, there are rich factual materials available about it in the ancient Assyrian (Assyrian) and Roman-Greek sources. There is very valuable information about in in the work "History" of Herodotus (484-425 BC), "Father of history", in "Anabasis" of Xenophon (434-355 BC.), in "Geography" of Strabo (63 BC - 23), in "Natural History" of Pliny (27-79), in "Parallel Biographies" of Plutarch (46-127), in "Geography" of Claudius Ptolemy (87-165). The names of the historical region named as "Sakan" in modern Sheki (Saki // Sheki) and of the historical Sakasenan of Zagatala are memory of that Sak Turks*. The first sources prove that Sheki has at least 2700 years history. The place called as "Dashuz" (Dash Oguz, Dish Oghuz) kept as a keepsake from "Kitabi-Dede Gorgud" tales which the 1300thanniversary was celebrated on the initiative of great leader Heydar Aliyev is located just in Sheki region.

One of the oldest cities of Azerbaijan, historical Sheki / Shako, Shake, Shankan and so on| was located in the north-west of Albanian state, at the foot of the Caucasian range mountains, northwest from Gabala province with the center in the same name; this province was bordered with Kambisena prov-

ince in the west and south-west, with Lpinia in the north - east and Gabala in the south. It is believed that the temple of Ay - Selena goddess was in Sheki region in the ancient times. Along with Albanians and Utis, Iskit and Sakh generation lived in Sheki and it was reflected in "Sheki" Toponymy. Arabs who abolished Albany as a state during the reign of the Caliph Valid (705 - 715) and turning here into one of the governors of the Caliphate, made Sheki their strategic basis for maintaining domination in the region. Just in this region, Sheki city located on the trade road from Tiflis to Telaviy and to Berde and Bab al Abvab and province of the same name began to play an important role in northern boundary of the Caliphate

The end of the VIII and beginning of the IX centuries when the Arab caliphate began to weaken can be considered as the beginning of the political history of Sheki meliklik. Sheki meliklik had been an independent political unit until the XI century. According to Moisey Kalankatly, "In 887, Grigor Hammam "regained the disintegrated Albanian kingdom" and seized power in a part of Arran province – one of the province of the historic Albania - in Sheki. The end of the IX century, the beginning of the X century was the period when Sajids became active in the South Caucasus. Grigor Hammam, who could retain his power in Sheki, accepted the vassal dependence of the Sacids who made most part of the South Caucasus obey."

In the 60s of the X century, Sanatkarim seized power in Sheki. He also included Sanaria province (i.e. Kakheti) in his unique power. Sanatkarim included some of the right coastal areas of the Kura into his property, thus could get the name "Albanian throne restorer". The church welcomed the idea that Sanatkarim accepted the name "the ruler of Albanians" and the Albanian catholicos crowned the head of the new ruler. Along with certifying that Sanatkarim gained independence, it also justified his claim on the territory of Albania. Strengthening of Sheki meliklik and crowning him by the crown belonging to the





Albanian ruler caused to the attention of the neighboring Muslim and Christian rulers. Salari ruler Ibrahim sent him a crown and other precious gifts and the ruler of Tao, David Kuropalat sent a royal garland and a dark red long king coat. The recognition of the power of Sanatkarim was an important political phenomenon that was not accidental.

The death of Sanatkarim caused to weakening of Sheki meliklik at the end of the X century. Using the situation, the Abkhazian ruler Bagratin III plundered Sheki lands in 1009. According to sources "the previous rulers seized again their own countries". Sheki meliklik could maintain its independence from that time to the Seljuk attacks.

The significant events happen in the South Caucasus including Sheki and its surroundings in connection with the start of Seljuk movements during the reign of Axsartan. During this period when Shirvan - Georgian relations became aggravated, transfer of some of the fortresses near Sheki including Sheki itself was ceased by the attacks of Sultan Alp Arslan. In 1067 the ruler of Sheki II Axsartan came to Alp Arslan, the Seljuk sultan and even he accepted Islam for the sake of protecting his properties and promised that he would pay taxes to Saljuks. "However, the struggle for Sheki and the surrounding fortresses continued in the previous years too.

Though that the history of the further period of Sheki was directly connected with the Seljuks, as well as the Shirvanshahs, the sources give information about the capture of Sheki and Gabala by the Georgians immediately after the first Mongol attack in 1221. According to En-Nasavi, in 1227 Sultan Jalalad-din Mangburni appointed Safieddin Muhammad at - Tugrai as the vizier of Sheki and Gabala, the cities of Shirvan. These towns had been taken by Georgians from the owner of Shirvan, a few years before, while they were still strong. " Thus, the first period of the Sheki meliklik lost its independence even though it

was temporary, and that independence was restored again several centuries later.

In the middle of the XIII century Sheki remained as part of Elkhanids state as other cities of Azerbaijan. In the 1930s of the XIV century, a number of independent states emerged as a result of the decline and disintegration of the Elkhanis state. Along with Shirvanshahs the Sheki governors gained their internal independence in northern Azerbaijan and Oyrat tribe came to power. Since that time, the governors of Sheki had been been closely involved in the political life of the country and fighted for their independence. Sheki - Shirvan, Sheki - Georgia and Sheki - Teymuri relations played a major role in this fight.

According to V.Piriyev, the historian Budag Kazvi wrote while speaking about the events of 1324 that when Amir Choban's son Sheikh Mahmud was the governor of Shirvan and Sheki provinces along with Georgia. Basing on Abubakr al - Gutbi al - Ahari, V.Z.Piriyev writes that Agbati who was appointed as the governor of Shirvan and Sheki by Sultan Abu Said in 1328 remained as the governor of that area until 1338 with his son. The mentioned Sheki governors were temporary governors. As, the strengthening of the struggle for the throne in Elkhanis state contributed to strengthening of the local governors from Oyrat family in 1338. One of the Turkish tribes included in the Mongolian army during the movements of Mongols to Azerbaijan was Oyrats. According to the Turkish historian Z.V. Toghan, Oyrats were originally from Uighur Turks. After the occupation of Azerbaijan by Mongols in 1239, the country's administration was assigned to Argun Agha from the Oyrat tribe. Oyrats who settled around Shamakhi and Sheki in this period, was one of the most numerous and mighty tribes of the Kura basin.

Sheki was under the influence of the Shirvanshahs in the second half of the XIV century. Sheki had special position in the history of 80's of the XIV century of Shirvanshahs. Thus, I





Sheikh Ibrahim who was as a small land owner in Sheki came to the throne instead of Shirvanshah Hushang who was dismissed as a result of the popular movement in Shirvan in 1382 and this event had a positive effect on the future development of Shirvan - Sheki relations.

At the end of the XIV century, the Teymur period specially noticeable in the history of Sheki reign and it is more characteristic in regard to the struggle for independence. It is known from the Teymuri historian S.A. Yazdi that Amir Teymur came to Sheki province during his first movement (1386-1388) and sent troops to the surrounding areas. One of his commanders Amir Muhammad Darwish Barlas entered the Sheki mountains with a large group and made the people there obey and plundered the area. Amir Teymur entered into Sheki from Georgia during his II movement (1392-1397) and sent Sheikh Nuraddin Saribugha to the mountainous regions with many troops. The governor of Sheki Seydi Ali Orlat left his property and ran away. Sheikh Nouraddin destroyed his homes like an enemy, reduced them to ruins, plundered and burned it.

The influence of Falling from the horse and injury of Amir Teymur's son Miranshah, afterwards his useless actions didn't pass through Sheki either. According to Sh.A.Yazdi, he thought that Seydi Ali Orlan contradicted him and attacked Sheki without controlling and robbed his province. This action of Miranshah caused to anger of the governor of Sheki. Sh.A.Yazdi writes that though that Seydi Ali was known with the Islam slogan, he entered into an alliance with the Georgians because his province had been plundered and he went to Alinja to liberate Sultan Tahir fed up in the siege. They entered the province of Azerbaijan and began to demolish the areas of Muslims and resort to aggression. Sultan Senjer retreated from the castle when he heard about situation and went to Tabriz and conveyed the event to Miranşah. The troop of Abu Beki overtook the Alliances when they had liberated Sultan Tahir and

were coming back. There was a battle between the parties. Sejdi Ali Orlat who did not forget plundering of his province by Miranshah attacked Abu Bakr personally for revenge but was shot with arrow and died in the battle. Nevertheless, Sheki - Georgian troops defeated Abu Bakir's army.

Undoubtedly, this action of the governor of Sheki exerted impact on his relationship with Teymuris. S.H. Yazdi writes that the governor of Sheki province Seydi Ali Orlat had united with the Georgian troops a little before and came to Alinja Castle and ignored his life. Now, his son Seydi Ahmed was afraid of the revenge of Amir Teymur because of the fault of his father and was anxious. He took refuge in Shirvanshah Sheikh Ibrahim. Sheikh Ibrahim brought him to Amir Teymur for forgiveness of the king and asked his sins to be forgiven. He brought precious gifts with himself and gave him 6 min horses. Amir Teymur forgave Seydi Ali, gave his father's inheritance and place to him.

After the death of Amir Teymur, a serious struggle between his heirs in Azerbaijan weakened the power of Teymuris. Taking advantage of it, the governor of Sheki Seydi Ahmad left the dependence on Teymuri and restored his independence. He participated in this process as a close ally of Sheikh Ibrahim who fought for the liberation of lands of Azerbaijan from Teymuris.

The power of Sheki was dependent on the ruler of Garagoyunlu with the establishment of Garagoyunlu state by Gara Yusif in 1410 and defeating Shrivanshah Ibrahim and his allies governor of Sheki Seydi Ahmed and tsar of Georgia Konstantin on the bank of the Kura river in 1412

the ruler of Garagoyunlu by the creation of Garaboyunlu State of Azerbaijan and the defeat of Shirvanshah Ibrahimi and his allies Sheki governor Seydi Ahmed and Georgian Tsar Konstantin on the Kura river in December 1412. Soon, the ruler of Sheki didn't miss the opportunity and used the controversies occured in Garagoyunlu state and restored their independence.





In the 40s of the XV century the power of Orlats dynasty was replaced by Garkeshish oghlu dynasty in Sheki. Haji Seyid Abdulhamid writes about this dynasty in his work "Sheki khans and their descendants": "According to legend, the founder of this dynasty was a person named Alijan. He seized power in Sheki thanks to the local feudal lords and ruled for 13 years (1444-1457). "

As the sources of the XV century confirmed, power of Sheki fought for the preservation of their internal independence at the end of the XIV century – in the XV century. Along with keeping their nominal independence, they remained under the influence circle of Shirvanshahs, Garagoyunlu and Aggoyunlu states of Azerbaijan at different times. Nevertheless, power of Sheki could preserve its historical traditions for a long time.

Located on Great Silk Road, Sheki was the homeland of silkworm breeding in the Middle East: In the XIII-XIV centuries, Italian merchants bought silk from Sheki on a regular basis. Sheki Silk (Setta Sheki) is especially mentioned in the eastern silk types in the Italian archives dating the XIII-XIV centuries. "The expansion of the foreign trade relations of Azerbaijan in the XV century, as well as further revival of the international caravan routes passing through Azerbaijan has had a positive impact on the economic life of cities of Azerbaijan including Tabriz, Shamakhi, Sheki and other cities. ... Just as it played a coordinating role in the Euro-Asian trade, Tabriz has become the largest shopping center of the Near and Middle East. Cloths and glass products brought from Italy to Asia, raw and spun yarn of Sheki, Shirvan, Georgia, Gilan and Yazdin were sold just in Tabriz.

With the establishment of the centralized Azerbaijan Safavid state in 1501 Sheki reign became a vassal dependant of Shah Ismail I. The relation of the governor of Sheki Hasan bey and the ruler of Safavi was normal when Shah Ismayil I was alive. According to the historian Budag Gazvini, Hasan bay

Shakki was among the rulers of the neighboring states visiting great king when Shah Ismayil was in the winter camp in Tabriz in 1519.

But in 1524, an unexpected event for Shah Ismayil took place. When Shah Ismail shortly before huntering in Sheki returned back to Sheki, while being on Sheki Ardabil road, the ruler of Safavid was informed that the governor of Kakhetia Levan khat had attacked Sheki again and Hasan bey had been killed. Though that Shah Ismayil wanted to go back and to punish Levan, he suddenly died and this Georgian tsar remained unpunished. The power passed to the son of the ruler of Sheki Darvish Muhammed after him.

The abolition of Shirvanshahs state by Shah Tahmasib in 1538 influenced the relations of the governor of Sheki with the Safavid king. O.A. Efendiyev writes that the governor of Sheki who had lost his ally in the personality of the king of Shirvan chose to improve his aggravated relation with Shah Tahmasib for his country's independence. Dervish Muhammed Khan became a close relative of Safavids and married Parikhan Khanum, of Shah Tahmasib's sister, the widow of the late Shirvanshah II Khalilullah even a year later after the fall of Shirvanshahs state. However, after the death of this princess (about 1547), unfortunately, the relations between the ruler of Sheki and the king of Safavid became worse again. Kerim Agha Fateh writes that Dervish Muhammed Khan did not serve the king as his father. When the army of the king fought in Shirvan province, Muhammed khan also took the troops and fought against the golden army in Shirvan. Shah Tahmasib was angry with the action of Dervish Muhammed Khan and sent him to Sheki in order to punish him. The independence of Sheki power came to an end with the capture of Gelesen – Goresen fortress in 1451. Shah Tahmasib appointed Toygun khan Gajar as the governor of Sheki.





As the most parts of Azerbaijan, Sheki region was also occupied by the Ottoman troops at the end of the XVI century. The lands of Azerbaijan occupied by the Ottomans were liberated by Shah Abbas in 1603-1607. The governor of Sheki Shahmir khan was also in the army sent by the Safavid king for liberation of Shirvan in 1606. A.A.Bakikhanov writes that Shahmir Khan was a descendant of the ancient governors of Sheki and was in the presence of a king for some time. According to T.Musavi, the ruler of Sheki was Aslan Sultan after Shahmir. During the reign of Shah Abbas II, Sheki was ruled by Abbasgulu Sultan and Melik Safigulu. According to T. Musavi, "at that time Sheki state was considered relatively as an independent meliklik". T.Musavi defined basing on the work "Zeyli – Tarikhi - alamarayi-Abbasi, after the death of Malik Safigulu, his son Safargulu became the governor of Sheki and at the end of the XVII century this title was given to Melik Hasan not belonging to the Safigulu family, after the dismissal of Malik Hasan, the son of Malik Safargulu Mahammadkhan bey was appointed as a governor of Sheki.

According to the information given by E. Chalabi, Sheki fortress built of stone had been erected on the top of the hill. The fortress had two gates called Shirvan and Ganja. There were thousands of houses, seven mosques, several caravanserais, baths and markets here. There were silk - producing enterprises and silk - producing gardens out of the fortress walls of Sheki. According to E. Chalabi, about 20,000 inhabitants lived in 3000 houses in the city.

The struggle against Nadir shah regime begun under the leadership of Haji Chalabi in the middle of the XVIII century in Sheki resulted in the establishment of an independent Sheki khanate in 1743. In 1744-1745, Nadir shah Afshar couldn't break the will of the rebels of Sheki who took standt at Gelesen – Goresen fortress. Only in March 1746, Haji Chelebi recognized the reign of Nadir Shah due to the severe situation occurred in the castle in connection with food shortages. The great

консервный и кирпичный заводы . С Намечается поездка Ильхама Алиева в Шеки и Загаталу10 апр 2006 -: Политика-www.day.az/news/ politics/46038.html

**1997.** Источник: сайт REGIONPLUS Шеки. sheki.io.ua : Очерки - sheki.io.ua/story

**1998.** Ничего подобного пока в СНГ нет это не просто отель пусть и в древнем караван сарае но и музей одновременно. Для Шеки это долгожданный праздник с начала года ведется реставрация так называемого Нижнего каравансарая Он находится на 50 метров ниже всем известного отеляЮхары каравансарай . С возводится в Шеки - www.zerkalo.az/2010-08-07/culture/ 11823-sheki.

**1999.** Сдан в эксплуатацию самый длинный мост в Азербайджане - http://news.day.az/economy/242380.html

**2000.** Талыбова, Айнур. Шелк, халва и королевское блюдо -http://www.regionplus.az/ruarticles/vie/81

**2001.** Туры в Шеки Предоставляется полный пакет услуг удовлетворяющий все потребности туристов Напомним что город Шеки находится в северовосточном направлении Азербайджана в живописном горном районе История. С Тур в Шеки - http://ru.trend.az:8080/capital/tourism/1481775.html

**2002.** Туристический рай – Шеки - http://sheki.io.ua/s91-806/turisticheskiy_ray

**2003.** Шекинский район - «Административно-территориальное деление» Управление делами Президента Азербайджанской Республики - http://files.preslib.az/-projects/azerbaijan/rus/gl2.pdf

**2004.** Шекинский оазис http://www.zerkalo.az/2011-05-12/ culture/19386-oazis-sheki





# X HİSSƏ

# ƏLAVƏLƏR
# APPLICATIONS
# ПРИЛОЖЕНИЯ

## 10.1. ŞƏRƏFƏDDİN ƏLİ YƏZDİNİN «ZƏFƏRNAMƏ» ƏSƏRİNDƏ ŞƏKİ HAQQINDA MƏLUMATLAR

Müəllif Yəzd şəhəri yaxınlığında anadan olub. Təvəllüd ili bilinmir. Vəfatı isə 1454-cü ildir. 1419-cu ildə Fars hakimi İbrahim sultanın (Əmir Teymurun oğul nəvəsi və Sultan Şahruxun oğlu) sarayında xidmət edərkən bu əsərini yazmaq üçün ondan tapşırıq alıb. Belə ki İbrahim sultan həmin vaxt babası Əmir Teymur haqqında məxsusi bir kitab yazdırmaq fikrinə düşmüşdü. Bu məqsədlə, lazım olan bütün sənəd və yazılı materialları bir yerə toplatdırmaqla yanaşı, bəzi hadisələrin sağ qalmış iştirakçılarını sarayına dəvət edib onların şəhadətlərini də yazıya köçürtdürmüş və bütün işi ümumiləşdirməyi, yəni lazım olan əsəri tərtib etməyi isə məhz Ş.Ə.Yəzdinin öhdəsinə buraxmışdı.

Kitabın yazılma prosesində, hansısa hadisənin təsvir edilməsi zamanı, nəsə, mübahisəli bir şey olsa idi, İbrahim sultan təcili surətdə böyük şəhərlərə çaparlar göndərib həmin məsələni dəqiqləşdirmək üçün Əmir Teymurun başqa zamandaşlarının da köməyindən faydalanar və həm də, yazdırdığı kitab üçün əlavə məlumat toplatdırarmış. «Zəfərnamə»dəki bəzi şərhlər isə Ş.Ə.Yəzdinin şəxsi müşahidələrinə əsaslanmışdır. Əsər 1424/25 (– h. 828) ci ildə tamamlansa da, müəllif tərəfindən redaktəsi sonrakı üç il ərzində davam etdirilmişdi.

Ş.Ə.Yəzdi sözügedən əsəri 3 «məqalə»dən – yəni 3 cilddən ibarət olmasını planlaşdırmışdı; 1-ci cild – Əmir Teymura, 2-ci cild – Sultan Şahruxa, 3-cü cild isə – İbrahim sultana dair olmalı idi. Fəqət, sonrakı iki cild müəllif tərəfindən ya yazılmamış, ya da, yazılsa da onların orijinal, yaxud surətlərindən heç biri zə-

manəmizədək gəlib çatmamışdır.

«Zəfərnamə» 1887 və 1888-ci illərdə, 1-ci və 2-ci hissələr olmaqla Kəlküttədə, daha sonra – 1958-ci ildə, Tehranda çap olunmuşdur.[1] Lakin bu nəşrlər zamanı istifadə edilmiş əlyazma nüsxələrinin heç birində əsərin ümumi həcminin beşdən birini təşkil edən «Müqəddimə» olmadığına görə, təbii ki həmin hissə də çap edilməmişdir. «Zəfərnamə»nin başqa bir, daha mükəmməl nüsxəsinin faksimelisinin – Özbəkistan EA Şərqşünaslıq İnstitutundakı 4472 şifrə altında saxlanılan əlyazmanın, 1972-ci il Daşkənd nəşrində (Ə.Urunbayev tərəfindən çapa hazırlanıb) isə sözügedən çatışmazlıq aradan qaldırılmışdır.

Elə həmin nəşr əsasında da tarix emləri doktoru Vaqif Piriyev «Zəfərnamə»dən Azərbaycana aid və digər bəzi maraqlı çıxarışlar edərək, onları dilimizə çevirmiş və bunlar 1996-cı ildə Bakıda kitabça şəklində nəşr olunmuşdur. Biz də sözügedən əsərin, məhz Daşkənd nəşrindən istifadə etmişik. Gətirdiyimiz iqtibasların Azərbaycan dilinə tərcümə edilməsi işi isə bu dəfə bizim zəhmətimizin bəhrəsidir və biz fars dilindən etdiyimiz bütün tərcümələrimiz kimi, burada da orijinaldakı dili, cümlə quruluşunu mümkün qədər saxlamağa daha çox üstünlük vermişik.

Ş.Ə.Yəzdinin «Zəfərnamə»sində təsadüf etdiyimiz Şəkiyə dair hekayətlər, əsasən N. Şaminin eyniadlı əsərindən götürülmə olsa da, müəyyən fərqlərə də malikdir və hər ikisindəkilər bizim üçün ayrı-ayrılıqda əhəmiyyət kəsb etməkdədir. Belə ki N. Şaminin məlumatları: əksər hallarda bir narrativ mənbənin verdiyi informasiya kimi, Ş. Ə. Yəzdinin yazdıqları isə: birincinin yoxlanılmış və daha da zənginləşdirilmiş redaktə variantı kimi əhəmiyyət daşıyır.

## M Ə T'N – Şəkiyə dair iqtibaslar
### *(fars dilindən tərcümə edən: Aydın Məmmədov)*

*Elə ki hümayun məvkibin (padşah üzəngisi yanında durmaq vəzifəsi daşıyan atlı, yaxud piyadı dəstəsi) çadırları [qurulan*





*yer[2]] Şəki vilayəti oldu, Həzrət sahib qiran (Ə.T.) kafirlərin kökünü kəsmək və çıxarıb atmaq üçün Nüsrət (zəfər) şüar (əlamət) ləşgəri dəstə-dəstə buranın hər yerinə göndərdi. Əmir Cahanşah bəzi üməra ilə fərmanın hökmü üzrə bütün ləkzilərə[3] hücum edib qarət elədilər və onlardan bir çoxunu cihad qılıncından keçirdilər [nəzm:]*

*Bu kafiri qəza qılıncı ilə axıradək təqib edən*
*o müzəffər bayraqlı qoşunlara*
*Qənimət o qədər ki bəlkə hesaba gəlməz,*
*Qoşunlar apara bildikləri qədər onlardan apardı.*

*və Əmir [Dərviş Məhəmməd]*[4] *Bərlas,* ***Gərdun şükuh*** (– dünya qədər, yaxud cəlalla hərəkət edən) *qoşunlardan çoxlu güruhla* ***Şəki dağıstanına*** (– Şəkinin dağlıq yerlərinə) *girdilər və camaatın bir hissəsi ki itaət etmək və xilas olmaq yoluna qədəm qoymamış idilər, o dağlarda ələ keçirib əsir və kölə vəziyyətinə saldılar və hər nəyə malik idilər qarət və tarac yelinə verdilər;* [nəzm:]

*Müzəffər qoşunlar o dağlıq yerlərdə tarac etmişdilər çoxlu şey,*
*Düşməni candan məhrum etsələr də məcbur idilər amma götürsünlər apara bildikləri qədər hələ ki.*

*və Arğunşah İxtaci və Ramazanxacə, Əsrin zəfər məvkibindən bir dəstə ilə Səkğut*[5] *vilayətinə tələsib [qətl və əsir və qarətdən istila]*[6] *və mükəmməl qələbə əsərləri zühura çıxardılar;* [beyt:]

*Hara oldu ki o adlı-sanlı ləşgər,*
*niyə olmadı qalib, pərvərdigarın köməyi ilə?! və Əmir Məhəmməd [bəy və]*[7] *Əmir Musa;* [beyt:]
*Qələbə çələngli,bütün şirlər cumdu birdən.*

*Ağcəb vilayətinə yollandılar və o yerləri istila və zəbt hövzəsinə daxil etdilər;*

[beyt:]
*Hər yerdə ki bu hünər zəminindən fənd,*
*müzəffər etmədimi o qoşunları məgər bu?*

*və Həzrət sahib qiran, öz mübarək canı və sair **firuzi*** (zəfər) *təsirli ləşkərlərlə Əlbruz* (Qafqaz) *dağının ətəyinə gəlib çıxdı. Rəbb tərəfindən göndərilmiş inayətlər[lə yanaşı[8]] gündən-günə artan qüdrət və asimani qüvvətləndirilmiş qoşunlar mənsur bayraqlı əsgərlərin hümayun üzəngisinin **nökərinin*** (Ə.T.-un) *sidq niyyətli qolunun qüvvəsi və hüsn-e etiqadı ilə qəza və cihad* [bayrağını] *qaldırıb; və ulu dinin nüsrəti, məlun kor kafirlər üçün cahana ah-nalə və təhlil salıb;* [nəzm:]

*Elə ki cahangir şahın adamları yetişdi, hər tərəfdən ah-nalə qalxdı.*

*O yer ki ordusu səadətli toz gətirdi,*
*din bağının budağında hər zəif ümmət cücərdi.*

*Dalğalandı din üfqünün ənvər namlı bayrağı üzə çıxdı kafirlərin zülmət və zəlaləti və adlı-sanlı əmirlər və fil yıxan, şir ovlayan bahadırlar ki kafirlərin vilayətlərini istila etmək, fəsad və təfriqənin dəfi üçün ətraf və yaxınlara getmiş idilər, bu **ziyansızlardan*** (– ziyan vurmağa qadir olmayan adamlardan) *bir çoxunu qəzanın qılıncına tuş gətirib və Onların istinadgah və istehkamlarını ələ keçirib və viran etdirib və zəbt və mənimsənilmə altında bol qənimətlər çıxarıb Qəbələ məkanında ali orduya çatdılar; [*nəzm:]

*Şahın qoşun dəstəsi tutdu çox ölkə və diyar*
*qala aldı, istehkam yıxdı və öldürdü düşmən.*
*Ələ keçirib çoxlu qənimətlər saysız-hesabsız,*
*ali ordu tərəfə fəth küləyi ilə gəldi.*

*və* (ordu) *Sorx*[ab] *qalasını da istila edib və yerlə həmvar düzəldib Sorxab Qarabağı tərəfə gəldi və* [Əmir Teymur orduya] *o yerdən köç edib Kür çayının kənarına düşmək buyurdu; və fərman-e qəza-ye cərəyan qüvvəyə mindi ki, qamış və çör-çöpdən **navallar*** (hissələr) *hazırlayıb Kür çayı üzərində körpü bağlasınlar; və elə ki, Sahibqiran qazi, mənsur ləşgərlə çaydan keçdi hümayun əzmin yüyəni Bərdə tərəfə dönmüş oldu.*[9]

*...[Tiflis*[10]*]* *şəhəri ki o ölkənin* (– Gürcüstanın) *taxtgahıdır* [Əmir Teymur orduya ora] *[düşmək buyurdu*[11]*] və buradan*





*şikar etməyə geri dönüb Şəki düzlərinə girdi və neçə gün o məhləni iqamət çadırları qurulan yer etdi; və el və vilayətə Bərtazın istilası üçün Əmir Hacı Seyfəddin və Cahanşah bahadırı müzəffər bayraqlı qoşunlardan bütün ümərə və həddindən artıq güruhla basqına göndərdi və Onlar fərmanın hökmü üzrə təcili yola düşüb büsbütün dağ və çöl Bərtazı*[12] *qarət etdilər və o nahiyələrin el və ulusunu yola çıxarıb sürdülər və Aləm pənahın dərgahına gətirdilər; və* [Əmir Teymur] *Şeyx Nurəddin Sarıbuğanı həddindən artıq ləşgərlə dağlıq yerlər tərəfə göndərdi və O, elə ki dağlıq yerlərə girdi, Seyid Əli Şəki Orlat o hücumçunun xofundan mülk və malını atıb qaçmaq yolunu tutdu. Şeyx Nurəddin Onun evlərini necə ki düşmənin qəlbi kimi boş [və*[13]*] xarab etdi və tarac küləyinə verib atəş vurdu;* [beyt:]

*Və elə ki ondan mühüm asudəlik tapdı, İqbal kimi ali taxtın ayağına tələsdi.*[14]

[Əmirzadə Əmiranşah] ***Həmən ilin*** (– 1397, yaxud 1398) *payızında, Seyid Əli Orlatdan bir müxalifət şübhələndi ki, ona görə və təhqiq etdirmədən ləşgər çəkdi və Onun vilayətini qarət etdirdi; və elə ki [şahzadənin*[15]*] ovqatının xarab olması söz-söhbətləri Onun eyş və işrət və qələt-e iltifatında, məmləkətlərinin işlərinin idarə edilməsi və tərtibində çoxalma tapdı, xəbis təbiətli gürcülər*[16] *ki... onların fəsad və tüğyanı Həzrət sahib qiranın möhkəm qəhr [şüşəsində*[17]*] cilovlanmış idi, ürəkləndilər; və o müddətdə ki, **o həzrət*** (Ə.T.) *Hindistan yürüşünə buyurmuş idi, cəsarət ayağını mütilik cızığından kənara qoyub, müxalifət başlatdılar; və bu vaxt Sultan Əhməd Cəlairin oğlu [Sultan Tahir*[18]*] ona itaət edən bir qism camaatla Alıncaq qalasıda idi və Sultan Səncər [bin] hacı Seyfəddin, qəza cərəyan fərmanın hökmü üzrə uzun sürən müddətdə, yenə də o qalanı mühasirə edir və qalanın ətrafı*[nı] *cəmi tərəflərdən «daşdan bir divar»* [halına] *gətirmiş idilər. Belə ki bir kəs qaladan bayıra gedə bilməmişdir və bir kəsə [də] bayırdan qalaya yol yoxdur; və istehkam əhli yaxşıca təngə gəlmiş idilər. Bu fürsətdə, qələbə əzmli gürcülər, dinsizləri topladılar və Seyid Əli Şəki, əgər ki islam*

şüarinda tanınmış idi, onunla əlaqədar ki, Onun vilayətini tarac etmiş idilər, belə ki deyilmiş oldu, [indi O,] gürcülərlə ittifaq etdi və Sultan Tahir ki, mühasirə işinin təzyiqi canına və biçaq sümüyünə [dirənmiş idi[19]], [Onu] xilas etmək əzmi ilə Alıncağa üz tutmuş oldular və Azərbaycan vilayətinə girib, **dostluq edənlər** (Seyid Əli Orlat) və **düşmənlər** (gürcülər) müsəlman vilayətlərini xarab etməyə əl atdılar; və elə ki Sultan Səncər bu haldan agah oldu, qaladan çəkildi və Təbrizə getdi və vaqiənin surətini Əmirzadə Miranşahın ərzinə yetirdi. Şahzadə öz oğlu Əmirzadə Əbubəkr ilə Sultan Səncər və Hacı Abdulla və Məhəmməd Qəzğun və Şeyx Məhəmməd tavaçi kimi əmirlərə və digər üməraya o fitnə odunu sön-dürmək fərmanı verdi və onların hamısı Alıncaq tərəfə rəvan [oldular[20]]; və elə ki gürcülər Alıncaq istehkamına yetişdilər, Sultan Tahir [Cəlair xəzinəsini də götürüb, yaxın adamlarından ibarət bir dəstə ilə[21]] aşağı düşdü və Onlarla birləşdi; və qalanı Hacı Saleh və Seydi Əhməd Oğulşani və üç nəfər gürcü aznauruna tapşırdılar; və gürcülər böyük üməraya və bahadırlara «aznaur» deyirlər və necə ki onların məqsədləri Sultan Tahiri xilas etmək idi, muradlarının hasil olmasından sonra geri döndülər; və o yaxınlarda da Təbriz ləşgəri Onlara çatdı və qoşunun tərəfləri cərgəyə düzülüb cəngə çıxdı; və necə ki gürcülər **qələbə qayəli** (üstün) idilər, Onların aznaurları tərsliyə gəldilər və Təbriz ləşgərinin sağ cinah və sol cinahına hücum etdilər və Seyid Əli Şəki mərkəzdən irəli çıxıb intiqam üçün Əmirzadə Əbubəkrin üstünə getdi. Baxmayaraq ki, cavanbaxt şahzadə bir **müjdə** (–yeniyetmə) yaşında idi, **səbat** (–mətanət) ayağını dirəyib [, yəni qaçmayıb] igidlik kamanının **bir cübbə** (60 ədədlik ox kisəsi?) oxunu atdı və altmışda zəfər açdı və [belə ki, oxlardan] biri Seyid Əlinin dəbilqsinin zireh ətəyi üzərinə [yəni zərif hissəyə] getdi və bundan keçib boyun damarına [sancıldı[22]] və o «qorxmaz» həlak torpağı üzərinə yıxıldı: «vəlair və əş-şəl fi əl-müxbir misl əl-əsəd».[23] Amma elə ki gürcülər qalib olmuş idilər və Təbriz ləşgəri qovulub, şahzadə də geri qayıtdı və sağ-salamat bu



Şəki. Biblioqrafik göstərici. Tarix-diyarşünaslıq materialları

təhlükəli yerdən kənara çıxdı; və gürcülər [də] öz məkanlarına qayıtdılar.[24]

Bu əsnada Əmirzadə Miranşahın ümərası barədə fərman-e əla sadir oldu ki, gürcülərin müharibəsində ki, Alıncaq ətrafında – hadisə bəyan edilmiş idi, hamısı təqsir etmiş idilər və fərar edib[lər]. **Böyük Yirğu Divanında** (hərbi məhkəmədə) soruşdular; Əmirzadə Şahrux və əmirlər fərmanın hökmü üzrə [onları] əmrə tabe olmağa durğuzdular və elə ki sual-cavabdan və təftiş və təhqiqdən sonra halın surətini, necə ki vaqiə olmuş idi, humayun ərzin izzətinə çatdırdılar, **Əlatabanın** (Ə.T.) vacib hökmü çıxdı ki, Hacı Abdulla Abbas və Məhəmməd Qazan üçün dal və qabaq **yasaq** (cəza) çubuğu vursunlar və Yəmən Həmzəye Əprəddin barədə ki hamıdan əvvəl qaçmışdı, işarət oldu ki yasağına yetişsin [yəni öldürülsün] və [yalnız] şahzadələrin xahişi ilə canına aman tapıb, Onun üçün də dal və qabaq çubuğu vurdular və onların hər birindən cərimə olaraq üç yüz at tələb etdilər və Əmirzadə Miranşahın bütün əyan və nökərləri üzrə halın hökmü ilə əllisindən [də] iki yüz-üç yüz at həvalə olunmuşun [üstünə[25]] gəlindi və bütün o atları pənahı zəfər qoşunların piyadalarına qismət etdirdilər; və Əmirzadə Əbubəkr barəsində padşahanə atifət ki, o cəngdə igidlik göstərmiş idi və Seyid Əli Şəkini oxun bir cübbəsi ilə həlak torpağına atıb – əzizlənən və nəvziş siniflərinə ixtisas çəkdi [, yəni əzizlənən və nəvaziş göstərilən şəxslərdən oldu]. Beyt:

Şahdır himayəçi, üzü bu zamandan layiq hörmətə, qəhr və lütf bəxş etdi hər rəfiqinə.[26]

...necə ki bundan əvvəl Şəki vilayətinin valisi Seydi Əli Orlat, Gürcü ləşgəri ilə ittifaq etmiş idi və Alıncaq qalasının içinə girib və can üstündə[, yəni ölüm ayağında] o nadanlığı edib, belə ki şərh verilmiş oldu, bu vaxtda, Onun oğlu Seydi Əhməd ki [indi] **Onun** (– Seyid Əlinin) el və vilayətinin **əyalət** (– bir vahid, yaxud bir hissə) sahibi olmuş idi, atasının cürəti ilə əlaqədar **Sahib qiran gərdun aləm xadimlərinin** (– Ə. T. un) intiqamına görə təşvişə düşən və rahatlıq tapmayan oldu və

*Əmir Şeyx İbrahimin Şirvan mülkünə iltica apardı ki, O,* [bu hərəkəti ilə də] ***o həzrətin*** (– Ə. T. un) *bəndələrinin bəndəliyində səmimiyyətin artmasına ixtisas səmti tapmış idi. Beyt:*

*Hər kim bəndəliyin səmimiyyət qandalında,*
*baş vurdu yüksəyə başıaşağılıqdan.*

*Şeyx İbrahim padşahanə əhvin ortaya çıxması üçün Onu qədim xilafət taxtının ayağına gətirdi və astana öpmək izzətinə çatdırdı. Seydi Əhməd tabe olmaq* ***zəmininin*** (məfhumunun) *ədəb dodağı ilə busə verdi və Şeyx İbrahim Onun cərimələrinin əfvini*[, yəni ləğv edilməsini] ***padşahanə mərhəmətlər hamisindən*** (Ə.T.-dan) *xahiş etdi və Həzrət Sahibqiranın mərhəməti Onun təqsirat «naxış»larını əhv və gözyumma «yazısı» ilə ləğv edib,* [Onu] *əzizlənmək və navaziş siniflərində başıuca etdi və atasının mənsəb və məqamı Ona əta edildi. Şeyx İbrahim çoxlu* ***savəri*** (məcburi «bəxşiş») *gətirib toy tərtibi ilə məşğul oldu; və toy üçün o qədər at və qoyun kəsmiş idi ki, mətbəxçilər onu bişirməkdə aciz qaldılar və* ***tavaçilər*** (orduda yüksək rütbəli əmirlər) *onu ləşgərə* ***qismət etdirib*** (paylatdırıb) *hamısını bişirditdilər və toy günü* [hamının həmin bişmiş ətlə təmin olunması işini] ***bakavullara*** (orduda təchizat işi ilə məşğul olan məmurlara) *tapşırdılar; və digər bayram vasitələrinin məcmusu onun* [yəni bu tədbirin] *özünə daxil idi; və bu peşkəşlərdən sonra canlı ov heyvanları növləri və qulamlar və cariyələr və növbənöv qumaşlar və paltarlar və sənətkar* ***cəbaları*** (vergiləri) *və silahlar və qeyrilərdən və o cümlədən, altı min at çəkdi...*[27]

*Həmən qışda –* ***səkkiz yüz ikinci ildə*** (noyabr 1399 –fevral 1400) *ki, Qarabağ bu ordugahdan nüsrət yuvası idi* [Əmir Teymur] *gürcülər üzərinə getmək niyyətini gerçəkləşdirmək istədi və* [planlaşdırdığı basqında iştirak etmələri və bu basqına hazırlaşmaları üçün] *Şeyx İbrahim və Seydi Əhmədə xələt verdi və əzizlənmək və navaziş siniflərinə məxsus edərək [geri qayıtmaq*[28]*] rüxsəti əta etdi və* **Cahan mütanın** (Ə. T.un) **yarlığı** (fərmanı) *qüvvəyə mindi ki, o ləşgərin cəmisindən [hər*[29]*] on nəfərdən üç nəfər on günlük azuqə götürüb* ***Göytüstan*** (qüdrətli) *məvkibin qulluğunda olsunlar və qalan ləşgər və s.lər həmin yerdə dursunlar; və nüsrət şüar bayrağı bu zaman hifz edib, basqına hazırlıq işi gördürüb bütün şahzadələrlə Onların vilayətinə üz tutdu; və elə ki hümayun nüzul edib Kür çayının sahilində düşərgə qurdular, Ələtabanın lazimi fərmanı çıxdı ki, bütün qayıqları toplayıb çay üzərində körpü bağlasınlar; və «şah və ordu» o körpüdən keçdilər; və Şeyx İbrahim Şirvan ləşgəri ilə Əsrin zəfər mövkibinə qatıldı və Seydi Əhməd də qulluqda oldu; və [hümayun*[30]*] məvkib o yerdən tərpənib,* [Şəkinin ortasından[31]] *keçib Xəmşa dərəsi tərəf ki kafirlərin*[32] *məkanları və sakin olduqları yer idi* [ora] *rəvan oldu; və o dərənin hamısı* ***cəngəlistan*** (– sıx meşəlik)...*idi*

*Aləm müta' yarlıq qüvvəyə mindi və peşəsi zəfər ləşkərlər on günlik yol*[dakı] *ağacları dəhrə və balta ilə qırdılar və yol düzəltdilər elə ölçüdə ki beş-altı qoşun biri digərinin yanında gedə bilsin və bu əyyam, iyirmi gün müddətində ara verməd ən qar yağır və yüksəkliklərdən yetiiib, müşk kimi [müddət-e*[33]*] bulud dağ və biyaban üzərində* [ağ-appaq] *xırda «kafur» hazırlanır və elə ki İslam ləşgəri kafirlərin məhlə və məqamına bədbəxlik aqibəti seyr etdi, firuzə kimi günbəzin altında qaziyanə fikir və təhlilin zümzüməsini saldılar və cihad qılıncı intiqam qınından çıxarılılıb, qarın üzünü ki yer üstünə əsl pərdə tutmuş idi, dinsizlərin qanından, üzü qeyrətli lalə və* ***ərğəvan*** (qırmızı bir gül adı) *etdilər; hər kim tapılmış oldu, aman tapmadı və hər kim aşkara çıxdı, aşkarda qalmadı və Xəmşa ki o ölmüş məlunların başçısı və* [onlardan] *faydalanan.* (Quran ayəsi) *O, idi, acizlik və qorxudan tərk-e xanuman olub fərar. etdirdi; dünya şanlı əsgərlər Onun tələbində Aq su dərəsinədək yüyürdülər və kifayət qədər inək-qoyun və cins mallardan qeyrilərini qənimət götürərlər və elə ki Xəmşa şir şikar edən mücahidlərin qarşısından çaqqal kimi meşənin içinə qaçdı Din pənahın qoşunu cəhənnəmliklərin evlərini odladı və kəndləri talan və qarətin sər-sər* [küləy]*i ilə viran qoydular; beyt:*

*Sakinlər cəhənnəm içində və məskən atəşdə yanıb,*

*millətin çöhrəsi qazilərin fəthindən odlanıb.*

*Və necə ki o yoldan azmışların eyşi badəsiz ötüşmürdü və Onların kişi və qadın və uşaqları* [da] *buna vərdiş etmiş idilər; bu qayə ilə ki, hər kim ölür; beyt:*

*Vəsiyyətidir ki: mənim ruhum bədənimdən çıxanda, mey və şənlik olsun və bir də, yaxşı tənəkdən düzəldilmiş tabut!*

*şərabsız dəfn etdirmirdilər və kafirləri zərərə salmaq və Onların eyşini azaltmaq üçün ki, iqtibas:.* (Quran ayəsi). *ali əmr oldu ta bağat və bostanlaradək Zəfər qərin ləşgərə paylansın və bütün uca dağların hamısına çıxıb şeytan əməli [olan] tənəkləri ki məstedici badə ümidi ilə baslənmiş idilər əllə məhv etdilər və digər ağacların bəzisini kəsdilər və bəzisinin qabığını soydular və o yerlərin ...və... kilsələr ki ibadət o məhsullarsız qeyri-məqbul, yerlə bərabər etdilər və gündən-günə artan qüdrətin qəribə təsadüfləri: Həzrət sahib qiran, sabiq qış ilində ki Bars ili idi,* [həmin vaxt] *Hindistan ölkəsi və Dehli və Qanq çayı yerləri və ətrafında qəza edir və bütxanələri dağıdır*[dısa] *və bu qışda Dovşan ili ki, bir il müddət* [hələ] *tamam olamayıb, Cürcüstan vilayətində cihadla məşğul idi və kəlisələri dağıdır və. beyt:...*

*Sənin Büraq əzmin ki bir kam götürmüşdür Hinddən,*
*Doğrusu ki, əgər İsgəndər oldun, qüdrət atını bu uzunluq və endə min yerə...*[çapdın] *və əgər daban-dabana ta* [günbatan yerin] *altınadək ...*[çıxmaq üçün] *mücərrəd əhdin məsafəsinin qətindən kənara çıxmadın;*

*beyt:*

*Biri üçün yardım zamanı köməkçidir, onun hekayəti digər halətdir.*

*Kafirlər Nüsrət bayraqların, Xəmşa dərəsi* **qəzavatının** (oxu: toqquşmasının!) *başa çatmasından geri dönən kimi mübarizlər cihad meydanında bir aya yaxın o ölkənən eniş və yoxuşlarını minik heyvanlarının dırnaqlarının ağalıq və istilasına tapşıralar və kafirlərin aznaurlarından və dinsizlərin ...*[döyüşçülərindən] *dən ələ keçənləri od saçan iti qılıncla birdəfəlik, cəhənnəmin dibinə göndərdilər və Onların hakimləri Xəmşa, avara və*





*səsi çıxmayan oldu və kafirlərin diyarı həddindən artıq viranlıq tapdı və o zamanda havanın soyuqluğunun şiddəti həddini keçmiş idi və yollar qarın çoxluğundan keçilməz olmuşdu; nəzm...*

*Və elə ki neçə gün müddət keçib və bu vasitə ilə ləşgərlər üçün azuqə tapa bilmədilər və atlar üçün ağac qabıqlarından qeyri yemək qalmadı, beləcə, dördayaqlılardan çoxu tələf oldu, Həzrət sahib qiran qayıtmağa qərar verdi və Kür çayından keçib...* [34] [Qarabağdakı düşərgəsinə üz tutdu].

[1] *Bu nəşrlə tanış ola bilməmişik.*

[2] Mətndə: مُعَرب şəklində idi və cümlənin müvafiq hissəsini ən yaxşı halda belə tərcümə etmək mümkün idi: Elə ki ərəbləş(diril)miş (–üaxud: ərəbdən dönmüş) Şəki vilayəti hümayun məvkibin çadırları oldu,... Göründüyü kimi ifadə düzgün alınmır – necə ki, vilayət çadır ola bilməz! Lakin Zəfərnamə mətninin bir neçə yerində şablon ifadə: خِيَام مَضْرِب işlədildiyinə görə (Bax: Шарафуддин Али Яздий (1972) səh. 270a; 341b; 352a ). biz dəqiqləşdirə bildik ki, əslində burada da elə – مَضْرِب (– qurulan yer) yazılmalı idi, sadəcə, katib tərəfindən nöqtə və *hərəkə xətalarına yol verilmişdir; və bundan başqa, həmin hekayəti Ş. Ə. Yəzdidən öz Rövzət üs-səfa'sına köçürmüş Mirxond da müvafiq yerdə eyni sözün sinonimi olan* – نصب *işlətmişdir (Bax:* (۱۲۷۱) ،ميرخواند *səh. 45).*

*[3] N. Şamidə: ta ləkziləri (–ləzgilər yaşayan yerlərə qədərki əraziləri, yaxud ləzgilər yaşayan yerləri də) qarət etsinlər. Mümkündür ki, bu hadisə indiki Şəki şəhərindən bir qədər şimalda baş verib. Amma Şəkiyə hücum, payızın sonuna təsadüf etdiyindən Əmir Teymur ləzgilərlə Şəki düzlərində də qarşılaşa bilərdi. Belə ki, məhz, həmin mövsümdə, Dağıstanda yaşayan ləzgilərin bir qismi – əsasən Samur çayının orta hövzəsində məskunlaşanlar, öz qoyun-quzularını Şəki düzlərinə endirirlər. Məsələn, 19-cu əsrin əvvəllərində tərtib olunmuş sənədə əsasən ləzgilər bu iş üçün həmin vaxt Şəki xanına müvafiq vergi də ödəyirlərmiş. (Bax: Камеральное описание жителей города Нухи и Шекинской провинции за 1824 год..., səh. 70) Hal-*

*hazırda Şəki şəhərinin xeyli ləzgi sakini var və Şəki, Oğuz, Qəbələ rayonlaprında da ləzgi kəndləri mövcuddur. Amma Şəki şəhərində yaşayan ləzgilərin əksəriyyəti və Şəki rayonunun bəzi kəndlərində yaşayan bir çox ləzgilər son 30-35 il ərzində Rutul rayonunun (RF, Dağıstan MR) Xnıuli (–Xnov) kəndindən köçüb gələnlər, yaxud onların övladlarıdır. Şəki, Oğuz və Qəbələ rayonlarındakı ən köhnə ləzgi kəndlərində yaşayanlardan əksəriyyətinin əcdadlarını isə bura Şəki xanı Məhəmmədhəsən xan (–fasilələrlə hakimiyyətdə olub: 1784 – 1804) Dağıstan, yaxud Quba xanlığı ərazisindən köçürmüşdür.*

*[4] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindədir. Daşkənd əlyazmasın-da: Məhəmməd Dərviş.*

*[5] Mətndə: şəklindədir. Fikrimizcə, bu Zaxur'a (– Orta əsr gürcü mənbələrindəki Tsukuti'yə) – indiki Şəki şəhərindən bir qədər şimal-qərbdə, Samur çayının yuxarı hövzəsində yerləşən tarixi vilayətin adına uyğun gəlir. Mirxondda: (–Zayif) (Bax: (۱۲۷۱) ،میرخواند səh. 45).*

*[6] Düz mötərizə içindəki hissə Tehran nəşrindəndir. Daşkənd əlyazmasında: istila.*

*[7] Əlyazmada səhvən: ibn*

*[8] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindəndir. Daşkənd əlyazmasında yoxdur.*

*[9] Шарафуддин Али Язди (1972) səh. 181b – 182a; Göründüyü kimi bu hadisələr barədə N. Şamiyə nisbətən Ş. Ə. Yəzdidən gətirdiyimiz iqtibas həcmcə xeyli çox olsa da, keyfiyyətcə, heç də o qədər üstün deyil.*

*[10] Əlyazmada səhvən: Təqlis.*

*[11] Əlyazmada səhvən yalnız: nozul (–düşmək).*

*[12] Ola bilsin, bura indiki Şəki şəhərindən 12-15 km. cənubdakı Daş-yüz deyilən ərazidir.*

*[13] Əlyazmada buraxılıb.*

*[14] Шарафуддин Али Язди (1972) səh. 270a/b; Bu dəfə eyni hadisə barədə hər iki müəllifdən gətirdiyimiz iqtibas nə həcmcə və nə də məzmunca bir-birindən o qədər də fərqlənmir.*





*Müqayisə etməyə dəyəsi yeganə şey isə budur ki, Ş. Ə. Yəzdidə olan el və vilayət-e Bərtaz, yaxud dağ və çöl Bərtaz ifadələrinə N. Şamidə tasadüf etmirik.*

*[15] Əlyazmada səhvən: şah.*

*[16] 1824-cü ildə tərtib edilmiş siyahıyaalma sənədində Şəki əyalətinin şimal-şərqində ya-şayan provoslav məzhəbli udinlərin miliyyəti «gürcü», qriqoryan məzhəblilərinki isə «erməni» kimi göstərilib.13 O cümlədən, həmin sənəddə Sultan-Nuxa kəndinin (–Qutqaşın mahalı) nə udin, nə erməni və nə də gürcü dilini bilməyən və yalnız türkcə (–oxu: azərbaycanca!) danışan qriqoryan məzhəbli sakinlərinin milliyyəti də «erməni» kimi göstərilir.13. 4 Ona və digər şeylə-rə (–hansılar ki, biz hələ bir qədər sonra bəhs edəcəyik) görə belə bir mülahizə də irəli sürmək mümkündür ki, yuxarıda «gürcü» adlananların bir qismi və ya hamısı bəlkə də gürcü yox, əs-lində, o vaxtlar Şəki ölkəsinin şimalında yaşamış provoslav məzhəbli xristianlar idi.*

*[17] Əlyazmada yalnız: şüşə*

*[18] Əlyazmada səhvən yalnız: sultan.*

*[19] Əlyazmada: dirənib.*

*[20] Əlyazmada buraxılıb.*

*[21] Cümlənin bu hissəsi bizim tərəfimizdən, İbn Ərəbşaha istinadən (Bax: səh.66(۱۲۳۹ ) ،ابن عربشاه ) əlavə edilib. Məqsədimiz hadisəni bir qədər də canlandırmaq, məıni informasiya cəhətdən daha da zənginləşdirməkdir.*

*[22] Əlyazmada səhvən: gəldi.*

*[23] Əlyazmada: Bu şir (Kəlilə və Dimnə-dən?), yaxud Əsəd adlı hansıa şəxs haqqında olan ərəbcə barədir.*

*[24] 348b – 349b. ،(۱۹۷۲) شرف الدين على يزدى*

*[25] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindəndir. Daşkənd əlyazmasında yoxdur.*

*[26] səh. 356a. ،(۱۹۷۲) شرف الدين علنزدى*

*[27] səh. 352b ; Bax: qeyd 81. ،(۱۹۷۲) شرف الدين على يزدى*

*[28] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindədir. Daşkənd əlyazmasında yoxdur.*

*[29] Bax: əvvəki qeydə.*

*[30] Bax: qeyd 85-ə.*

*[31] Əlyazmada: Tənşəkidən. Mirxondda: Şəkidən* ميرخواند، (١٢٧١) *səh. 101).*

*[32] Mətndə: kəbran, yəni «atəşpərəstlərin».*

*[33] [34] səh. 354b – 355b.* شرف الدين على يزدى (١٩٧٢)،

## 10.2. CAHANGUŞA-Yİ XAQAN-İ SAHİBQIRAN ƏSƏRİNDƏ ŞƏKİ TARİXİNƏ DAİR MƏLUMATLAR

Şəki hakimliyi ölkəmizin orta əsrlər tarixində özünəməxsus rol oynamış və I Şah Təhmasibin hakimiyyəti dövründə, 1551-ci ildə Azərbaycan Səfəvilər dövlətinin tərkibinə qatılmışdır.

Şəki hakimliyinin tarixinin son mərhələsini öyrənmək baxımından Səfəvi mənbələri böyük əhəmiyyət kəsb edirlər. Bu mənbələrin məlumatına görə, hələ 1488-ci ildə I Şah İsmayılın atası Şeyx Heydər öz qızılbaş qoşunu ilə Dərbəndə yürüş edərkən Şəkidən keçib getmişdi[1]. Səfəvi müəllifləri 1500-cü ilin payızında İsmayılın Şirvan üzərinə yürüş edərkən Qoyun-ölümü adlı yerdən Kür çayını keçdikdən sonra Şəki hakiminin qüvvələrini məğlub etdiyini qeyd edirlər[2]. Səfəvi dövrünə aid anonim bir mənbədə göstərilir ki, İsmayılın qoşunu Kür çayını keçdikdən sonra Şirvanşah Fərrux Yəsarın sahildə yerləşdirdiyi üç minlik qüvvəni darmadağın etmişdi[3]. Biz bu faktları müqayisə edərək belə bir nəticəyə gəlirik ki, şirvanşahın müttəfiqi və ya ola bilsin vassalı olan Şəki hakimi özünün üç minlik qoşununu Fərrux Yəsarın göstərişi və ya xahişi ilə Kürün sol sahilində yerləşdirərək qızılbaşların yolunu kəsməyə cəhd göstərmiş, amma buna nail ola bilməmişdi. Bu hadisə Şah İsmayılın hakimiyyətə gəlməsindən və Təbrizdə şah elan olunmasından təxminən bir il öncə baş vermişdir.

İlkin tarixi məxəzlərin təhlili onu göstərir ki, I Şah İsmayılın hakimiyyəti dövründə (1501-1524) Səfəvilərlə Şəki hakimliyi





arasında münaqişələr baş verməmiş, yaxşı münasibətlər mövcud olmuşdur. Məhz həmin dövrdə Şəki hakimliyi Səfəvilərin ali hakimiyyətini qəbul etmiş və onlardan vassal asılılığına düşmüşdü. 1519-cu ildə Şəki hakimi Həsən bəy Təbrizə gələrək Şah İsmayılla görüşmüş və ona öz itaətkarlığını bildirmişdi[4]. 1521-ci ildə Gürcüstanın Kaxeti vilayətinin çarı Levan Şəkiyə hücum etmiş, Həsən bəy Şah İsmayıla məktub yazaraq gürcü hökmdarının bu hərəkətindən şikayətlənmiş və şahdan kömək istəmişdi. Levanın Şəkiyə hücumundan qəzəblənən Şah İsmayıl bunun intiqamını almaq üçün özünün əfsanəvi sərkərdəsi Div sultan Rumlunu Kaxetiyə, Levanın üzərinə göndərmişdir[5]. 1524-cü ilin yazın əvvəllərində Şah İsmayıl Şəkidə yerli hakim Həsən bəy və Şəki əyanları ilə birlikdə ova çıxmışdı. Şah İsmayıl getdikdən sonra Levan yenə Şəkiyə hücum etmiş, Şəki qoşunu sayca çox olan gürcü ordusuna qarşı qəhrəmanlıqla döyüşməsinə baxmayaraq məğlubiyyətə uğramış və Həsən bəy bu döyüşdə şəhid olmuşdu. Bu hadisədən dərhal sonra Levan Kaxetiyə qayıtmışdı. Şah İsmayıl Həsən bəyin qisasını almaq üçün Kaxetiyə yürüş etmək istəsə də, buna əcəl imkan verməmiş və 23 may 1524-cü ildə o, vəfat etmişdir[6].

Həsən bəyin ölümündən sonra onun yerinə oğlu Dərviş Məhəmməd xan Şəki hakimi oldu. Eyni zamanda I Şah İsmayılı oğlu I Şah Təhmasib (1524-1576) əvəz etdi. Onların zamanında Şəki hakimliyi ilə Səfəvilər arasındakı münasibətlər getdikcə gərginləşməyə başladı. Nəticədə, 1551-ci ildə I Şah Təhmasib Şəki hakimliyini ləğv etdi və oranı Azərbaycan Səfəvilər dövlətinin tərkibinə qatdı[7].

Şəki hakimliyinin XVI əsrin ilk rübündəki tarixinə dair məlumat verən Səfəvi mənbələrindən biri Şah İsmayılın hakimiyyətinə həsr olunmuş «Cahangüşa-yi xaqan-i sahibqiran» («Sahibqiran xaqanın dünyanı tutması») əsəridir[8]. Bəzi müəlliflər bu dəyərli və iri həcmli salnaməni şərti olaraq «Şah İsmayılın anonim tarixi» adlandırmışlar. Əsərin müəllifinin kimliyi tam bəlli olmasa da, onun Bicən adlı bir şəxs tərəfindən yazıldığı güman

olunur. Bir sıra tədqiqatçıların ümumi rəyinə görə, bu mənbə 1540-1548-ci illər arasında yazılmışdır[9]. Lakin A.H.Morton fərqli mövqe nümayiş etdirir və o, bu əsərin təxminən XVII əsrin 80-ci illərində meydana gəldiyini irəli sürür[10]. Hər bir halda «Cahangüşa-yi xaqan-i sahibqiran» əsəri Şah İsmayıl Xətai dövrünün tarixinə dair əvəzolunmaz və mötəbər bir qaynaqdır. Bu əsər farsca qələmə alınmışdır və bu vaxta qədər Azərbaycan dilinə tərcümə edilməmişdir. Hazırkı məqaləmizdə sözügedən mənbənin Şəki tarixi ilə əlaqədar məlumatları ilk dəfə fars dilindən Azərbaycan dilinə tərcümə edilərək oxuculara təqdim olunur. Tərcümə üçün Pakistan alimi A.Müztərrin mənbənin Britaniya Muzeyində və Kembric Universitetində saxlanan nüsxələri əsasında tərtib edərək 1986-cı ildə İslamabadda nəşr etdirdiyi elmi-tənqidi mətnindən istifadə olunmuşdur. Proseslərin mahiyyəti və gedişi oxucu üçün aydın olsun deyə həmin əsərdən gətirülmüş Şəki tarixinə dair cümlələr kontekstdən çıxarılmamış və digər hadisələrlə əlaqəli surətdə təqdim olunmuşdur.

*S.43-45*

**Sultan Heydərin Şirvan tərəfə qoşun çəkməsi və o həzrətin cənnət bağlarına və behişt bağçasına yollanması**[11]

*Elə ki Sultan Heydər öz dayısı oğlu olan Sultan Yaqubun[12] kobud rəftarından və yöndəmsiz hərəkətlərindən agah oldu, sufi əmirləri və Səfəvi sülaləsinin tərəfdarları ilə məşvərət etdi. Onun cahanı bəzəyən rəyi Şirvan Dərbəndinə tərəf yürüşə çıxaraq Çərkəz və Dağıstanda qəzavat etməyi qərara aldı. O, fədakar sufiləri çağırmaq üçün səba (küləyi) kimi (sürətli) qasidlər göndərdi və qoşunun toplanması başa çatdıqdan sonra Şirvan vilayətinə yola düşdü. O əyyamda artıq Sultan Xəlilin oğlu Sultan Fərrux Yəsar[13] öz atasının yerinə Şirvan valisi olmuşdu. (Fərrux Yəsar) o həzrətin gəlişindən xəbər tutduqda onun sabitlik və dayanıqlılığının bünövrəsi sarsıntıya məruz qaldı. O, Sultan Heydərin atasının qanının qisasını alacağından və Şirvan*





*vilayətinə qəsd edəcəyindən qorxuya düşərək, o həzrətə qarşı düşmənçilik və nifaq mövqeyi tutdu[14]. Lakin şirvanşah özündə o həzrətə qarşı müqavimət göstərmək gücünü görmədiyindən, öz kürəkəni[15] olan Sultan Yaqubun yanına adam göndərib ona belə bir xəbər çatdırdı:*

*«Sultan Heydər qızılbaşlardan ibarət böyük bir qoşunla döyüşmək əzmi ilə Şirvana gəlir. Heç bir şəkk-şübhə yoxdur ki, o, (Şirvanı) zəbt etdikdən sonra digər məmləkətləri də fəth etmək həvəsinə düşəcəkdir və bu minvalla dövlətin təməlləri laxlayacaqdır. İndi gərəkdir ki, bizim köməyimizə bir türkman qoşunu[16] göndərəsiniz və biz o qoşunun yardımı ilə qızılbaşların bu vilayətə qədəm qoymasına imkan verməyək».*

*Sultan Yaqub bu sözləri eşitdikdə doğru yoldan azdı, (Sultan Heydərlə arasında olan) qohumluq bağlarını qırmağı mümkün bildi və öz kinli ürəyində dünya və axirətdə bədnam olmağın toxumunu əkdi. O, Süleyman Bicən-oğlunu bədbəxtlik gətirən türkman ordusunun dörd min süvarisi ilə birlikdə şirvanşahın imdadına göndərdi və təsdiqləyici bir namə qələmə alıb, ona Sultan Heydəri qətlə yetirmək haqqında icazə verdi.*

*Süleyman bəyin ordusu şirvanşaha qoşulmazdan öncə Sultan Heydər Şirvanın şimal tərəfində yerləşən Şəkinin yolu ilə irəliləyərək o məmləkətə daxil oldu. Daha sonra müzəffər qoşun hərəkət edib Dəmirqapı və Babüləbvab adları ilə məşhur olan Dərbənd qalasının ətəyinə çatdı. Bu qala mətanət və möhkəmlikdə İsgəndər səddi kimi məşhurdur. Buna görə də o qalanın əhalisi inadkarlıq göstərdi. Onlar o fələk əsaslı qalaya bacarıqlı adamlar və döyüş avadanlıqları vasitəsilə istehkam verdilər. Bu səbəbdən o zəlalətli firqənin iqbal sahibi olan (Sultan Heydərin) əli ilə tənbeh edilməsi və cəzalandırılması lazım oldu. O, qazilərə həmin şəhəri və qalanı zəbt etməyi əmr etdi. İgidlər o qalanı zəbt etmək üçün səy göstərdilər. Qısa bir müddət ərzində o mətin qalanın bünövrəsinə sarsıntı saldılar. Az qaldı ki, o qalanın fəth olunması baş tutsun. Ancaq bu zaman Heydəri xanədanının tərəfdarlarından biri olan və qoşunun arxa hissəsinə başçılıq*

*edən Qara Piri Qacar arxadan gəlib xəbər gətirdi ki, türkman qoşununun bir dəstəsi Qara Süleymanın (yəni Bicən-oğlunun) sərdarlığı ilə Kür çayından keçmişdir, şirvanşah Şirvan əsgərləri ilə birlikdə onlara qoşulmuşdur və onlar qalibiyyətli (qızılbaş) qoşunu ilə müharibə etmək iddiasındadırlar. Dinpərvər sultan (Heydər) bədbəxtlik gətirən o güruhun gəlişinə görə zərurət üzündən həmin qalanın ətəyindən çəkildi, o mərdimazar güruhla döyüşə hazır oldu və Təbərsəran hüdudunda iki qoşun üz-üzə gəldi.*

*S.110-113*

***Qayıq və gəminin köməyi olmadan, Allahın himayəsinin yardımı ilə Süleyman şanlı sahibqiran xaqanın Kür çayını keçməsi*[17]**

*Əlahəzrət (İsmayıl) əmr etdi ki, ali məiyyət gəlib çatmazdan öncə Bayram bəy Qaramanlu zülqədər və təkəlü (tayfalarının) qazilərindən ibarət bir dəstə ilə Kür çayının kənarına getsin və Qoyun-ölümü keçidindən çayı keçib çayın o biri tayında mühafizə təşkil etsin ki, şirvanlılar oraya gəlib müzəffər qoşunun keçidinə mane ola bilməsinlər. Bayram bəy itaət edilməsi vacib olan bu hökmə uyğun olaraq Kür çayı tərəfə getdi. Elə ki o, çayın kənarına çatdı, qoşunun çayın hansı yerindən keçməsi barədə hər nə qədər götür-qoy etsə də, orada olan iki keçidin heç birini ordunun keçməsi üçün münasib hesab etmədi. Çox fikirləşdikdən sonra qaziləri iki dəstəyə bölüb, dəstələrdən hər birini o ərazidə birləşən Araz və Kür çaylarının*[18] *iki səmtindən birinə göndərdi ki, orada mövqe tutsunlar və o ucsuz-bucaqsız dəryadan keçmək üçün vasitələr hazırlasınlar. Müzəffər əsgərlər Bayram bəyin göstərişinə əsasən suyun iki səmtində mövqe tutub, bəziləri qayıq və sal düzəltməyin xəyalını qururdu, bəziləri isə gəmi və bərə hazırlamağın fikrinə düşmüşdü. Onlar bu fikir və əndişədə idilər ki, imamət və kəramət xanədanının rəhbəri, yəni Süleyman şanlı sahibqiran xaqan çayın kənarına gəlib çatdı. O, Bayram bəyin fikrindən xəbərdar oldu və bu əndişə və xəyal o həzrətin mübarək təbiətinə müvafiq olmadı. O, şəkk-şübhəsiz və hazırlıqsız bir şəkildə xoş yerişli və balıq əndamlı atını bir neçə addım su boyunca çapdı və (Allaha) təvəkkül edərək, atını akula kimi o sonsuz dəryaya vurdu. İgid sufilər və fədakar qazilər o halı müşahidə etdikdə, heç tərəddüd etmədən o şahsuvarın arxasınca atlarına suya saldılar və onların hamısı Allahın mühafizəsinin zəmanəti altında sağ-salamat o çaydan keçdilər. Bəlağət yükünə malik «Mənim Əhli-beytim Nuhun gəmisi kimidir» hədisinin*[19] *məzmunu gerçəklikdə baş verdi. Bu qəribə işin və əcaib əhvalatın baş verməsi səbəbindən əqidə sahiblərinin o kəramətli ailənin seçilmişinə (yəni İsmayıla) olan inamı artdı.*

*Bu əsnada Şəki camaatı inadkarlıq göstərib üsyan etdi. Süleyman şanlı sahibqiran xaqanın işarəsi ilə qazilər atəş misallı amansız qılınclarla onların həyat xırmanını yandırdılar. Bu hadisənin baş verməsindən sonra o həzrət həmin məkanda dayandı. Növbəti gün Sultan Fərrux Yəsarın yanından bir süvari gəlib belə bir xəbər gətirdi:*

*«Süleyman şanlı xaqanın Şirvan üzərinə gəlməsi haqqında məlumat şirvanşaha çatdıqda, o, dəstəkçilərinin və köməkçilərinin çoxluğundan qürurlanaraq, lovğalığının bolluğundan demişdir ki, əgər o həzrət bu hüduda gələrsə, onun atasının başına gələn hadisə onun da başına gələcəkdir».*

*Süleyman şanlı sahibqiran xaqan bu sözü eşitdikdə, (qəzəbindən) alışıb-yandı. Ertəsi gün Süleyman şanlı xaqan o məkandan köç edib, Gəldi-gələn adlı mövqeyə doğru hərəkət etdi. O mənzildə həmin yerin sakinlərindən olan bir şəxs (Şah İsmayılın) hüzuruna gəlib dedi ki, dinin pənahı olan padşahın (yəni İsmayılın) gəlişindən xəbər tutan şirvanşah 20 min süvaridən və 6 min piyadadan ibarət qoşunu ilə Şamaxı qalasını tərk etmişdir və indi Qəbələ qalası ətəklərində dayanaraq, döyüşə və vuruşa müntəzirdir.*

*S.577-578*

**Div sultanın Gürcüstan tərəfə və Xoca Müzəffərin Mazandaran tərəfə getməsinin şərhi**[20]

*Süleyman şanlı sahibqiran xaqan Marağanın Nəbat mənzilindən səltənətin mərkəzi («darüsəltənə») Təbrizə doğru hərəkətə gəldi. Bir ay sonra isə həmin gözəl şəhəri tərk edib Naxçıvana yollandı və orada qışlamaq qərarına gəldi. Kaxet Gürcüstanının hakimi Ləvənd xan*[21] *itaətkarlıqdan boyun qaçırıb, dinsiz kafirlərdən ibarət çoxsaylı bir dəstəni Şəki vilayətinə basqın etməyə göndərdi. Şəki vilayətinin valisi Həsən bəy ali əşrəfin (yəni Şah İsmayılın) hüzuruna ərizə göndərib, dinsiz gürcülərin gəlişinin şərhini qələmə aldı. Buna görə də Div sultan Rumluya Gürcüstan vilayəti üzərinə hücum etmək haqqında göstəriş verildi. Div sultan mücahid igidlərdən ibarət bir dəstə ilə sürətli hərəkət («ilğar») edərək, özünü «kafirlər diyarına» (yəni Gürcüstana) çatdırdı, Qanıq və Qabırrı çaylarını keçərək, Zəgəm və Girem qalalarını çapıb-taladı. Ləvənd xan qızılbaş əsgərlərinin qorxusundan boynuna qılınc asıb Div sultanın yanına gəldi və təslim oldu. Həmçinin Gürcüstanın digər valiləri – Məlik Qurqura, Davud bəy, Məlvən bəy və Mənuçöhr bəy də Div sultanın hüzuruna gəlib, layiqli peşkəşlər gətirdilər.*

*S.605-606*

**930-cu (1523/24) ilə müvafiq olan kədərlə dolu meymun ilinin hadisələri**

*(Şah İsmayıl) qış fəslinin xoşbəxt günlərini Naxçıvan şəhərində başa vurduqdan sonra bahar gəldi. Lakin bu ilin baharında yaz fəslinə lazım olan təravətin sevinc və şadlıq gətirən qoxusu hiss olunmurdu. Bu baharın çiçəklərinin görkəmindən ölgünlük və solğunluq görünürdü. Cahan gülzarı rahatlıq tapmaq bilmirdi. Sanki zəmanə qeyb pərdəsi arxasında gizli qalan və alçaq fələyin gərdişi və buqələmun taleyin oyunbazlığı üzündən*





*baş verəcək mühüm bir hadisədən xəbərdar idi. Buna görə də həmişə könül xoşluğu və şənliklə keçən Novruz bayramında («Novruz-i sultani») bu il o şadyanalıqdan və səadətdən əsər-ələmət yox idi və qəzavü-qədər fələyinin isti üzlü günəşi min-min nalə və fəğanla həməl bürcünü öz çadırı üçün düşərgəyə çevirmişdi.*

***Beyt:***

*«Bu baharda heç kəsin murad gülü açılmadı,*
*Növbəti bahara qədər təbiətin təntənəsi dirçəlmədi».*

*Novbahar bulud öz ağlamağı ilə ağaclara və budaqlara irtimasi qüsl*[22] *verdi. Təzə-tər yaşıl bitkilər başlarını sallayıb, yerə əyildilər. Lalə başdan-ayağa qədər pərişan olub, al-əlvan rəngi yanağından kənar etdi. Qızılgül paltarını yırtıb, gülməyi unutdu. Bənövşə öz göy libasından*[23] *həzz aldı və bəhrəmənd oldu. Meyvə ağacları bəhər verməmiş əldən düşdülər.*

*Süleyman şanlı sahibqiran xaqan Novruz bayramını qeyd etdi. Həmin gün əmirlər və dövlət ərkanı (şaha) təzim etmək şərəfinə nail olub, layiqli peşkəşlər təqdim etdilər və onların hamısı bahalı xələtlərlə mükafatlandırıldılar. Bayram və şənlik günlərindən sonra həmin bahar fəslində Naxçıvandan Şirvan vilayətinə yollandılar. Elə ki Kür çayının yaxınlığına yetişdilər, Şirvan valisi Şeyxşahın ölüm xəbəri əşrəfin (yəni Şah İsmayılın) qulağına çatdı. O vilayətin hökumət fərmanı onun (yəni Şeyxşahın) oğlu Sultan Xəlilin adına yazıldı. Sultan Xəlil bu xanədanla (yəni Səfəvilər sülaləsi ilə) qohum olmaqla başucalığı qazanmışdı*[24].

*(Şah İsmayıl) Şirvana getməkdən vaz keçib, hərəkət istiqamətini Şəki səmtinə döndərdi. Şəki valisi Həsən bəy onu qarşılamağa çıxıb, (şaha) təzim etmək şərəfinə nail oldu və zəmanə hökmdarına bol-firavan peşkəşlər təqdim etdi. Əlahəzrət şah ov etmək sevdasına və dağlara tamaşa etmək həvəsinə malik olduğu üçün hökm verdi ki, qazilər və Şəki əyanları Gürcüstanla Şəki arasında yerləşən və Şahdağı*[25] *(adı) ilə məşhur olan yerdəki cüyürləri və digər vəhşi ov heyvanlarını qovub bir yerə toplasınlar. Belə nəql edirlər ki, keçmiş sultanlar o vilayətdə Şahdağına*

*pənah aparan ovun ardınca getməzdilər və buna görə də o dağda çoxlu cüyür vardı. Heç bir kəs o cüyürlərə dəyib-dolaşa bilmirdi. Çünki onların (Şahdağında) ovlanması uğursuzluq əlaməti hesab olunurdu. Bu məsələni (şaha) ərz etsələr də, o həzrət buna məhəl qoymadı və ovun başlamasını əmr etdi. Elə ki cərgə ovu tərtib olundu, hökmdar çoxlu cüyür və saysız-hesabsız vəhşi heyvanları Şahdağında ovlayıb, Ərdəbilə tərəf geri qayıtdı. c.606-607*

### Hökmdarın məiyyətinin Ərdəbildən yola düşməsi və Şəki hakimi Həsən bəyin öldürülməsi haqqında xəbərin gəlib çatmasının şərhi

*Süleyman şanlı xaqan bir neçə gün Ərdəbildə ali məqamlı əcdadlarının ziyarəti ilə vaxtını keçirdi və daha sonra oradan səltənətin mərkəzi («darüssəltənə») Təbrizə tərəf yola düşdü. Elə bu zaman Gürcüstanın Kaxet hakimi Ləvənd xanın Şəkiyə gəlməsi və Şəki valisi Həsən bəyin öldürülməsi haqqında xəbər şahın ərzinə çatdırıldı. Bu hadisənin icmalı belədir ki, Şəki valisi Gürcüstanla həmsərhəd olduğundan, onlar arasında həmişə düşmənçilik və münaqişə atəşi alovlanırdı. Dünya şahı (İsmayıl) o vilayətdən (yəni Şəkidən) çıxıb darülirşad (Ərdəbilə) üz tutduğu günlərdə Ləvənd xan Gürcü fürsət tapıb, çoxlu qoşunla o diyara sürətli yürüş («ilğar») etdi və tərəflər arasında böyük bir vuruşma baş verdi. Döyüş nəticəsində Şəki qoşunu qaçmağa üz qoydu və Həsən bəy o mərəkədə şəhid oldu. Ləvənd xan Gürcüstana qayıtdı. Onun bu hərəkətindən hökmdarın (yəni Şah İsmayılın) qəzəb odu alışdı və o istədi ki, qisas almaq üçün hərəkətə keçsin. Lakin bu zaman onun mübarək zatına bir bədbəxt hadisə üz verdi və həmin tədbir təxirə düşdü[26]. Şəki camaatı ondan (yəni Həsən bəydən) sonra Dərviş Məhəmməd bəyi hökumət taxtına əyləşdirdi.*

***Namiq Musalı,***
*tarix elmləri namizədi*





## 10.3. 1384-1404 - ƏMİR TEYMURUN ŞƏKİ ÖLKƏSİNƏ HÜCUMLARI

*Bu monoqrafiyanı kitabça şəklində nəşr etdirməyi planlaşdırırdım. Onun üzərində 2007-ci ilin əvvəllərinə qədər işləmişəm. Cəmi bir neçə ay vaxt lazım idi ki, texniki işləri də başa çatdırım və onu nəşrə tam hazır vəziyyətə gətirib çıxarım. Lakin iş elə gətirdi ki, bu günə qədər heç cürə vaxt tapa bilmədim. Bu müddət ərzində yalnız ondan bir neçə çıxarış edib bu veb sayıda yerləşdirmişəm, bir çıxarış isə «Elm» qəzetində dərc olunub.*

*Aydındır ki, çıxarışlar mütləq redaktəyə məruz qalıblar və nəzərə alın ki, bir çox hallarda onların mətni bu monaqrafiyadakından xeyli yeni və daha mükəmməl ola bilər. Hesab edirəm ki, İnşallah, 2010-cu ilin ortalarında, yenidən bu əsərin redaktəsinə qayıdacağam.*

*Redaktə deyəndə, heç bir məzmun dəyişikliyi olmayacaq, necə ki, lap əvvəldə qeyd elədim, söhbət yalnız sırf texniki işlərdən gedir.*

***Aydın Məmmədov,***
*1.10.2008*

Tarixi Şəki ölkəsinin, yəni müasir Azərbaycan Respublikasının şimal-qərb ərazisinin, tarixini araşdırarkən, Əmir Teymurun yürüşlərindən bəhs edən cəmi bir-neçə mənbədən onun bura etdiyi hücumlar barədə həcm və məzmunca o qədər geniş məlumat tapdıq ki, onların sayəsində 1384 – 1403-cü illərdə cərəyan etmiş həmin hadisələri ayrıca bir mövzu kimi öyrənmək fikrinə düşdük. Əsas məqsəd isə yenə də Şəkinin tarixini tədqiq etmək olaraq qalır, sadəcə, göstərilən dövr üçün bu ölkə tarixini işıqlandıran digər qaynaqların demək olar ki, olmaması ucbatından, biz yalnız Əmir Teymurun yürüşlərini tərənnüm edən əsərlərdən faydalana bilirik. Aydındır ki, bunların mətnindəki Şəkiyə, yaxud şəkililərə dair informasiya daşıyan hissələr də əslində Əmir Teymur, yaxud teymurilərin iştirakı ilə baş vermiş hadisələr

barədə tarixi hekayətlərdir. Onlardan isə nə qədəri indiyə kimi Vətən tarixşünaslığına məlum idisə, həcmcə bir o qədəri də hələ naməlum olaraq qalırdı və ilk dəfə bizim tərəfimizdən, məhz, burada Vətən tarixinə tətbiq edilir. Biz həmin hekayətlərin hamısını, o cümlədən tarixşünaslığımıza məlum olan qismi də, öz tərcüməmizdə bu kitabçaya daxil etmişik.

Yeri gəlmişkən, əslində bu kitabça bizim hazırlamaqda olduğumuz və Şəki ölkəsi tarixinin daha geniş dövrünü əhatə etməli olan monoqrafiyamızın bir hissəsi idi və biz görəndə ki həmin elmi işi başa çatdırmaq üçün hələ xeyli vaxt lazımdır, onu tamamlayana qədər isə əldə etdiyimiz bir sıra nəticələrdən Vətən tarixinin tədqiqində istifadə edilməyəcək, onda, monoqrafiyanın hazır bir qismini – bu kitabçanı, nəşr etdirməyi lazım bildik ki, bəzi nəticələrimiz Azərbaycan tarixinə tətbiq olunsun. Belə ki, son illərdə nəşr edilmiş, daha çox İran tarixinin XIII – XVIII əsrlərini əhatə edən 7 cildlik «Azərbaycan tarixi»nin III cildində (1999) Əmir Teymurun Şəki ölkəsinə hücumları barədə heç nə yazılmayıb. Cildin sonunda verilən «Xronoloji cədvəl»də isə bu mövzuya aid cəmi bir **tarix** (–1402) – «.Şəki xanının Teymurun I Bayazidə qarşı yürüşündə iştirakı.» barədədir ki, bu da yanlışdır. Belə ki, **«Şəki xanının»** (əslində: «Şəki hakimi Seyid Əhmədin» yazılmalı idi; görəsən, 15-ci əsrin başlanğıcı üçün «xan» titulunun nə demək olduğunu, hətta Əmir Teymurun da belə bir titula malik olmadığını bizim tarixçilər niyə bilmirlər!) 1402-ci il Ankara döyüşündə iştirak etməsi barədə tarixi mənbələrdə heç bir məlumat yoxdur! 14-cü əsrin son rübünün ortalarından 1551-ci ilə qədər tarix səhnəsində sanballı iz qoymuş Şəki hökmdarlığının tarixinə də bu cilddə yer ayrılmamış, yalnız 2-ci xəritədə həmin dövlətin təxmini sərhədləri göstərilməklə kifayətlənilmişdir. Belə çıxır ki, bizim tarixçilərimiz Şəki hökmdarlığının tarixini «öyrənmək işini», bu dəfə tamamilə qonşu Gürcüstan və Dağıstan tarixçilərinin öhdələrinə buraxmışlar?!

Güman edirik ki, bizim kitabçamız elmi ictimaiyyətin diqqətindən kənarda qalmayacaq və buradakı tarixi tədqiqatlarımıza, fars dilindən etdiyimiz tərcümələrə vaxtında münasibət bildiriləcəkdir. Şübhəsiz, aşkar ediləcək çatışmazlıq və nöqsanları, hazırlamaqda olduğumuz monoqrafiyada aradan qaldıracağıq, irəli sürüləcək elmi əsasa malik təklifləri də orada nəzərə alacağıq.





## MƏNBƏŞÜNASLIQ – ŞƏKİ ÖLKƏSİNİN 1384 – 1404-CÜ İLLƏR TARİXİNƏ DAİR MƏLUMAT VERƏN MƏNBƏLƏR

**1) Əmir Teymurun təx. 1386-cı ilin 2-ci yarısında Mazandaran hakimi Seyid Əli Kiya'ya göndərdiyi məktub**

Azacıq fərqlə köçürülmüş iki surətindən biri Heydər Evoğlunun «Məcmuə-ye Münşəat»ında, digəri isə Ərmağan» Məcəllə» sindədir. Birincinin Əbdülhüseyn Nəvayi tərəfindən hazırlanmış elmi-tənqidi mətni Tehranda 1962 və 1977-ci illərdə[1] və S. Ə. M. Sabetinin təshisi ilə olan adi mətni isə 1967-ci ildə (kitab içində) nəşr olunmuşdur.[2]

Sözügedən məktub, Əmir Teymurun ilk iki İran yürüşü zamanı, onunla, hərbi marşrutları üstündə, yaxud yaxınlığında yerləşən ölkə və vilayətlərin başçıları, o cümlədən Şəkinin hökmdarı arasında vaqe olmuş siyasi münasibətlərin başlanğıcdan izlənilməsi üçün müstəsna əhəmiyyət kəsb edir.

**2) Nizaməddin Şaminin «Zəfərnamə»si**

Müəllifin təvəllüd və vəfat etdiyi il qeyri müəyyəndir. 1393-cü ildə Bağdad teymurilər tərəfindən tutularkən orada yaşayırdı. Həmin vaxt əsir düşmüş, sonra isə N. Şaminin əla yazı-pozu qabiliyyətini nəzərə alan Əmir Teymur, onu öz yanına xidmətə götürmüşdür. Beləliklə, bizim müəllif, Əmir Teymurun sonrakı yürüşlərinin iştirakçısına çevrilir. **1401/02** (–h. 804)-cü ildə isə Əmir Teymur, N. Şami'yə öz zəfərlərini tərənnüm edən sadədilli bir tarix əsəri yazmaq barədə göstəriş verir. Bu sifariş əsasında işə başlayan N. Şami, «Zəfərnamə»ni qələmə alır və onu 1404-cü il aprelin 12-də şəxsən Əmir Teymura təqdim edir.

Tarixi mənbələrdə, daha sonra N. Şaminin adına 1405-ci il,

yayın ikinci yarısında vaqe olmuş hadisələrin şərhində – Ömər mirza ilə vuruşmağa hazırlaşan və Şəki hökmdarı Seyid Əhmədin (1399 – 1423/1424 +[3]) də daxil olduğu koalisiyanın qarşıdurması ilə bağlı olaraq, təsadüf edilir. Belə ki həmin vaxt Ömər mirzanın yanında olan şəxslərdən biri də N. Şami idi və o, qarşı tərəflə danışıqlarda iştirak edirdi. Deməli, N. Şami, Əmir Teymurun ölümündən sonra Təbrizdə yaşamış və onun nəvəsi Ömər mirzanın xidmətində olmuşdu.

Zamanəmizədək «Zəfərnamə»nin, üzü müxtəlif illərdə köçürülmüş bir xeyli əlyazma nüsxəsi gəlib çatıb. Əsərin Fleks Taur tərəfindən hazırlanmış 2 cilddən ibarət farsca elmi-tənqidi mətni (qeyd və şərhlər çex dilində) 1937 (1-ci cild) və 1956-cı illərdə (2-ci cild) Praqada çap oluunmuşdur. Necati Lüğonun etdiyi türkcəyə tərcüməsi isə 1949 və 1987-ci illərdə Ankarada nəşr olunub.[4] Sonuncudan istifadə etməklə, Akademik Ziya Bünyadov «Zəfərnamə» nin Azərbaycana aid hissələrini dilimizə çevirmiş və bunlar 1992-ci il-də Bakıda kitabça şəklində nəşr edilmişdir. Lakin «Zəfərnamə»nin 1956-cı il Praqa çapının mətni ilə müqayisədə Şəkinin adı çəkilən hissələrdən biri ora daxil deyil. F. Taurun hazırladığı mətndə rast gəlmədiyimiz Şəkiyə aid bir hekayət isə Z. Bünyadovun qeyd edilən iqtibaslar kitabçasında var.

Yuxarıda göstərdiyimiz kimi, N. Şami 1393-cü ildən Əmir Teymurun yanında xidmət etməyə başlamış və həmin vaxtdan da onun yürüşlərinin iştirakçısı olmuşdur. Deməli, mümkündür ki, əsərində təsvir edilən 1393-cü ildən sonraya aid hadisələr, o cümlədən bunlardan Şəkiyə aid olanlar (cəmi 3 epizod; Şəki hökmdarı Seyid Əhmədin Alıncaq qalasında öldürülməsi bəhs edilən bir hekayət istisna olmaqla yerdə qalan ikisi) məhz, müəllifin şəxsi müşahidəsinə əsaslanmış olsun.

**3) Şərəfəddin Əli Yəzdinin «Zəfərnamə»si**

Müəllif Yəzd şəhəri yaxınlığında anadan olub. Təvəllüd ili bilinmir. Vəfatı isə 1454-cü ildir. 1419-cu ildə Fars hakimi İbrahim sultanın (Əmir Teymurun oğul nəvəsi və Sultan Şahruxun





oğlu) sarayında xidmət edərkən bu əsərini yazmaq üçün ondan tapşırıq alıb. Belə ki, İbrahim sultan həmin vaxt babası Əmir Teymur haqqında məxsusi bir kitab yazdırmaq fikrinə düşmüşdü. Bu məqsədlə, lazım olan bütün sənəd və yazılı materialları bir yerə toplatdırmaqla yanaşı, bəzi hadisələrin sağ qalmış iştirakçılarını sarayına dəvət edib onların şəhadətlərini də yazıya köçürtdürmüş və bütün işi ümumiləşdirməyi, yəni lazım olan əsəri tərtib etməyi isə məhz, Ş. Ə. Yəzdinin öhdəsinə buraxmışdı. Kitabın yazılma prosesində, hansısa hadisənin təsvir edilməsi zamanı, nəsə, mübahisəli bir şey olsa idi, İbrahim sultan təcili surətdə böyük şəhərlərə çaparlar göndərib həmin məsələni dəqiqləşdirmək üçün Əmir Teymurun başqa zamandaşlarının da köməyindən faydalanar və həm də, yazdırdığı kitab üçün əlavə məlumat toplatdırarmış. «Zəfərnamə»dəki bəzi şərhlər isə Ş. Ə. Yəzdinin şəxsi müşahidələrinə əsaslanmışdır. Əsər 1424/25 (– h. 828) ci ildə tamamlansa da, müəllif tərəfindən redaktəsi sonrakı üç il ərzində davam etdirilmişdi.

Ş.Ə.Yəzdi sözügedən əsəri 3 «məqalə»dən – yəni 3 cilddən ibarət olmasını planlaşdırmışdı; 1-ci cild – Əmir Teymura, 2-ci cild – Sultan Şahruxa, 3-cü cild isə – İbrahim sultana dair olmalı idi. Fəqət, sonrakı iki cild müəllif tərəfindən ya yazılmamış, ya da, yazılsa da onların orijinal, yaxud surətlərindən heç biri zəmanəmizədək gəlib çatmamışdır.

«Zəfərnamə» 1887 və 1888-ci illərdə, 1-ci və 2-ci hissələr olmaqla Kəlküttədə, daha sonra – 1958-ci ildə, Tehranda çap olunmuşdur.[5] Lakin bu nəşrlər zamanı istifadə edilmiş əlyazma nüsxələrinin heç birində əsərin ümumi həcminin beşdən birini təşkil edən «Müqəddimə» olmadığına görə, təbii ki həmin hissə də çap edilməmişdir. «Zəfərnamə»nin başqa bir, daha mükəmməl nüsxəsinin faksimelisinin – Özbəkistan EA Şərqşünaslıq İnstitutundakı 4472 şifrə altında saxlanılan əlyazmanın, 1972-ci il Daşkənd nəşrində (Ə. Urunbayev tərəfindən çapa hazırlanıb) isə sözügedən çatışmazlıq aradan qaldırılmışdır.

Elə həmin nəşr əsasında da t.e.d. Vaqif Piriyev «Zəfərnamə»dən Azərbaycana aid və digər bəzi maraqlı çıxarışlar edərək, onları dilimizə çevirmiş və bunlar 1996-cı ildə Bakıda kitabça şəklində nəşr olunmuşdur. Biz də sözügedən əsərin, məhz, Daşkənd nəşrindən istifadə etmişik. Gətirdiyimiz iqtibasların Azərbaycan dilinə tərcümə edilməsi işi isə bu dəfə bizim zəhmətimizin bəhrəsidir və biz fars dilindən etdiyimiz bütün tərcümələrimiz kimi, burada da orijinaldakı dili, cümlə quruluşunu mümkün qədər saxlamağa daha çox üstünlük vermişik.

Ş.Ə.Yəzdinin «Zəfərnamə»sində təsadüf etdiyimiz Şəkiyə dair hekayətlər, əsasən N. Şaminin eyniadlı əsərindən götürülmə olsa da, müəyyən fərqlərə də malikdir və hər ikisindəkilər bizim üçün ayrı-ayrılıqda əhəmiyyət kəsb etməkdədir. Belə ki N.Şaminin məlumatları: əksər hallarda bir narrativ mənbənin verdiyi informasiya kimi, Ş.Ə.Yəzdinin yazdıqları isə: birincinin yoxlanılmış və daha da zənginləşdirilmiş redaktə variantı kimi əhəmyyət daşıyır.

**4) Mirxonun «Rövzətüs-səfa fi siratül-ənbiya» əsəri**

Müəllifin təvəllüdü 1433/34 (– hicri 837), vəfatı isə (22 iyun) 1498-ci ildir. Ömrünün çoxunu Herat şəhərində, Teymuri hökmdarı Sultan Baykaranın sarayında keçirib.

«Rövzətüs-səfa.» ümumtarix əsəri olmaqla 7 cilddən ibarətdir. Mirxondun ölümü nəticəsində yarımçıq qalmış sonuncu – 7-ci cild, onun nəvəsi Xondəmir tərəfindən tamamlanıb. Əsərin bütün cildləri hələ 19-cu əsrin 2-ci yarısı ərzində üç yerdə – Bombey, Tehran və Lakxnauda daşbasma üsulu ilə çap edilmişdir.

O ki qaldı «Rövzətüs-səfa»da olan bizim mövzuya dair məlumatlara, yəni Əmir Teymurun Şəkiyə hücumları barədə orada yazılanlara, demək olar ki, bunlar hamısı Ş. Ə. Yəzdi «Zəfərnamə»sindəkinin müxtəsər təkrarından başqa bir şey deyil. Həmin səbəbdən də «Rövzətüs-səfa»ya, yalnız «Zəfərnamə» mətnindəki hansısa sözün oxunuşunu dəqiqləşdirməkdən qeyri, başqa halda istinad etməyəcəyik.





**5) İbn Ərəbşah və onun «Əcaibül-məqdur fi nəvaib timur» əsəri**

İbn Ərəbşah 1389-cu ildə (5 noyabr) Dəməşqdə anadan olub, 1450-ci ildə isə Qahirədə vəfat etmişdir. O, 1401-ci ildə 12 yaşında ikən, Əmir Teymur Dəməşqi ələ keçirmiş, onu, anası və qardaşları ilə birlikdə, yerli sakinlərdən əsir etdiyi bütün intellektual qismin özləri və ailələri kimi Səmərqəndə göndərmişdir. İbn Ərəbşahın 1408-ci ilə qədər Orta Asiyada nə işlə məşğul olması məlum deyil, əsərlərindən yalnız bu anlaşılır ki, əmirlər, alimlər və şahmatçılar arasında imiş. Güman edilir ki, o həmin müddət ərzində Əmir Teymurun nəvəsi Xəlil sultanın xidmətində olmuşdu.

İbn Ərəbşah Səmərqənddə yaşadığı müddət ərzində təhsil almış, fars, türk və monqol dillərini öyrənmişdir. O, 1408-ci ildə səyahətə başlayaraq, əvvəl Çinə yollanmış, sonra oradan Krıma qədər uzaq bir məsafəni qət etmiş, buradan isə Ədirnəyə getmişdir. Ədirnədə ərəb və fars dillərində olan ədəbiyyatı türkcəyə tərcümə etmək işi ilə məşğul olan bizim müəllif, daha sonra Türk sultanı Məhəmmədin (1402-1421) sarayında mirzəlik etmişdir. Sultan Məhəmmədin ölümündən sonra Hələbə getmiş, oradan isə doğma şəhəri olan Dəməşqə qayıtmışdır. 1428-ci ildə (Həcc ziyarətinə gedib-gəldikdən sonra) elə burada elmi-ədəbi fəaliyyətə başlayan İbn Ərəbşah, eyni işi Qahirəyə köçdükdən sonra davam etdirirmiş və «Əcaibül-məqdur...»u 1440-cı ildə məhz, orada başa çatdrırmışdır[6].

Biz «Əcaibül-məqdur»un ərəbcədən fars dilinə Məhəmməd Əli Necati tərəfindən edilmiş tərcüməsindən (1960/61 (h.ş.1339))-ci il Tehran nəşri)[7] istifadə etmişik.

Əsərdə Azərbaycan tarixçiliyi üçün əhəmiyyətli faktlar çoxdur. Maraqlıdır ki Əmir Teymurun sonuncu Gürcüstan yürüşü (1403) barədə İbn Ərəbşahın qələmə aldığı bəhslər də əslində Gürcüstana yox, Şəkiyə aiddir. Bunu biz yalnız həmin hekayətlərin mətninə xüsusi diqqət yetirdikdə aşkar edə bildik. **Belə ki bu hekayətlərdə «Gəl-Gör-Get» adlı bir qaladan da bəhs**

**olunur, Şirvanşah Şeyx İbrahimin dili ilə isə yerli əhali gürcü yox, «tatar» adlandırılır.** Bu zaman bizim üçün aydınlaşır ki, hekayətlərdəki «gürcü» sözləri millət yox, hümmət və məzhəb, yəni «xristian provoslav» mənasında işlədilmişdir. (Məsələn, necə ki Şəki əyalətinin 1824-cü il siyahıyaalma aktlarında Vartaşen kəndində yaşayan pravoslav udinlər «gürcü», qriqoryan udinlər isə «erməni» kimi qeydə alınmışlar [8]. Əmir Teymurun hücumları dövründə, Şəkidə çox sayda xristian yaşaması faktı narrativ mənbədə – İoann de Qalonifontibusun «Qafqaz xalqları haqqında məlumat»ında təsdiq olunur[9])

**Vətən tarixinin bir hissəsi yaşanan həmin hekayətlər, indiyə qədər Vətən tarixşünaslığına məlum deyildi, bunları Azərbaycan dilinə ilk dəfə biz tərcümə etdik.**

Mümkündür ki, ibn Ərəbşah 1403-cü ildə Əmir Teymurun ordusu ilə birlikdə Şəki ölkəsində olmuş, burada baş verən bəzi hadisələri, hansılar ki sonralar «Əcaibül-məqdur»da qələmə almışdır, onları o vaxt 14 yaşında ikən şəxsən müşahidə etmişdir. Şəki ölkəsinin müvafiq dövr tarixinin öyrənilməsi işində «Əcaibül-məqdur»un müstəsna əhəmiyyəti var və bu baxımdan heç də təsadüfi deyildir ki, bizim sözügedən əsərdən iqtibas gətirdiyimiz, Şəki ölkəsindəki Gəl-Gör-Get – Gələsən-Görəsən qalasının 1403-cü ildə Əmir Teymur tərəfindən ələ keçirməsi barədə bəhs (– «O qalanın möcüzəli fəthi barədə dastan») və s. bu kimi mövzumuza uyğun gələn hissələr, aşağıdakı iqtibasların ümumi həcminin yarısını təşkil etməkdədir.

**6) İoann de Qalonifontibusun «Qafqaz xalqları haqqında məlumat»ı**

Dominikanlı müəllif 9 mart 1377-ci ildə Roma papası tərəfindən «Naxçıvan yepiskopu», 26 avqust 1398-ci ildə isə Sultaniyyədə oturmaq şərti ilə, «Bütün Şərqin arxiyepiskopu» təyin edilmişdir. O, 1403-cü ildə Avropaya qayıtmış və 1404-cü ildə orada «Qafqaz xalqları haqqında məlumat»ları qələmə almışdır. İ. Qalonifontibus həmin əsərində ötəri də olsa, Şəki ölkəsinin ərazisi, etnik tərkibi və s. xüsusiyyətləri barədə də məlumat





verir. Müəllifin yazdıqları bu ərazinin Əmir Teymur hücumlarına məruz qaldığı dövrünə aiddir və ona görə də biz həmin ötəri məlumatlara xüsusi diqqət yetirməyə məcburuq!

Sözügedən əsərin T. Layoş tərəfindən macar və ingilis dillərinə edilmiş tərcümələri, müvafiq olaraq 1977 və 1978-ci illərdə Budapeştdə nəşr edilib. Rus dilinə isə mərhum akad. Z. Bünyadov çevirmişdir ki, bu da 1980-cı ildə Bakıda çap olunmuşdur.

**7) Parsadan Qorqicidzenin «Gürcüstan tarixi»**

Müəllifin təvəllüdü 1626-cı il hesab edilir. Vəfat vaxtı isə bilinmir, yalnız məlumdur ki, bu 1694-cü ildən sonraya təsadüf etməlidir. Əslən Qoridəndir. 10 yaşında olanda Kartli çarı Rostom-Xosrov mirzə (1633-1658) tərəfindən himayəyə götürülmüş və onun sarayında yaşamağa başlamışdır. Heç şübhəsiz ki, məhz, burada fars dilini mükəmməl surətdə öyrənə bilmişdir. Belə ki o, hələ, yeniyetmə yaşında ikən bir neçə dəfə mühüm əhəmiyyətli işləri icra etmək üçün İrana göndərilib. 1656-cı ildə II Şah Abbas (1642-1666) P. Qorqicidzeni İran paytaxtına – İsfahan şəhərinə, darğa, bir müddət sonra isə öz sarayına eşikağası təyin edir. Lakin 1666-cı ildə o, şahın qəzəbinə gəlir. Nəticədə dövlət qulluğunda olan qardaşı ilə birlikdə Şüstər şəhərinə sürgünə göndərilir və ömrünün 6 ilini orada yaşamalı olur.

Parsadan Qorqicidze «Gürcüstan tarixi»ndən əvvəl də ədəbi-elmi fəaliyyətlə məşğul olmuşdur. Məsələn, o, gürcücə – farsca – ərəbcə lüğət tərtib etmiş, 40 il əvvəl hazırlamağa başladığı B.M.Əmini «Cam-i Abbasi»sinin gürcü dilinə tərcüməsini 1691-ci ildə tamamlamış və s. Sözügedən «Gürcüstan tarixi»ni isə 1694-cü ildə başa çatdırmışdır.

«Gürcüstan tarixi»nin Gürcüstan Respublikası EA Əlyazmaları İnstitutunda saxlanılan orijinal nüsxəsi 1841-ci ildə məşhur gürcü tarixçisi P.İoseliani tərəfindən əldə olunub.

20-ci əsrin ortalarında V.S.Puturidze əsəri rus dilinə tərcümə etməyə başlayır və bu işi onun şagirdlərindən biri – R.K.Kiknadze sona çatdırır. Biz sözügedən əsərin 1990-cı il Tbilisi nəşrindən (rusca) istifadə etmişik.

«Gürcüstan tarixi»ndəki bu mövzuya uyğun gələn məlumatlar o əsərdən daha əvvəl qələmə alınmış digər Orta əsr mənbələrindən bizə bəllidir. Lakin Qorqicidzenin milli mənsubiyyətinə, dilinə və gürcü tarixi mənbələri ilə tanışlığına görə onun yazdıqlarına da diqqət yetirməyə məcburuq.

## XIII ƏSRİN SONU – XIV ƏSRİN ƏVVƏLLƏRİNDƏ ŞƏKİ ÖLKƏSİNİN ƏRAZİSİ, XÜSUSİYYƏTLƏRİ, ƏHALİSİNİN ETNİK TƏRKİBİ VƏ DİNİ MƏNSUBİYYƏTİ – ŞƏKİ ÖLKƏSİNİN TARİXİ COĞRAFİYASINA DAİR MƏLUMATLAR

**İoann de Qalonifontibusa görə:**

... [Gürcüstandan] *şərqə, düz Kaspi dənizinə, Dəmir qapı şəhərinə çatanadək, hansı ki var Şəki, müxtəlif dinlərdə olan çoxlu xalqlarla qarşılaşmaşmaq olar.*

*Bura – suyu, çörəyi, heyvanları, ipəyi və düyüsü olduqca bol bərəkətli və gözəl bir ölkədir. Onların qoz-fındıqdan əldə etdikləri yağ nəinki, kulinariya, hətta* [yanacaq kimi] *işıqlandırmanın da tələbatını təmin edir[10].*

*Burada hakimiyyət müsəlmanların əlindədir. Burada həm* ***gürcülər[11]*** (oxu: pravoslavlar), ***saratsinlər[12]*** (oxu: müsəlmanlar), *darginlər[13] və ləzgilər[14] yaşayır. Bu yerlə dağlar arasında* (Şəki ölkəsi ölkəsinin hüdudlarından kənarda, onun şimal sərhəddi boyunca?) *iki xalq yan-yana sakin olub: – laklar[15] və darğinlər. Ölkənin bütün şimal hissəsində uca dağlar var, hansı ki onlar da Kaspi, yaxud Bakı dənizinə doğru uzanır.*

*Necə ki mən artıq qeyd elədim, düzənliklərdə və dağların ətəklərində müxtəlif xalqlar yaşayır və hər birinin öz dili var.* ***Onların*** (– əslində, onların xristianlarının) *məzhəbləri gürcülərlə eynidir, amma artıq qeyd edilənlərdən başqa,* [həm də əlavə etməliyəm ki,] *onlar özlərinin bir neçə xüsusi* [dini] *mərasimlərini də icra edirlər.*

*Bu yerdən şərqə doğru ləzgilər[16] yaşayır. Onların öz dilləri var. Onlar dağlarda yaşayırlar[17] və burda qoq və maqoq xalqlarından qorunmaq üçün Böyük Aleksandrın tikdirdiyi divarlar hələ də olduğu kimi durur.*[18]





N.Şaminin və Ş. Ə. Yəzdinin «Zəfərnamə»lərində Əmir Teymurun Şəki ölkəsinə hücumlarından bəhs edilərkən, Şəki ölkəsinin o vaxtkı tarixi coğrafiyasına dair də az-çox məlumat verilmişdir. İbn Ərəbşahın «Əcaibül-məqdur fi nəvaib timur» əsərində isə Gəl – Gör – Get qalası və «mağaralıq»dan söhbət gedir ki, heç şübhəsiz, onların da hər ikisi bu ölkədə idi və birincisi Kiş çayının mənbəyi yaxınlığında yerləşən, indi «Gələsən-Görəsən» adı ilə tanınan qaladır!

### Şəki ölkəsinin 14-cü əsrin sonu, 15-ci əsrin əvvəlləri üzrə tarixi coğrafiyası narrativ mənbələrdə - bütün məlumatların ümumiləşdirilməsi

### Şəki ölkəsinin sərhədləri:

14-cü əsrin sonu, 15-ci əsrin əvvəllərində Tiflisdən bir qədər sonra Şəki ölkəsinin ərazisi başlayır, Kür çayı onun cənub sərhədini müəyyən edir, şərqdə isə bu ölkənin sərhədi Qəbələ şəhərinin yaxınlığından keçirdi. Şəki ölkəsinin həmin dövr üçün hüdudlarını müasir xəritədə[19] təxmini, belə göstərmək olar:

### Şəki ölkəsi ərazisində olan yerlər:

Bu ölkədə Tənqut, yaxud Səkğut (Zaxur?), Ağcab, Bərtaz vilayətləri, Bərtaz eli, Kür çayı yaxınlığında isə Sorxab Qarabağı, yaxud Kiçik Qarabağ adlı yer və Sorxab adlı bir qala var idi. Çox güman ki indiki Kiş çayı o vaxtlar «Ağ su» adlanırmış. Mənbələrdə koordinatları o qədər də konkret göstərilməmiş «Ağ su dərəsi», yəni «Ağ su» adlı çayın mənbəyi», Gəl – Gör – Get qalası və «mağaralıq » deyilən yer də, heç şübhəsiz bu ölkədə idi və onlardan birincisini indiki Kiş dərəsi, yaxud Kiş çayının mənbəyi, ikincisini isə elə həmin ərazidə yerləşən indiki məşhur Gələsən-Görəsən qalası hesab etmək mümkündür.

**Şəki ölkəsi əhalisinə dair xüsusiyyətlər:**

Burada müsəlmanlar hakimiyyətdə idilər. Lakin Şəki ölkəsi ərazisinin dağlıq yerlərində xristianların knyazlıqları, möhtəşəm qalaları da var idi. Xristianların əksəriyyəti pravoslav, az bir qismi – ləzgilərdən bu ölkənin şimal-şərqində yaşayanlar, katolik idi. Pravoslavlar gürcülərlə eyni məzhəbdə olsalar da, gürcülərdən fərqli, məxsusi dini mərasimlər də icra edirdilər. Onlar müxtəlif və fərqli etnik qruplara mənsub idilər. Məsələn, başqaları tərəfindən «tatar» adlandırılan türkdillilər və ləzgilər. Amma onların hamısı albanların törəmələri olmaqla, Şəki ölkəsinin köklü sakinləri idilər, hansı ki albanlar hələ I əsrin I yarısında xristianlığı qəbul etməyə başlamış və Kişdə həvari – apastol kilsəsi tikmişdilər. Katoliklər isə həmin məzhəbə Avropadan gəlmiş missionerlərin təsiri altında, təzəlikcə keçmişdilər. O ki qaldı müsəlmanlara, heç şübhəsiz, onların çoxu, islam dinini qəbul etmiş albanlar, yaxud albanların törəmələri idi.

**Şəki ölkəsinin təbiəti və s.:**

*«Bura – suyu, çörəyi, heyvanları, ipəyi və düyüsü olduqca bol bərəkətli və gözəl bir ölkədir».*

Şəki ölkəsində qoz-fındıq ağacları o qədər çox idi və bu ağaclardan o qədər məhsul götürülürdü ki, yerli əhali nəinki yeməyi qoz-fındıq yağı ilə hazırlayır, hətta evlərini işıqlandırmaq üçün də neft əvəzinə qoz-fındıq yağından istifadə edirmiş.

Şəki ölkəsi ərazisində həddən ziyadə ov heyvanları, xüsusilə də ceyran var idi.

## ƏMİR TEYMURUN İRAN YÜRÜŞLƏRİNƏ BAŞLAMASI VƏ BAŞQALARI İLƏ YANAŞI ŞƏKİ VƏ ŞİRVAN ƏMİRLƏRİNİN DƏ ONA QARŞI ÇIXMASI

14-cü əsrin 70-ci illərində Orta Asiyada – Cağatay ulusunun qərb hissəsində, hakimiyyəti ələ keçirən Əmir Teymur ömrünün sonuna qədər yalnız baş əmir olsa da, əslində, tarix səhnəsində yeni bir imperiyanın bünövrəsini qoymuş oldu. O, 1384-cı ildə





ilk İran yürüşünü edir və Zəncana qədər irəliləyir.[20] Lakin tezliklə geri dönür və bir ildən sonra ikinci İran yürüşünə başlayır. Hər iki yürüşün bəzi təfərrüatı, onun təxm. 1386-cı ilin 2-ci yarısında Mazandaran hakimi Seyid Əli Kiyaya göndərdiyi məktubunun əvvəlində belə xatırlanır:

*Elə ki hümayun bayraqlar İran məmləkətlərinə doğru istiqamətləndirildi, o yürüşdə, sağ cinahlara ilahi* ***inayət*** (–lütf), *tabe olmayan və müqavimət göstərən camaatın halının düzəlməsi nə surətdə əl verdi; və Məlik İzzəddin [Lor]*[21] *və [Padşah]*[22] *Əhməd və digər Kürdüstan melikləri və* ***ümərə-ye*** (–əmirlər) *Şirvan və Şəki və Tiflis valisi Məlik Baqrat ki hər bir [təriqe-ye müxalifət[23]] çalışdı və* ***Cahan Müta' Həzrət Padşah Xuld'ul-lahın*** (–Ə. T.un) *məliklik və sultanlıq fərmanını* ***xilaf*** (–tərsinə) *yerinə yetirib itaət etmək yolundan çıxdılar – nə növdə ədəb öyrənmə və ziyana uğrama tapdılar...*[24]

Buna əsasən məlum olur ki Əmir Teymur ikinci İran yürüşünə 1385-ci ildə başlamamışdan öncə, həmin istiqamətdəki, o cümlədən Cənubi Qafqazdakı hakimlərlə əlaqə yaratmış, bunları tərəfdaşlığa dəvət etmiş, əvəzində isə, bir çoxundan, o cümlədən hansısa Şəki əmirindən (yaxud: ümərasından) rədd cavabı almışdır. Heç şübhə etmirik və eləcə də qəbul edirik ki, bu iş Əmir Teymurun 1384-cü ildəki birinci İran yürüşü zamanı baş vermişdir. Adları sadalanan, Əmir Teymura qarşı şərti koalisiya yaratmış yerli hakimlərin idarəçiliyindəki ərazilərin nəyə görə məlum 1384-cü il yürüşündən kənarda qaldığının və nəyə görə sözügedən Cağatay sərkərdəsinin o vaxt Zəncandan irəliyə gedə bilmədiyinin səbəbi isə həmin sənəd əsasında aydınlaşır: Əmir Teymurun 1-ci İran yürüşü zamanı da Kiçik Lor Hakimi Məlik İzzəddin, Cəlair padşahı Sultan Əhməd (1382–1393; 1405–1412), Kürdüstan məlikləri, Gürcü çarı V Baqtrat (1360–1393), Şirvanşah İbrahim (1382[25]–1417) və Şəki hökmdarı (yaxud: əmir(lər)i), Əmir Teymura qarşı birgə mübarizə apara bilərdilər! Bəli, sonralar Əmir Teymur öz «memuar»larında etiraf edir ki:

Bu zaman ağlıma belə bir fikir gəldi ki, əgər həmin məmlə-

kətlərin padşahları ittifaq bağlayaraq mənə qarşı birləşsələr necə olacaq? Özüm belə qərara gəldim ki, həmin məmləkətlərin padşahlarını ayrı-ayrılıqda tabe etmək, itaətə gəlməyənləri isə cəzalandırmaq lazımdır! [26]

Lakin müttəfiqlərə qarşı Qızıl Orda xanı Toxtamışın timsalında ikinci bir fövqəldüşmənin də peyda olması ilə bu «koalisiya» dağıldı. Onların ərazilərinin isə Əmir Teymur tərəfindən tezliklə və asanlıqla işğal edilməsi üçün şərait yarandı.

1385-ci ilin əvvəllərində Toxtamış xanın 90 minlik ordusu Şirvandan keçərək[27] Azərbaycana soxuldu. Qızıl Ordalılar Təbrizi 8 gün mühasirədə saxlayıb son nəhayətdə onu hiylə ilə ələ keçirə bildilər. Əmir Teymur isə eyni vaxtda Kiçik Lor və Kürdüstana yürüş etdi.[28]Az müddətdən sonra Qızıl Ordalılar Azərbaycan vilayətindən əsir götürdükləri 200 min nəfərlə birlikdə geri döndülər. Bu zaman Əmir Teymur əvvəlcə, öz adamlarından bir qrupunu, hələ ilk İran yürüşü zamanı onun tərəfinə keçmiş olan Cəlair əmirlərindən Adil ağa ilə Təbrizə göndərdi. Bunlara qarşı heç bir ciddi müqavimətin baş vermədiyini gördükdən sonra isə özü də ordusunun əsas hissələri ilə bura gəldi. 1385-ci ildə Təbrizdə üzərində Cağatay ulusunun xanı – Soyurqatmış (1367–1389) və baş əmiri – Əmir Teymurun adları həkk olunmuş sikkələr zərb edildi.[29] O ki qaldı həmin vilayəti təslimə hazırlamış yerli əmir Adil Ağanın aqibətinə, bu iş çox acınacaqlı qurtardı; onu Əmir Teymurun göstərişinə əsasən yaxın adamları ilə birlikdə işgəncə ilə öldürdülər. Beləliklə, Əmir Teymur Azərbaycan vilayətini çox asanlıqla ələ keçirdi. 1386-cı ilin payız fəslinin əvvəllərində isə ətrafdakı digər əraziləri də istila etmək üçün öz ordusu ilə Təbrizdən çıxıb şimal-qərb istiqamətində hərəkətə başladı. Tezliklə Gürcüstana çatdı, oradan da Şəkiyə keçdi... O, özü bütün bunlar barədə elə həmin məktubunda yazır və «Şəki əmir(lər)i» ifadəsini bir daha işlədir:

*Elə ki mübarəki hümayun bayraqlar [Lor-e Kuçik[30]] tərəfə istiqamətləndirildi, Məlik İzzəddinin vilayət və nahiyələrinin küllisi xarab və zəlil oldu və O, və Onun oğlanları azadlıqlarını itirmiş və məhbus* [edilmiş] *oldular; və Kürdüstan məlikləri, Onlardan hər kəs ki üsyan göstərdilər – xəcalətli və gözdən düşmüş oldular; və Əhməd, buna baxmayaraq ki Onu neçə kərə moizə və nəsihətlərlə tənbeh [etdirdik,[31]* [lakin Ona] *doğru və faydalı gəlmədi] və axırı peşiman edildi və bütün qarışıqlıqlar Onun əhvalına yol tapdı; və Şirvan və Şəki vilayətinin ümərası, cəmisi ki qarşıdurma göstərirdilər, əzilmiş oldular və onlar ki* ***Aləm Pənahın*** (–Ə. T.-un) *dərgahına iltica gətirdilər, vilayət və nahiyələri Onlara tapşırılmış oldu və növbənöv himayələr və inayətlər üzrə ixtisas qazandılar. Tiflis valisi Məlik Baqrat ki, Tiflis və Abxaz diyarı və Gürcüstan məmləkətlərinin səltənət və hökumətinin istiqlal və iqtidarına uzun sürən müddətdə hər nə daha tamam edilmiş idi və Onun əzəmət və* ***bəstət*** (qüdrət) *və şövkətinin hilal ayı bədrləndi, Onu islama və itaətə dəvət etdirmiş oldu. Arxayınlıq və saymazlıq göstərdi. Bu halda* ***mənsurə*** (–şanlı) *cəhət ləşgərlər Onun halının dəf və düzəltmək üçün Tiflis tərəfə hərəkətə gətirilmiş oldu. İlahi inayətə, az bir zamana Onun vilayətinin istinadgahları və istehkamları ([vilayətlər[32] O etdirib]) «xilas» edilib, Onu tutub Aləm pənahın dərgahına gətirdilər...*[33]





## ƏMİR TEYMURUN ŞƏKİ ÖLKƏSİNƏ I HÜCUMU

Bir az yuxarıda Əmir Teymurun ikinci İran yürüşündən söz gedərkən, bu Cağatay sərkərdəsinin o vaxt Şəkiyə də hücum etməsi göstərildi və məktubundan iqtibas gətirilərək, onun elə öz dili ilə, İran yürüşlərinə başlamasından ta Tiflisi fəth etməsi və Məlik Baqratı əsir almasınadək müəyyən məlumat verildi. Hadisələrin sonrakı gedişatını, yəni Əmir Teymurun Şəkiyə 1-ci hücumunu öyrənək üçün isə indi iki eyniadlı mənbəyə – N.Şami və Ş.Ə.Yəzdinin Zəfərnamə'lərinə müraciət edək; birinci müəllifə görə: Əmir Teymur Tiflisdən sonra öz ordusunu Şəkiyə doğru hərəkətə gətirmiş və həm də yol boyu ov işi ilə məşğul olmuşdur:

*O qədər şikar düşdü ki çoxluğu hədd və ölçüyə gəlməz. Buna görə ləşgərlər kök ahuları seçirlər və arıqları saxlayırlar ki Şəki dağlarında qalsınlar.* [Əmir Teymur] *[Əmirzadə*[34]*]*

*Dərviş Məhəmmədi Şəkidə düşmənlərin dəfi üçün sərdar təyin edib yola salmaqla bərabər, Ərqunşahı və və Ramazan Xocanı Tanquta*[35]*]* [və Əmir Cahanşahı başqa əmirlərlə] *göndərdi ta* ***ləkziləri*** (ləzgilər yaşayan yerlərə qədərki əraziləri, yaxud ləzgilər yaşayan yerləri də) *qarət etsinlər [Digər əsgərlər Elbrus dağının ətəklərinə getdilər və harada bir qala gördülərsə yıxdıqdan sonra*[36]] *Qəbələ məkanında cəm oldular və* ***Həzrətin bəndəliyi*** (Ə.T.) *[Əmir Məhəmməd bəyi* [37]*]* *Aqcaba*[38] *göndərdi,* [sonra hamısı] *[Kiçik Qarabağa*[39]*]* *getdilər və o yerdə Kür çayı üzərində qayıqlardan körpü gördülər və Sorxab*[40] *qalasını tutdular və o yerdən... Bərdə tərəfə gəldilər*[41]

Ş.Ə.Yəzdi isə eyni hadisələri belə qələmə alıb: Tiflisdən sonra

*Elə ki hümayun* ***məvkibin***(padşah üzəngisi yanında durmaq vəzifəsi daşıyan atlı, yaxud piyada dəstəsi) *çadırları [qurulan yer[42]*[] *Şəki vilayəti oldu,* ***Həzrət sahib qiran*** (Ə.T.) *kafirlərin kökünü kəsmək və çıxarıb atmaq üçün* ***Nüsrət*** (zəfər) ***şüar*** (əlamət) *ləşgəri dəstə-dəstə buranın hər yerinə göndərdi. Əmir Cahanşah bəzi üməra ilə fərmanın hökmü üzrə bütün ləkzilərə[43] hücum edib qarət elədilər və onlardan bir çoxunu cihad qılıncından keçirdilər;* [nəzm:]

Bu kafiri qəza qılıncı ilə axıradək təqib edən o müzəffər bayraqlı qoşunlara,

Qənimət o qədər ki bəlkə hesaba gəlməz, qoşunlar apara bildikləri qədər onlardan apardı.

*və Əmir [Dərviş Məhəmməd]****[44]*** *Bərlas,* ***Gərdun şükuh*** (dünya qədər, yaxud cəlalla hərəkət edən) *qoşunlardan çoxlu güruhla* ***Şəki dağıstanına*** (Şəkinin dağlıq yerlərinə) *girdilər və camaatın bir hissəsi ki itaət etmək və xilas olmaq yoluna qədəm qoymamış idilər, o dağlarda ələ keçirib əsir və kölə vəziyyətinə saldılar və hər nəyə malik idilər qarət və tarac yelinə verdilər;* [nəzm:]

*Müzəffər qoşunlar o dağlıq yerlərdə tarac etmişdilər çoxlu şey, Düşməni candan məhrum etsələr də məcbur idilər amma*





*götürsünlər apara bildikləri qədər hələ ki.*

*və Arğunşah İxtaci və Ramazanxacə, Əsrin zəfər məvkibindən bir dəstə ilə Səkğut****[45]*** *vilayətinə tələsib [qətl və əsir və qarətdən istila]****[46]*** *və mükəmməl qələbə əsərləri zühura çıxardılar;* [beyt:]

*Hara oldu ki o adlı-sanlı ləşgər, niyə olmadı qalib, pərvərdigarın köməyi ilə?!*

*və Əmir Məhəmməd [bəy və]****[47]*** *Əmir Musa;* [beyt:] *Qələbə çələngli, bütün şirlər cumdu birdən.*

*Ağcəb vilayətinə yollandılar və o yerləri istila və zəbt hövzəsinə daxil etdilər;* [beyt:]

*Hər yerdə ki bu hünər zəminindən fənd, müzəffər etmədimi o qoşunları məgər bu?*

*və Həzrət sahib qiran, öz mübarək canı və sair* ***firuzi*** (zəfər) *təsirli ləşkərlərlə Əlbruz* (Qafqaz) *dağının ətəyinə gəlib çıxdı. Rəbb tərəfindən göndərilmiş inayətlər[lə yanaşı****[48]****] gündən-günə artan qüdrət və asimani qüvvətləndirilmiş qoşunlar mənsur bayraqlı əsgərlərin hümayun üzəngisinin* ***nökərinin*** (Ə.T.-un) *sidq niyyətli qolunun qüvvəsi və hüsn-e etiqadı ilə qəza və cihad* [bayrağını] *qaldırıb; və ulu dinin nüsrəti, məlun kor kafirlər üçün cahana ah-nalə və təhlil salıb;* [nəzm:]

*Elə ki cahangir şahın adamları yetişdi, hər tərəfdən ah-nalə qalxdı.*

*O yer ki ordusu səadətli toz gətirdi, din bağının budağında hər zəif ümmət cücərdi.*

*Dalğalandı din üfqünün ənvər namlı bayrağı üzə çıxdı kafirlərin zülmət və zəlaləti və adlı-sanlı əmirlər və fil yıxan, şir ovlayan bahadırlar ki kafirlərin vilayətlərini istila etmək, fəsad və təfriqənin dəfi üçün ətraf və yaxınlara getmiş idilər, bu* ***ziyansızlardan*** (ziyan vurmağa qadir olmayan adamlardan) *bir çoxunu qəzanın qılıncına tuş gətirib və Onların istinadgah və istehkamlarını ələ keçirib və viran etdirib və zəbt və mənimsənilmə altında bol qənimətlər çıxarıb Qəbələ məkanında ali orduya çatdılar;*

*Şahın qoşun dəstəsi tutdu çox ölkə və diyar qala aldı, isteh-*

*kam yıxdı və öldürdü düşmən. Əla keçirib çoxlu qənimətlər saysız-hesabsız, ali ordu tərəfə fəth küləyi ilə gəldi.*

*və* (ordu) *Sorx*[ab] *qalasını da istila edib və yerlə həmvar düzəldib Sorxab Qarabağı tərəfə gəldi və* [Əmir Teymur orduya] *o yerdən köç edib Kür çayının kənarına düşmək buyurdu; və fərman-e qəza-ye cərəyan qüvvəyə mindi ki, qamış və çör-çöpdən* ***navallar*** (hissələr) *hazırlayıb Kür çayı üzərində körpü bağlasınlar; və elə ki, Sahibqiran qazi, mənsur ləşgərlə çaydan keçdi hümayun əzmin yüyəni Bərdə tərəfə dönmüş oldu.**[49]***

Əmir Teymur 1387-ci ilin yaz fəslinin əvvəllərinə qədər Qarabağda qalır. Həmin müddət ərzində orada baş vermiş hadisələrdən yalnız ikisi bizim mövzu üçün maraqlıdır: Əsir düşmüş Gürcü çarı V Baqratın hiylə işlədib qaçmağa müvəffəq olması və Şirvanşah Şeyx İbrahimin layiqli hədiyyələrlə ora gəlib hörmətlə qarşılanması.

Əmir Temur yayda Göyçə gölü ətrafına yaylamamağa qalxır. Daha sonra isə həmin tərəflərdə Cəlairlərin yeganə müqavimət ocağı olan Alıncaq qalasının mühasirəsində şəxsən iştirak edir. Lakin heç bir müvəffəqiyyət qazana bilmir. O, qışı Rey yaxınlığında keçirməyi planlaşdırdığı vaxt xəbər gəlir ki, Toxtamış xanın qoşunları Buxara və Səmərqəndə yürüş edibdir. Buna görə də öz ordusu ilə təcili surətdə ora qayıtmağa məcbur olur.

Əmir Teymurun Orta Asiyaya dönməsindən sonra isə düz 6 il ərzində Azərbaycan və İraq-i Əcəm vilayətlərində anarxiya mövcud oldu. Belə ki bu müddət ərzində, Cəlair sultanı Bağdaddan kənara çıxmadı və sözügedən vilayətlərin idarəsini yerli əyanların öhdəsinə buraxdı...

## ƏMİR TEYMURUN ŞƏKİYƏ 2-Cİ HÜCUMU VƏ ŞƏKİ HÖKMDARI SEYİD ƏLİ ORLATI[50] (+1393 – YANVAR, 1399) TƏQİB ETMƏSİ

6 ildən sonra yenə – 3-cü dəfə, İran istiqamətində yürüş edən Əmir Teymur, 1393-cü il yanvar ayının 27-də Sultaniyyədə





məskən saldı. 3-cü İran yürüşü də Şəkidən yan keçmir. Belə ki, Əmir Teymur Gürcüstandan sonra 1394-cü ilin sentyabr ayında Şəkiyə hücum etdi. Bu barədə N. Şami yazır:

*Tifliş şəhərinə və oradan hərəkətlə – yolda ovlanmaq surətiylə Şəki vilayətinə gəldi. Vilayət əhalisini itaət altına almaq üçün əsgərləri irəli sürərək yola çıxmalarına əmr buyurdu. Əmir Hacı Seyfəddin, Cahanşah bahadur və digər əmirlər, fərmana tabe olub yola çıxdılar. Vilayəti itaət altına aldılar, itaət etməyənləri yağma etdilər. Şeyx Nurəddin bahadur bir ordu ilə dağlar tərəfə getməyə qərarlaşdı. Seyyid Əli mal və mülkündən keçərək qaçmaq yolunu tutdu. Onun vilayətlərini xaraba və viran etdilər və əsgərlər bu vəzifəni yerinə yetirdikdən sonra Əmir Teymurun yanına getdilər.*[51]

Eyni hadisələr Ş. Ə. Yəzdidə isə belə şərh olunur:

*...[Tiflis*[52]*] şəhəri ki o ölkənin* (Gürcüstanın) *taxtgahıdır* [Əmir Teymur orduya ora] *[düşmək buyurdu**[53]**] və buradan şikar etməyə geri dönüb Şəki düzlərinə girdi və neçə gün o məhləni iqamət çadırları qurulan yer etdi; və el və vilayət-e Bərtazın istilası üçün Əmir Hacı Seyfəddin və Cahanşah bahadırı müzəffər bayraqlı qoşunlardan bütün üməra və həddindən artıq güruhla basqına göndərdi və Onlar fərmanın hökmü üzrə təcili yola düşüb büsbütün dağ və çöl Bərtazı**[54]** qarət etdilər və o nahiyələrin el və ulusunu yola çıxarıb sürdülər və Aləm pənahın dərgahına gətirdilər; və* [Əmir Teymur] *Şeyx Nurəddin Sarıbuğanı həddindən artıq ləşgərlə dağlıq yerlər tərəfə göndərdi və O, elə ki dağlıq yerlərə girdi, Seyid Əli Şəki Orlat o hücumçunun xofundan mülk və malını atıb qaçmaq yolunu tutdu. Şeyx Nurəddin Onun evlərini necə ki düşmənin qəlbi kimi boş [və*[55]*] xarab etdi və tarac küləyinə verib atəş vurdu;* [beyt:]

*Və elə ki ondan mühüm asudəlik tapdı, İqbal kimi ali taxtın ayağına tələsdi.*[56]

Əmir Teymur 1394-cü ilin sonunda – qış fəsli başlayanda, ordusunu Şəki hökmdarının ərazisindən çıxarıb, Kür mənsəbi yaxınlığındakı Mahmudabad şəhəri ətrafına, qışlamağa apardı. Yaz gələndə – 1395-ci il fevralın 28-də, ordunu şimal istiqamə-

tində hərəkətə gətirib Toxtamış xan üzərinə yürüşə başladı. Bir daha 1396-cı ilin yazında oradan geri dönən Əmir Teymur, Dərbənd, Şabran, **Aqtam səhrası** (–Muğanın şimalı), Ərdəbil və Sultaniyyədən keçməklə Həmədana gəldi, buradan isə iyulun 18-də Səmərqəndə yola düşdü.

## ƏMİR TEYMURUN OĞLU ƏMİRANŞAH TƏRƏFİNDƏN ŞƏKİYƏ CƏZA DƏSTƏSİNİN GÖNDƏRİLMƏSİ VƏ ƏVƏZİNDƏ, ŞƏKİ HÖKMDARI SEYİD ƏLİ ORLATIN GÜRCÜLƏRLƏ BİRLİKDƏ ƏKS HÜCUMU – 1399-CU İLİN YANVAR AYINDA BAŞ VERMİŞ ALINCAQ QALASI ƏTRAFINDAKI TOQQUŞMA

Əmir Teymur öz imperiyasının paytaxtında da çox qərar tutmur və 1398-ci ilin avqustunda Hindistana yürüş edir... O, bundan əvvəl, İrandan qayıdarkən Azərbaycan vilayətinin və onun ətrafındakı ərazilərin idarəsini öz oğlu Əmiranşahın ixtiyarına buraxmışdı. Ş. Ə. Yəzdiyə görə Əmirzadə Əmiranşah Azərbaycan taxtgahını və Hülaku xan ulusunu elə məharətlə idarə edirmiş ki, *ətarf və* ***əknafın*** (yaxınların) *heç bir padşah zamanında* [padşaha] *itaət etməmiş sərdarları* onun yanına gəliblərmiş.[57] Həmin müəllifin bu sözlərinə və müvafiq hadisələrin sonrakı gedişatı barədə yenə onun və həm də, N. Şaminin qələmə aldıqlarına əsasən güman edə bilərik ki, 1396-cı ilin payızına qədər yəqin ki, Şəki hökmdarı Seyid Əli Orlat da Əmirzadə Əmiranşahın yanına gedibmiş. *Zəfərnamə*'lərə görə, göstərilən ildə (payıza qədər) Əmirzadə Əmiranşah Xoy ətrafında ov edərkən atdan yıxılmış və beyni silkələnmişdir. Bu hadisədən sonra isə ağlı sürətlə azalma başlayır, nəticədə bir sıra qeyri-düzgün işlərə yol verir. O cümlədən, 1397, yaxud 1398-cü ilin payızında, atasının əsas ordusunun ondan çox-çox uzaqlarda olmasını nəzərə almayaraq Şəkiyə qoşun çəkmiş və bu ölkəni qarət etdirmişdi. Əvəzində, Şəki hökmdarı Seyid Əli Orlat 1399-cu ilin başlanğıcında gürcüləri də götürüb, Alıncaq qalasını mühasirədə saxlayan teymurilərin üstünə gedir...





Naxçıvan şəhəri yaxınlığındakı həmin istehkamda Cəlairlərin illər boyu topladıqları böyük bir xəzinə saxlanılırdı və qala neçə il idi ki, Sultan Əhmədin oğlu Sultan Tahir və Cəlair əmirlərindən Əmir Altunun başçılığı ilə Əmir Teymurdan qoşunlarından müvəffəqiyyətlə müdafiə olunurdu. Teymuri əmirləri növbə ilə Alıncaq qalasının mühasirə etməkdə idilər və son nəhayətdə Əmir Teymur tərəfindən bu iş Hacı Seyfəddinin oğlu Sultan Sәncərə və Əmirzadə Əmiranşahın məxsusi qoşunlarına tapşırılmışdı. O dövrlərdə Alıncaq qalasını görmüş İspaniya səfiri Klavixo (vəfatı:1412) onu belə təsvir edib:

*O dağın başında yerləşib, divar və bürclərlə əhatə olunub, divarlardan içəridə isə çoxlu üzümlüklər, bağlar, becərilmiş sahələr, çoxlu su və otlaqlar; dağın lap başında isə qəsr durur.* ***[58]***

Məlum əks-hücum ərəfəsində, Alıncaq qalası daxilində nizam-intizam zəif idi. Qalanın müdafiəsinə məsul olan şəxslər bir-birləri ilə yola gedə bilmirdilər. İbn Ərəbşahın yazdığına görə, hətta iş o yerə gəlib çatmışdı ki, qalanı müvəqqəti tərk etmiş Əmir Altun geri döndükdə onu içəri buraxmamışdılar...[59]

Həmin illərdə Sultan Əhməd Cəlairin əlində yalnız Bağdad və İraq-i Ərəbin bir hissəsi qalmaqda idi. Lakin Gürcü çarı Georgi hələ də Cəlairlərin ali hakimiyyətini tanımaqda idi və Tiflisdə kəsdirdiyi sikkələr üzərində Sultan Əhmədin adını öz adından əvvəl vurdururdu.[60] Yəqin ki 1399-cu ilin başlanğıcında gürcülərlə Şəki hökmdarının Alıncaq qalasına birlikdə etdikləri hücumun sifarişçisi də Sultan Əhməd idi və bu işdə əsas məqsəd isə Əmir Teymurun gözlənilən növbəti İran yürüşünə qədər, xəzinənin oradan çıxarılması[61] imiş. Ş. Ə. Yəzdi yazır:

[Əmirzadə Əmiranşah] ***Həmən ilin*** (– 1397, yaxud 1398) *payızında, Seyid Əli Orlatdan bir müxalifət şübhələndi ki, ona görə və təhqiq etdirmədən ləşgər çəkdi və Onun vilayətini qarət etdirdi; və elə ki [şahzadənin****[62]****] ovqatının xarab olması söz-söhbətləri Onun eyş və işrət və qələt-e iltifatında, məmləkətlərinin işlərinin idarə edilməsi və tərtibində çoxalma tapdı, xəbis təbiətli gürcülər****[63]*** *ki... onların fəsad və tüğyanı Həzrət sahib*

*qiranın möhkəm qəhr [şüşəsində****[64]****] cilovlanmış idi, ürəkləndilər; və o müddətdə ki,* ***o həzrət*** (– Ə.T.) *Hindistan yürüşünə buyurmuş idi, cəsarət ayağını mütilik cızığından kənara qoyub, müxalifət başlatdılar; və bu vaxt Sultan Əhməd Cəlairin oğlu [Sultan Tahir****[65]****] ona itaət edən bir qism camaatla Alıncaq qalasıda idi və Sultan Səncər [bin] hacı Seyfəddin, qəza cərəyan fərmanın hökmü üzrə uzun sürən müddətdə, yenə də o qalanı mühasirə edir və qalanın ətrafı*[nı] *cəmi tərəflərdən «daşdan bir divar»* [halına] *gətirmiş idilər. Belə ki bir kəs qaladan bayıra gedə bilməmişdir və bir kəsə [də] bayırdan qalaya yol yoxdur; və istehkam əhli yaxşıca təngə gəlmiş idilər. Bu fürsətdə, qələbə əzmli gürcülər, dinsizləri topladılar və Seyid Əli Şəki, əgər ki islam şüarinda tanınmış idi, onunla əlaqədar ki, Onun vilayətini tarac etmiş idilər, belə ki deyilmiş oldu,* [indi O,] *gürcülərlə ittifaq etdi və Sultan Tahir ki, mühasirə işinin təzyiqi canına və biçaq sümüyünə [dirənmiş idi****[66]****],* [Onu] *xilas etmək əzmi ilə Alıncağa üz tutmuş oldular və Azərbaycan vilayətinə girib,* ***dostluq edənlər*** (Seyid Əli Orlat) *və* ***düşmənlər*** (gürcülər) *müsəlman vilayətlərini xarab etməyə əl atdılar; və elə ki Sultan Səncər bu haldan agah oldu, qaladan çəkildi və Təbrizə getdi və vaqiənin surətini Əmirzadə Miranşahın ərzinə yetirdi. Şahzadə öz oğlu Əmirzadə Əbubəkr ilə Sultan Səncər və Hacı Abdulla və Məhəmməd Qəzğun və Şeyx Məhəmməd tavaçi kimi əmirlərə və digər üməraya o fitnə odunu sön-dürmək fərmanı verdi və onların hamısı Alıncaq tərəfə rəvan [oldular****[67]****]; və elə ki gürcülər Alıncaq istehkamına yetişdilər, Sultan Tahir* [Cəlair xəzinəsini də götürüb, yaxın adamlarından ibarət bir dəstə ilə[68]] *aşağı düşdü və Onlarla birləşdi; və qalanı Hacı Saleh və Seydi Əhməd Oğulşani və üç nəfər gürcü aznauruna tapşırdılar; və gürcülər böyük üməraya və bahadırlara «aznaur» deyirlər və necə ki onların məqsədləri Sultan Tahiri xilas etmək idi, muradlarının hasil olmasından sonra geri döndülər; və o yaxınlarda da Təbriz ləşgəri Onlara çatdı və qoşunun tərəfləri cərgəyə düzülüb cəngə çıxdı; və necə ki gürcülər* ***qələbə qayəli****(üstün) idilər, Onların aznaurları tərsliyə gəldilər və Təbriz ləşgərinin sağ*





***cinah*** *və sol cinahına hücum etdilər və Seyid Əli Şəki mərkəzdən* ***irəli*** *çıxıb intiqam üçün Əmirzadə Əbubəkrin üstünə getdi. Baxmayaraq ki, cavanbəxt şahzadə bir* ***müjdə*** *(yeniyetmə) yaşında* ***idi, səbat*** (mətanət) *ayağını dirəyib [yəni qaçmayıb] igidlik kamanının* ***bir cübbə*** (60 ədədlik ox kisəsi?) *oxunu atdı və altmışda zəfər açdı və [belə ki, oxlardan] biri Seyid Əlinin dəbilqsinin zireh ətəyi üzərinə[, yəni zərif hissəyə] getdi və bundan keçib boyun damarına [sancıldı****[69]****] və o «qorxmaz» həlak torpağı üzərinə yıxıldı: «vəlair və əş-şəl fi əl-müxbir misl əl-əsəd».****[70]*** *Amma elə ki gürcülər qalib olmuş idilər və Təbriz ləşgəri qovulub, şahzadə də geri qayıtdı və sağ-salamat bu təhlükəli yerdən kənara çıxdı; və gürcülər [də] öz məkanlarına qayıtdılar.****[71]***

Bu hadisədən düz bir il sonra, Əmir Teymur 1399/1400 (h. 802)-cü illərin qışında Qarabağda olarkən, Alıncaq qalası ilə bağlı məlum hadisənin təhqiq olunması üçün məhkəmə qurdurdu. Bu barədə Ş. Ə. Yəzdinin yazdıqları, mühakimə prosesinin gedişat və nəticəsi ilə yanaşı, həm də Əlincaq döyüşünün bəzi təfərrüatına da aydınlıq gətirir:

*Bu əsnada Əmirzadə Miranşahın ümərası barədə fərman-e əla sadir oldu ki, gürcülərin müharibəsində ki, Alıncaq ətrafında – hadisə bəyan edilmiş idi, hamısı təqsir etmiş idilər və fərar edib*[lər]. ***Böyük Yirğu Divanında*** (–hərbi məhkəmədə) *soruşdular; Əmirzadə Şahrux və əmirlər fərmanın hökmü üzrə* [onları] *əmrə tabe olmağa durğuzdular və elə ki sual-cavabdan və təftiş və təhqiqdən sonra halın surətini, necə ki vaqiə olmuş idi, humayun ərzin izzətinə çatdırdılar,* ***Ələtabanın*** (Ə.T.un) *vacib hökmü çıxdı ki, Hacı Abdulla Abbas və Məhəmməd Qazan üçün dal və qabaq* ***yasaq*** (cəza) çubuğu *vursunlar və Yəmən Həmzəye Əprəddin barədə ki hamıdan əvvəl qaçmışdı, işarət oldu ki yasağına yetişsin* [,yəni öldürülsün] *və* [yalnız] *şahzadələrin xahişi ilə canına aman tapıb, Onun üçün də dal və qabaq çubuğu vurdular və onların hər birindən cərimə olaraq üç yüz at tələb etdilər və Əmirzadə Miranşahın bütün əyan və nökərləri üzrə halın hökmü ilə əllisindən* [də] *iki yüz-üç yüz at həvalə olunmuşun* [üstünə[72]] *gəlindi və bütün o atları pənahı zəfər*

*qoşunların piyadalarına qismət etdirdilər; və Əmirzadə Əbubəkr barəsində padşahanə atifət ki, o cəngdə igidlik göstərmiş idi və Seyid Əli Şəkini oxun bir cübbəsi ilə həlak torpağına atıb – əzizlənən və nəvziş siniflərinə ixtisas çəkdi* [, yəni əzizlənən və nəvaziş göstərilən şəxslərdən oldu]. *Beyt:*

*Şahdır himayəçi, üzü bu zamandan layiq hörmətə, qəhr və lütf bəxş etdi hər rəfiqinə.* [73]

Əgər, «protokol»da qeyd edilən *ayan və nökərlər* ifadəsini «əmirlər», yaxud «qoşun başçıları» mənasında qəbul etsək, məlum Alıncaq hadisəsində Təbrizdən əks-hücuma keçən və son nəhayətdə Şəki–Gürcüstan qoşunları tərəfindən məğlub edilərək geri otuzdurulan Teymuri qüvvələrinin əsgəri sayı barədə bu nəticəyə gəlmək olar: Əgər N. Şamidə Alıncaq döyüşündən fərar etmiş 50-dək əmirin cəzalandırılmasından söhbət gedirsə və Əmir Teymurun» memuarları»na görə isə ən aşağı rütbəli əmirin əlinin altında azı 1000 nəfər durmalı idisə,[74] bu halda, həmin döyüşə Teymuri tərəfindən 50 mindən çox adamın çıxdığını güman edə bilərdik; amma Əmirzadə Əmiranşahın o qədər əsgərə malik olması ağlabatan[75] olsa da, 50 min nəfəri bütünlüklə Alıncağa göndərməsinə gələndə, bu iş heç də inandırıcı görünmür. Həm də diqqət yetirəndə ki, Əmir Teymur Xəmşa dərəsinə ***ilğar*** (çevik hücum əməliyyatı) təşkil edərkən ordusundakı hər on nəfərdən yalnız 3-nü bu işə cəlb etmişdir, hansı ki bu barədə bir qədər sonrakı iqtibasda söhbət gedəcək, onda, ehtimal edə bilərik ki, o dövrlərin ənənələrinə görə ilğar üçün ordunun hər on nəfərlik dəstəsindən yalnız 3 süvari seçilməli idi və yəqin ki, Əlincağa tələsik əks-hücum edən Teymurilər də həmin qaydaya riayət etmiş, Əmirzadə Əmiranşahın 50 minlik ordusundakı hər minlikdən yalnız 300 süvarini, yəni cəmi 15 min nəfəri ora göndərmişlər. Əgər məlum məhkəmədə də hamıdan əvvəl qaçmaqda təqsirləndirilmiş üç əmirin hərəsindən cərimə olaraq 300, digərlərindən 200 – 300 arası miqdarında at tələb edilibsə, heç şübhə qalmır ki, əks-hücum zamanı hər qoşun yalnız 300 süvaridən ibarət imiş və onlar döyüşdən qaçdıqlarına görə hamısının





atlarının əllərindən alınmasına qərar verilmişdir. Yeri gəlmişkən, məlum döyüşdə iştirak etmiş süvarilərin atlarının əllərindən alınması məsələsində, hələ bizdən 3 əsr əvvəl, gürcü tarixçisi P. Qorqicidze də bizim kimi nəticə çıxararıb:

...[Əmir Teymur Əlincaq hadisəsinə görə Miranşahın] *üç yüz cəsur döyüşçüsünü atdan düşürdü, onarın atlarını payladı orduya, özlərini isə məcbur etdi qabaqda piyada getməyə.* [76]

O ki qaldı yalnız Hacı Abdulla Abbas, Məhəmməd Qazan və Yəmən Həmzə-ye Əprəddindən konkret olaraq 300, digər əmirlərdən isə təxmini 200-dən 300-ə qədər at tələb olunmasına, fikrimizcə, məhz, hamıdan əvvəl qaçmaqda ittiham olunmuş adları çəkilən əmirlər, yəqin ki, döyüşə heç girməmiş, bu halda isə qoşunları da təlafata məruz qalmamış, bu səbəbdən də onlardan müsadirə edilmiş atların sayı ilə hər qoşun üçün təxmin etdiyimiz süvari sayı tam üst-üstə düşmüşdür. Fikrimizcə, digər 50-dək əmirin qoşunu döyüşdə iştirak etdiyinə və bu səbəbdən də hər biri 0–100 arası sayda süvari itirdiyinə görə isə onlardan konkret olaraq 300 yox, sadəcə, yalnız sağ qalmış döyüşçülərinin atlarını – *iki yüz-üç yüz at* verməк tələb olunmuşdur.

Beləliklə, biz şəxsən belə nəticə çıxartdıq ki, **məlum hadisədə Əmirzadə Əmiranşahın göndərdiyi, hər biri 300 süvaridən ibarət olan 50-dək qoşundan (təxm. 15 min nəfərlik ordudan) üçü, toqquşma başlayan kimi meydanı tərk etmiş, vuruşmağa davam edən digərləri isə hər biri 0–100 arası sayda süvari itirdikdən sonra geri çəkilmişdir!**

Təəssüf ki, bu mənbələrdə Şəki – Gürcüstan tərəfinin əsgəri sayı barədə bir şey deyilmir, yaxud heç nəyə işarə edilmir. Amma Əmir Teymurun «memuar»larına diqqət yetirdikdə, həmin tərəfin 12 mindən 40 minə qədər döyüşçü ilə vuruşduğunu ehtimal etmək mümkündür. Belə ki Əmir Teymur orada qaydalar qoymuşdur ki, *əmr elədim ki əgər düşmən əsgərlərinin sayı on iki min süvaridən əskik olarsa, bu vuruşda qoşuna əmirül-üməra başçılıq eləsin!;*[77] *və əmr elədim ki, əgər, düşmən qoşununun sayı on iki mindən artıq, qırx mindən əskik olarsa bəxtiyar*

*oğullarımdan biri qoşunuma sərdar olsun!*[78]

Bu qaydalara əsasən, onlara riayət edildiyi təqdirdə, Şəki – Gürcüstan tərəfində 12 mindən 40 min nəfərə qədər döyüşçü olmalı idi. Belə ki əgər həmin tərəfdə 12 mindən az adam olsaydı, onda, teymurilərin əks-hücumuna Əmir Teymurun nəvəsi Əmirzadə Əbubəkr deyil, hansısa *əmirül-ümərə* başçılıq etməli idi.

İndi isə Alıncaq qalası yaxınlığında baş vermiş məlum döyüş barədə N. Şaminin yazdıqlarını nəzərdən keçirək:

...[Əmirzadə Əmiranşahın] *necə ki daha əvvəl ağlının dönməsi qanına*[, yəni xasiyyətinə] *keçmiş idi, Ondan haqsız yerə bir adamın üstünə düşmək kimi adətinə uyğun olmayan bir hərəkət sadir oldu. Dost və düşmən birlikdə Ondan uzaqlaşmış oldular. Daha bu dərəcəyədək ki, Seyid Əli Şəki, baxmayaraq ki daha əvvəl tabe olur və itaət edirdi, müxalifət göstərdi və* [Georginin[79]] *gürcü ləşgəri ilə Sultan Tahir bin Sultan Əhməd ki Alıncaq qalasında mühasirədə idi,* [köməyə] *getdi. Üməra ki o yerin mühasirəsi ilə məşğul idilər, birlikdə fərar etdilər. Əmirzadə Əmiranşah bahadırın yanına getdilər və həmin saat Əmirzadə Əmiranşah* [öz oğlu] *Əmirzadə Əbubəkrə, hazır ləşgərlərlə əks-hücum buyurub, Seyid Əli [Şəki*[80]*]nin dəfinə göndərdi; və Onlar Alıncaq qalasının ətrafında idilər, ora çatdılar. Seyid Əli də yolun bir döngəsində həmlə yetirdi və diqqət verməyərək,* [Əmirzadə Əbubəkrin əvəzinə(?)] *digər birinin üzərinə şığıdı və bərk cəng oldu və o mərəkədə Əmirzadə Əbubəkr bahadır bir ox atar ki,* [bu ox] *Seyid Əlinin dəbilqəsinin zireh ətəyi üzərinə getdi [və] zirehdən keçərək şah damarına sancıldı; və Seyid Əli necə ki dağın bir zirvəsindən, həmən bir yaraya minik heyvanının* (atının ?) *belindən yıxıldı və* [beləcə də] *həlak oldu; və Sultan Tahir, Əmirzadə Əbubəkrin yetişməsindən qabaq qaladan çölə çıxmış idi və Seyid Əhməd namlı əlaltısını, Sərkiz namlı [erməni*[81]*] ilə Alıncaq qalasına müqərrər* (rəsmən təyin olunan) *edib, elə ki Seyid Əlini o vaqiə yıxdı,* [Cəlair xəzinəsini və qohumlarını götürüb[82]] *gürcülərlə birlikdə Grcüstan tərəfə fərar etdi və ondan sonra Bağdada – atasının yanına getdi; və*





*Əmirzadə Əbubəkr* [Alıncaq qalasını mühasirə etmiş əmirləri] *sabiq qayda üzrə yenə Alıncaq qalasının mühasirəsinə müqərrər buyurub və Seyid Əli Şəkinin başını bədənindən ayırtdırıb atasının* [Əmiranşahın] *yanına gətirdi*[83] *və bu səbəbə bir nökəri Səmərqəndə* (əslində, Hindistana) *göndərdilər.* [84]

Əmir Teymuru Hindistan yürüşü boyu müşayiət etmiş Qiyasəddin Əlinin verdiyi məlumata[85] görə onlar geri dönərkən – 1399-cu ilin mart ayının 3-də, Cənavə çayı yaxınlığında Miranşahın yolladığı *nökərlərlə* qarşılaşıblar. Bu adamlar, təlimatlarına uyğun olaraq, hansı ki məzmunu artıq yuxarıdakı iqtibasdan bəllidir, öz tərəflərində baş vermiş son hadisələr, o cümlədən Alıncaq qalasındakı vəziyyət barədə Əmir Teymura məlumat veriblər.[86] Onların Təbrizdən Hindistandankı Cənavə çayı yaxınlığına qədər təxm. 3 min km.lik yolu neçə günə qət etdiklərini bilsəydik, həm də Alıncaq qalası ətrafında baş vermiş məlum hadisənin, o cümlədən Şəki hökmdarı Seyid Əli Orlatın həlak olduğu vaxtı da dəqiqləşdirmiş olardıq. Lakin təəssüf ki, bu işdə məsələnin həllinə bir yox, iki nöqteyi-nəzərdən yanaşılması zərurəti meydana çıxır. Belə ki, əgər Əmir Teymurun imperiyasında xüsusi yol xidməti olsaydı, Əmirzadə Əmiranşahın yolladığı *nökərlər*'in mənzil başına çatmaları üçün bir ay kifayət edərdisə, adi halda bunun üçün iki dəfə çox müddət tələb olunmaqdadı. Amma hər halda, Əlincaq hadisəsinin vaxtı ilə Seyid Əli Orlatın hakimiyyətinin başa çatması, yəni onun həlak olma tarixini şərti olaraq 1399-cu ilin yanvar ayı hesab etmək mümkündür. Yeri gəlmişkən, xatırladaq ki biz bu nəticəni yuxarılarda artıq tətbiq etmişik.

Əmir Teymur öz «memuar»larında sözügedən hadisədən hələ Hindistanda ikən xəbərdar edilməsi və bu səbəbdən də yürüşdən təcili olaraq geri dönməsi barədə barədə belə yazır:

*Məsələn, Hindistanı zəbt elədiyim vaxtlarda, Rum qeysərinin mənim məmləkətlərimə basqın elədiyi, gürcülərin isə öz yurdlarından çıxaraq mənim qoşunumun mühasirədə saxladığı bəzi qalalara gedib, həmin qalaların içərisindəki adamlara yardım*

*elədikləri haqqında mənə xəbər gətirdilər. Öz-özümlə **genəşdim*** (məsləhətləşdim): *Əgər Hindistanda bir az da qalsam İran məmləkətlərinə zərər yetişəcəyi mümkün idi. Buna görə də Hindistanın paytaxtındakı işlərimi tezliklə nizama salıb, yürüş elədim. Yolda bir neçə gün Mavəraünnəhrdə dayandım. Oradan Ruma və Gürcüstana doğru yola düşdüm.[87]*

Eyni mənbənin başqa bir yerində isə belə deyir:

*Hindistan yürüşündən zəfərlə qayıdandan sonra hələ səfərin yorğunluğu canımdan çıxmamış hər iki İraqın hakimlərindən mənə şikayət ərizəsi gəldi. Onların yazdığına görə Gürcüstan kafirləri həddini aşıb, cızıqlarından çıxıblarmış... Gürcüstan imansızlarının üsyan qaldırdıqları haqqında xəbər gəlib mənə çatan kimi məşvərət çağırdım...*[88]

## ŞƏKİNİN YENİ HÖKMDARI SEYDİ ƏHMƏDİN[89] (YANVAR, 1399 – 1423/24+) ŞİRVANŞAH ŞEYX İBRAHİMLƏ ƏMİR TEYMURUN QARABAĞDAKI DÜŞƏRGƏSİNƏ GƏLMƏSİ VƏ AĞ SU DƏRƏSİNƏ BİRLİKDƏ HÜCUM

Əmir Teymur 1399-cu ilin sentyabr ayının 22-də Səmərqənddən İran istiqamətində 4-cü yürüşə başladı. Ş.Ə.Yəzdi yazır:

*...nüsrət şüar bayraqlar Qaradərə və Ərdəbil yolundan Qarabağ tərəfə üz tutdu və* [Əmir Teymur ordunu] *Muğan və Aqtam səhralarında şikar etdirib Araz çayı kənarına düşürdü və bu çay üzərində qayıqlardan körpü bağladıb* [onu] *səadət və salamatlıqla* [çaydan] *keçirdi və Arran Qarabağını cəlal çadırları qurulan yer, bayraq və qüdrət anlatması və qarşılama mərkəzi etdirdi; və əla bir ordu Qotur kənd ərazisində ki Ömər Taban* [90] *yurdu idi,* [orada] *qışlaq etdirdi və Əmirzadə Əbubəkr və Əmir [Süleymanşah*[91]*] bu yerdə astana öpmək şərəfinə çatdılar; və Əmirzadə Miranşahın ümərası və qoşununun əyanlarından hər biri öz hallarına münasib peşkəşlər düzdülər.*[92]





Ş.Ə.Yəzdi daha sonra Əmir Teymurun düşərgəsinə Şirvanşah Şeyx İbrahimlə Şəkinin yeni hökmdarı Seydi Əhmədin gəlməsindən bəhs edir. Bu barədə N. Şaminin *Zəfərnamə*'sində də məlumat var və daha əvvəl qələmə alındığına görə, gəlin, əvvəlcə oradakıları nəzərdən keçirək:

*...Əmir Şeyx İbrahim ki, Həzrət sahib qirani süfrəsində o şirvanşah əhd* [etmiş] *idi Seyid Əhməd bin Seyid Əli Şəkini **Həzrətə*** (– Ə.T.a) *gətirib Onun günahını bağışlatsın və Həzrət sahib qirani Onun günahını bağışlayıb* [və Seydi Əhməd] *dövlət astanasını öpməyə çatdı və çoxlu **soyurğallar*** (–irsi torpaq mülkü) *və saysız hesabsız inayətlər qazanıb digər* [əzizlənən] *ümərə zümrəsinə qatıldı; və Əmir Şeyx İbrahim toy tərtib edib o qədər at və qoyun kəsmiş idi ki, mətbəxtçilər onu bişirməkdə aciz oldular. O peşkəşlərdən sonra, canlı şikar növləri və qulamlar və **cariyələr*** (yeniyetmə qız kənizlər) *və qumaşlar və silahlardan qeyri və o cümlədən, altı min at çəkdi.[93] Əvvəlinci kərələr Gürcüstan tərəfə Həzrət sahibqiraninin buyrulan basqın söhbəti kimi, gürcülərinki də daha əvvəl söylənilmiş oldu ki Alıncaq qalasına getdilər və Sultan Tahir Sultan Əhməd oğlunu bu yerdən kənara apardılar və Seyid Əli Şəki, Əmirzadə Əbubəkrin əli ilə qətlə yetirildi və gürcülər öz **kutvallarını*** (komendanlarını) *Alıncağa qoydular. Ona görə, səltənətin və cahangirliyin namusu baxımından lazım göründü ki, o yoldan çıxmışlardan intiqam üçün bütün Gürcüstan üzrə acınacaqlı vəziyyət yaratsınlar. O cümlədən, Həzrət Sahibqiranın hökmü qüvvəyə mindi ki, bütün ləşgərlərdən hər on nəfər süvari və piyadadan üç nəfər bu basqına **rəvanə*** (gedən) *olsunlar və on günlük azuqə götürsunlər və qalan əsgərlər də qışlaq yurdunda məqam ...*[94] [gözləsinlər.][95]

Eyni mövzu Ş.Ə.Yəzdi tərəfindən isə belə qələmə alınıb:

*...necə ki bundan əvvəl Şəki vilayətinin valisi Seydi Əli Orlat, Gürcü ləşgəri ilə ittifaq etmiş idi və Alıncaq qalasının içinə girib və can üstündə*[, yəni ölüm ayağında] *o nadanlığı edib, belə ki şərh verilmiş oldu, bu vaxtda, Onun oğlu Seydi*

*Əhməd ki* [indi] **Onun** (Seyid Əlinin) *el və vilayətinin* ***əyalət*** (bir vahid, yaxud bir hissə) *sahibi olmuş idi, atasının cürəti ilə əlaqədar* ***Sahib qiran gərdun aləm xadimlərinin*** (Ə.T. un) *intiqamına görə təşvişə düşən və rahatlıq tapmayan oldu və Əmir Şeyx İbrahimin Şirvan mülkünə iltica apardı ki, O,* [bu hərəkəti ilə də] ***o həzrətin*** (Ə.T. un) *bəndələrinin bəndəliyin-də səmimiyyətin artmasına ixtisas səmti tapmış idi. Beyt:*

*Hər kim bəndəliyin səmimiyyət qandalında, baş vurdu yüksəyə başıaşağılıqdan.*

*Şeyx İbrahim padşahanə əhvin ortaya çıxması üçün Onu qədim xilafət taxtının ayağına gətirdi və astana öpmək izzətinə çatdırdı. Seydi Əhməd tabe olmaq* ***zəmininin*** (məfhumunun) *ədəb dodağı ilə busə verdi və Şeyx İbrahim Onun cərimələrinin əfvini*[, yəni ləğv edilməsini] ***padşahanə mərhəmətlər hamisindən*** (Ə.T.-dan) *xahiş etdi və Həzrət Sahibqiranın mərhəməti Onun təqsirat «naxış»larını əhv və gözyumma «yazısı» ilə ləğv edib,* [Onu] *azizlənmək və nəvaziş siniflərində başıuca etdi və atasının mənsəb və məqamı Ona əta edildi. Şeyx İbrahim çoxlu* ***savəri*** (məcburi «bəxşiş») *gətirib toy tərtibi ilə məşğul oldu; və toy üçün o qədər at və qoyun kəsmiş idi ki, mətbəxçilər onu bişirməkdə aciz qaldılar və* ***tavaçılər*** (orduda yüksək rütbəli əmirlər) *onu ləşgərə* ***qismət etdirib*** (paylatdırıb) *hamısını bişirditdilər və toy günü* [hamının həmin bişmiş ətlə təmin olunması işini] ***bakavullara*** (orduda təchizat işi ilə məşğul olan məmurlara) *tapşırdılar; və digər bayram vasitələrinin məcmusu onun* [yəni bu tədbirin] *özünə daxil idi; və bu peşkəşlərdən sonra canlı ov heyvanları növləri və qulamlar və cariyələr və növbənöv qumaşlar və paltarlar və sənətkar* ***cəbaları*** (vergiləri) *və silahlar və qeyrilərdən və o cümlədən, altı min at çəkdi...**[96]***

*Həmən qışda –* ***səkkiz yüz ikinci ildə*** (noyabr 1399 –fevral 1400) *ki, Qarabağ bu ordugahdan nüsrət yuvası idi* [Əmir Teymur] *gürcülər üzərinə getmək niyyətini gerçəkləşdirmək istədi və* [planlaşdırdığı basqında iştirak etmələri və bu basqına hazırlaşmaları üçün] *Şeyx İbrahim və Seydi Əhmədə xələt verdi*





*və azizlənmək və nəvaziş siniflərinə məxsus edərək [geri qayıtmaq[97]] rüxsəti əta etdi və* **Cahan mütanın** (Ə.T.un) **yarlığı** (fərmanı) *qüvvəyə mindi ki, o ləşgərin cəmisindən [hər[98]] on nəfərdən üç nəfər on günlük azuqə götürüb* ***Göytüstan*** (– qüdrətli) *məvkibin qulluğunda olsunlar və qalan ləşgər və s.lər həmin yerdə dursunlar; və nüsrət şüar bayrağı bu zaman hifz edib, basqına hazırlıq işi gördürüb bütün şahzadələrlə Onların vilayətinə üz tutdu; və elə ki hümayun nüzul edib Kür çayının sahilində düşərgə qurdular, Əlatabanın lazımi fərmanı çıxdı ki, bütün qayıqları toplayıb çay üzərində körpü bağlasınlar; və «şah və ordu» o körpüdən keçdilər; və Şeyx İbrahim Şirvan ləşgəri ilə Əsrin zəfər mövkibinə qatıldı və Seydi Əhməd də qulluqda oldu; və [hümayun[99]] məvkib o yerdən tərpənib,* [Şəkinin ortasından[100]] *keçib Xəmşa dərəsi tərəf ki kafirlərin**[101]*** *məkanları və sakin olduqları yer idi* [ora] *rəvan oldu; və o dərənin hamısı* ***cəngəlistan*** (sıx meşəlik)*...idi*

*Aləm müta' yarlıq qüvvəyə mindi və peşəsi zəfər ləşkərlər on günlik yol*[dakı] *ağacları dəhrə və balta ilə qırdılar və yol düzəltdilər elə ölçüdə ki beş-altı qoşun biri digərinin yanında gedə bilsin və bu əyyam, iyirmi gün müddətində ara vermədən qar yağır və yüksəkliklərdən yetirib, müşk kimi [müddəte [102]] bulud dağ və biyaban üzərində* [ağ-appaq] *xırda «kafur» hazırlanır və elə ki İslam ləşgəri kafirlərin məhlə və məqamına bədbəxlik aqibəti seyr etdi, firuzə kimi günbəzin altında qaziyanə fikir və təhlilin zümzüməsini saldılar və cihad qılıncı intiqam qınından çıxarılılıb, qarın üzünü ki yer üstünə əsl pərdə tutmuş idi, dinsizlərin qanından, üzü qeyrətli lalə və* ***ərğəvan*** (qırmızı bir gül adı) *etdilər; hər kim tapılmış oldu, aman tapmadı və hər kim aşkara çıxdı, aşkarda qalmadı və Xəmşa ki o ölmüş məlunların başçısı və* [onlardan] *faydalanan.* (Quran ayəsi) *O, idi, acizlik və qorxudan tərk-e xanuman olub fərar. etdirdi; dünya şanlı əsgərlər Onun tələbində Aq su dərəsinədək yüyürdülər və kifayət qədər inək-qoyun və cins mallardan qeyrilərini qənimət götürərlər və elə ki Xəmşa şir şikar edən mücahidlərin*

*qarşısından çaqqal kimi meşənin içinə qaçdı Din pənahın qoşunuı cəhənnəmliklərin evlərini odladı və kəndləri talan və qarətin sər-sər* [küləy]i *ilə viran qoydular; beyt:*

*Sakinlər cəhənnəm içində və məskən atəşdə yanıb, millətin çöhrəsi qazilərin fəthindən odlanıb.*

*Və necə ki o yoldan azmışların eyşi badəsiz ötüşmürdü və Onların kişi və qadın və uşaqları* [da] *buna vərdiş etmiş idilər; bu qayə ilə ki, hər kim ölür; beyt:*

*Vəsiyyətidir ki: mənim ruhum bədənimdən çıxanda, mey və şənlik olsun və bir də, yaxşı tənəkdən düzəldilmiş tabut!şərabsız dəfn etdirmirdilər və kafirləri zərərə salmaq və Onların eyşini azaltmaq üçün ki, iqtibas:.* (Quran ayəsi). *ali əmr oldu ta bağat və bostanlaradək Zəfər qərin ləşgərə paylansın və bütün uca dağların hamısına çıxıb şeytan əməli [olan] tənəkləri ki məstedici badə ümidi ilə bəslənmiş idilər əllə məhv etdilər və digər ağacların bəzisini kəsdilər və bəzisinin qabığını soydular və o yerlərin ...və... kilsələr ki ibadət o məhsullarsız qeyri-məqbul, yerlə bərabər etdilər və gündən-günə artan qüdrətin qəribə təsadüfləri: Həzrət sahib qiran, sabiq qış ilində ki Bars ili idi,* [həmin vaxt] *Hindistan ölkəsi və Dehli və Qanq çayı yerləri və ətrafında qəza edir və bütxanələri dağıdır*[dısa] *və bu qışda Dovşan ili ki, bir il müddət* [hələ] *tamam olamayıb, Gürcüstan vilayətində cihadla məşğul idi və kəlisələri dağıdır və.; beyt:...*

*Sənin Büraq əzmin ki bir kam götürmüşdür Hinddən, ....*

*Doğrusu ki, əgər İsgəndər oldun, qüdrət atını bu uzunluq və endə min yerə...*[çapdın] *və əgər daban-dabana ta* [günbatan yerin] *altınadək* ...[çıxmaq üçün] *mücərrəd əhdin məsafəsinin qətindən kənara çıxmadın; beyt:*

*Biri üçün yardım zamanı köməkçidir, onun hekayəti digər halətdir.*

*Kafirlər Nüsrət bayraqların, Xəmşa dərəsi* **qəzavatının** (oxu: toqquşmasının!) *başa çatmasından geri dönən kimi mübarizlər cihad meydanında bir aya yaxın o ölkənən eniş və yoxuşlarını minik heyvanlarının dırnaqlarının ağalıq və istilasına tapşıralar*





*və kafirlərin aznaurlarından və dinsizlərin* ...[döyüşçülərindən] *dən ələ keçənləri od saçan iti qılıncla birdəfəlik, cəhənnəmin dibinə göndərdilər və Onların hakimləri Xəmşa, avara və səsi çıxmayan oldu və kafirlərin diyarı həddindən artıq viranlıq tapdı və o zamanda havanın soyuqluğunun şiddəti həddini keçmiş idi və yollar qarın çoxluğundan keçilməz olmuşdu; nəzm:*

*Və elə ki neçə gün müddət keçib və bu vasitə ilə ləşgərlər üçün azuqə tapa bilmədilər və atlar üçün ağac qabıqlarından qeyri yemək qalmadı, beləcə, dördayaqlılardan çoxu tələf oldu, Həzrət sahib qiran qayıtmağa qərar verdi və Kür çayından keçib...* [103] [Qarabağdakı düşərgəsinə üz tutdu].

İqtibasdan göründüyü kimi, bu ilğarda Əmir Teymur müvəffəqiyyət qazanmayaraq geri dönməyə məcbur olub. Düzdür, Ş. Ə. Yəzdi həmin faktı birbaşa açıqlamır, amma hər halda, teymuriləri xeyli mədh edəndən sonra, lap axırda da olsa, üstüörtülü etiraf edir.

Hadisələrin harada cərəyan etdiyini dəqəqləşdirmək üçün, burada göstərilən *Ağ su dərəsi*'nin kordinatlarını bilmək, yaxud o vaxtlar elə adlanan çayın indi hansı adla tanındığını tapmaq lazımdır. Oradakı *Ağ su* ifadəsi isə «Ağ su» adlı hansısa çayın mənbəyi'ndən qeyri, başqa bir mənada başa düşülmür. Əlimizdə müəyyən dəlillər var ki, indiki Kiş çayı nə vaxtsa *Ağ su* adlanıb.[104] Ystəlik, diqqət yetirəndə ki, Kiş dərəsində, daha doğrusu, həmin dərədəki Kiş kəndində birinci həvari, yəni apastol kilsəsi də var, bu halda ora Ş. Ə. Yəzdinin səciyyələndirdiyi kimi *kafirlərin məkanları və sakin olduqları yer*'ə, yəni Xəmşa, yaxud Ağ su dərəsinə daha çox uyğun gəlməkdədir.

O ki qaldı *Əmir Xəmşa*'ya, Alıncaq hadisələri ilə bağlı tarixi məlumatlarda adı çəkilməsə də orada iştirak etməsi bizim üçün şübhə doğurmayan bu şəxs, fikrimizcə, Kiş çayının yuxarı hövzəsində mövcud olmuş bir «udel knyazlığı»ın knyazı idi.

Yeri gəlmişkən, P. Qorqicidze Əmir Xəmşanın adını *Xamşia* kimi oxumuş və məlum hadisəni belə yozmuşdur:

[Əmir Teymur Şəkiyə yola düşəndə] *Xamşia, Kaxet və*

*Şəki ordusu ilə onun qarşısına çıxdı. Gürcülərlə türklər arasında şiddətli döyüş oldu. Hər iki tərəf əzmlə vuruşdu, onlardan və bunlardan xeylisi öldürüldü. Teymur böyük qələbə qazana bilərdi, amma Ximşia döyüş təcrübəsinə malik idi. Başa düşdü ki, türklər qalib gələ bilərlər, necə ki o yerə yaxşı bələd idi, girdi meşənin içinə. Türklər iki-üç yerdə dayandılar... və yol düzəltdilər...* [105]

Ehtimal etmək olar ki, sabiq Şəki hökmdarı Seyid Əli Orlatdan asılı olmuş Əmir Xəmşa, onun ölümündən sonra oğlu Seydi Əhmədin hakimiyyətini tanımaq istəməmişdir. Necə ki, Ş.Ə.Yəzdi yazır ki Seyid Əhməd atasının *el və vilayətinin əyalət sahibi olmuş idi,* yəni onun hakimiyyəti Şəki ölkəsinin bütün ərazisini deyil, yalnız bir hissəsini əhatə etmişdir. Amma bilmək olmur ki, o, teymurilərə meyl etdiyinə görə Əmir Xəmşa ona qarşı çıxmışdır, ya atasının ölümündən sonra Şəki knyazları, o cümlədən Əmir Xəmşa tərəfindən dəstəklənməməsinə və bu səbəbdən də Şəki ölkəsində hakimiyyətini bərqərar edə bilməməsinə görə kömək üçün teymurilərə meyl etməyə məcbur olmuşdur?

## ƏMİR TEYMURUN, ŞƏKİ ÖLKƏSİNDƏKİ MAĞARALIQ İLƏ GƏL – GÖR –GET QALASINI ƏLƏ KEÇİRMƏSİ VƏ ŞİRVANŞAH ŞEYX İBRAHİMİN ARADÜZƏLDƏNLİK ETMƏSİ

Əmir Teymur Qarabağa qayıdan kimi, son illərdəki uğursuzluğun heyfini, 1 il əvvəl baş vermiş məlum Alıncaq hadisəsində Şəki –Gürcü qoşunlarının qabağından qaçmış əmirlərdən çıxmaq fikrinə düşüb məhkəmə qurdurdu, hansı ki o barədə yuxarıda bəhs edildi və bu mövzuya bir daha müraciət etməyə, artıq, ehtiyac yoxdur. O, bütün qışı Qarabağda keçirib, 1400-cü ilin yazında Gürcüstana yürüş etdi. Əsas bəhanəsi isə, guya, Sultan Əhməd oğlu Tahirin orada sığınacaq tapması imiş. Ümumiyyətlə, Əmir Teymur 1404-cü ilin yazında Səmərqəndə qayıdana qədər, bir neçə dəfə Gürcüstanı çapıb-taladı. Onun Gürcüstana ən axırıncı, 1403-cü ilin ikinci yarısına təsadüf edən hücumu zamanı isə Səkinin xristianlar yaşayan şimal hissəsi də qırğın, talan və qarətə məruz qaldı. Əmir Teymurun Gürcüstana son hücumu *Zəfərnamə*'lərdə geniş şərh olunub. Amma Şəki ilə bağlı təfərrüata, bir müəmmalı hal istisna olmaqla, biz yalniz ibn *Əcaibül-məqdur*' da təsadüf edirik. Maraqlıdır ki Əmir Teymurun sonuncu Gürcüstan yürüşü barədə bu tarixçinin qələmə aldıqları, əslində Gürcüstana yox, Şəkiyə aiddir və daha çox, bir adamın dilindən deyilən təəssürata, yaxud xatirəyə bənzəməkdədir. Diqqət yetisək ki, *Əcaibül-məqdur*' müəllifi ibn Ərəbşah 1401-ci uldə ailəsi ilə birlikdə teymurilər tərəfindən əsir götürülmisdür, bu halda, onun, Əmir Teymurun 1404-cü ildə Səmərqəndə qayitmasına qədər Cağatay ordusunda saxlanılmasını və 1403-cü ildə həmin ordu ilə birlikdə Şəki ölkəsində olmasını və orada baş verən bəzi hadisələri, hansılar ki sonralar *Əcaibül-məqdur*' da qələmə almışdır, onları o vaxt, 14 yaşında ikən, şəxsən müşahidə etməsini də güman etmək mümkündür:

***Teymurun Gürcüstan və xaçpərəst ölkəsi yanına yetişməsi***

*Teymur elə Gürcüstan diyarına gəlib yetişənədək[106], dərya kimi dalğalanan ordu ilə hərəkət edirdi. O kiçik bir ölkədir və adamları Məsihə sitayiş edənlərdir. Amma bu kiçiklikə, saysız-hesabsız qalalar və möhkəm bürclər və mağaralar və pusqugahlar və dağlar və dərələr və uçurumlar səbəbinə xarici ziyandan qorxusuzdurlar və o məkanlardan hər biri dikbaşlıq və təkəbbürlülükdə israrlı qaldı ki, işğalçı və təcavüzkarların fərmanı qəbul etmədi. Oranın şəhərlərindən Tiflis və Trabuzan və Abxazdır ki, oranın paytaxt*[lar]*ı idi, bu məkanlar təslimdən yaxalarını kənara çəkdilər və zamanın ixtiyarını* ***Bunun*** (Teymurun) *əlinə tapşırmadılar, Teymur mühasirəyə durar və məşvərətə oturar, o məkanlardan biri, bir* ***mağaralıq*** (Marxal?, Sığnaq?) *idi ki, onun darvazası lap hündür bir uçurumun ortasında, indiki zamanın hadisələrindən kifayət qədər qorxusuz, gələcək zamanınkılardan kənarda yer tutar və aşağıdan yuxarıya* [ən uzaqatan] *məncana-*

*qın «əli»* [hara] *çatsa ondan daha hündürdə, yuxarıdan aşağıya doğru* [ən uzun] *nərdivanın ayağı* [hara]*batsa, bundan daha aşağıda, daxil olma yolu: örtülü və pünhan qədr gecəsi kimi, ona yetişmək: işıqlı və aşkar bədirlənmiş ay kimi* [əlçatmaz], *artıq bir tamah Teymuru, onun mühasirəsinə sövq etdi və çalışdı və yanyörəsini xeyli gəzdi, öz mühəndis zəkasını işə saldı və qarma-qarışıq düşüncə və ağlın vəlvələsi ilə kəfinə aram verər, birdən, fikrinə bu gəldi ki əzab atəşini ora yuxarıdan endirsin və o yuvası uca* ***«Hümayı»*** («Cənnət quşunu») *havada şikar etsin. Tez buyurar ki,* ***dəbanə surətli*** (zirehli) *sandıqlar düzəltsinlər və* [bunları] *uzun zəncirlərlə və qüvvətli adamlarla dağın yüksəklik və zirvələrindən sallasınlar və göyün bəlası kimi aşağı endirsinlər.*

*Onda elə etdilər və yerlə göy arasındakı fəza o sandıqlarla doldu və o dağın və* [o dağın] *sakinlərinin canlarına titrəmə düşdü və Onlar yüksəkliklərdə süzən bir şahin kimi «uçuşanda», halın dili ilə* [Quran ayəsinin bu hissəsi***[107]***] *xatırlanmaqdadır:* أَلَمْ يَرَوْا إِلَى الطَّيْرِ مُسَخَّرَاتٍ فِي جَوِّ السَّمَاءِ مَا يُمْسِكُهُنَّ إِلاَّ اللَّهُ... *(Məgər görmədilər səmanın yüksəkliklərində süzən quşları ki, oranı onlara məskən edən, onları orada idarə edən Allahdan başqa bir kimsə deyil.;*[108] *və elə ki mağaranın ağzı ilə bərabər* [səviyyədə] *oldular,* ***onu*** (mağaranı) *vuralar və tökülüşələr və sandıqların içərisindən ciyər yandıran ox və ürək deşən nizə ilə əllərini çıxıralar və ip və kəmənd və digər vasitələr və silahları işə salalar və o arada fitnə və qarışıqlıq yaradalar və elə ov şahini kimi kimi «uçmaq»da idilər və o yurd-yuvaya yaxınlaşırlar və «pəncə» və «dimdik» göstərirlər və o mağara Onların yetişməsinə öz möhkəmliyi ilə maneçilik törədir və cəngavərlərinin köməyi ilə ki, onun içində mövqe tutmuş idilər Onların aşağı gəlmələrinin qarşısını alır. Onadək ki o əldən iti «uçan» adamlardan biri uğur və qələbə ahəngi ilə mağaranın ağzı yanına çəngəl batırdı və öz sandığı ilə o yuvaya əl atdı, səadətin ağuşu açılmış oldu və* ***münasibin*** (bu şəxsin) *əlini qucaqladı, xristian qövmü bir-birinə qarışmış oldu və qabaqlarındakını tanımadılar; bu tək-tənha Onlara hücum etdi, ta böyüklərindən bir çoxu*





*öldürülmüş oldu, onda, digər öz yoldaşlarını içəriyə səslədi və Onların köməyi ilə, o kəslər ki mağaranın bir küncündə gizlənmiş idi bayıra qovdu.*

*O adamın adı* ***Lhrasb*** *idi;* [və bunun isminin] *malik olduğu altı hərf ki, onun üç hərfi* ***sakindir*** (hərəkəsizdir, yəni bu samitlərin aralarında sait yoxdur) *və* [yeri gəlmişkən, qeyd edək ki ] *fars dilində və türk dilində sakin hərflərin* [beləcə] *vəhdəti boldur.*

***Bu qalalardan digər biri Gəl-Gör-Get'in göydələn qalasıdır ki*** *öz adı kimi dikbaşlıq və təkəbbürdən söz açar və* ***onun*** (adının) *mənası türkcə belədir: «gələrsən, görərsən və geri dönərsən», yəni bir kimsə ona baxmaqdan başqa, qeyri bir şeyə nail olmaz*[!], *onun binası üç tərəfdən hündür təpəliyin üstündə*[dir] *və* [yüksəkliyi həmin] *tərəflərin yüksəkliklərinin hamısından daha yüksəkdir.* ***Digər*** (dördüncü) *tərəfindən dar və nahamar yol* [gəlir] *və* [bu yol] *sərt və çətin bir keçiddə başa çatır və o yolu gedən qarşılaşdığı sərtliklərə sinə gərərək hündür bir uçuruma və dərin bir yarğana yetişər ki, onunla qalanın darvazası arasında bir körpü bağlamışlar və körpü götürülərkən qalaya giriş qapadılmış olar.*

*Teymur elə ki o halın həqiqətindən agahlıq tapdı və o pünhan bir xəbər aşkar oldu, bu qərara gəldi ki, öz məqsədinə çatmayanadək o məhlədən köç etməsin; amma o qalanın yaxınlığına, bir məkan ki, ora düşər və ora elə yer ki dalğalanan dəniz onun içində yerləşsə tapmaq olmaz, bəlkə bütün ətrafı qarma-qarışıq idi və uçurum və yüksəklik elə bil, necə ki öz ərinin qarşısında həyasız bir qadının qəzəbli çöhrəsi – bütünlüklə sərt və kobuddur.*

*Amma Teymur tamahkarlığından öz sığınacaq və qərargahını orda, o qalanın göz qabağında qurdurmuşdu və ləşgərləri növbə ilə mühasirə və get-gəl işində olurlar və qala adamları gündüzlər körpünü götürüb müharibə və mübarizə bəlasından amanda idilər, çünki, o ətrafda bir məkan ki, mübarizə üçün yarasın və bir meydan ki, cəng üçün işə keçsin, tapmaq olmaz! Və teymurilər elə ki səhər açılır, uzaqdan ox atmaqla [döyüşün başqa dəhşətlərindən] qurtulurlar və qane aşiq kimi, bir baxışa*

*məmnun olurlar və gecə düşən kimi öz çadırlarının yolunu tuturlar və o yaxınlıqda bir yer yox idi ki bir gecəni başa vura bilələr, o zaman xaçpərəstlər körpünü yerinə qoyub dar bir yol ki, orda öz ehtiyaclarını təchiz edə bilərlər,* [həmin yolu] *açırlar və gediş-gəlişə başlayırlar, Teymur üçün o qaladan ümidsizlik nişanı zahir olan kimi və* ***onun*** (qalanın) *fəthini özü üçün xam arzu hesab edən kimi* [O,] *köç göstərişi verdirdi; amma bu rüsvayçılıqdan qorxuya düşdü və bu geri çəkilməsi üçün bəhanə və* [uydurma bir] *«səbəb» axtarır.*

***O qalanın möcüzəli fəthi barədə dastan***

*Teymurun ləşgəri içində boyları bir və qolları iki şir qüvvəsində iki cavan var idi ki, xasiyyət və görkəm və qorxmazlıq və mərdanəlikdə biri o birindən o qədər də fərqlənmirdi, mübarizə meydanında biri digərinə müvafiq irəli çıxır, tərəzinin iki gözü kimi bərabər olurdular, təsadüf düşdü ki, o ikisindən biri Gürcüstan adamlarından[109] bir kafir ki, şücaətdə şir kimi və boy-buxunda dağ kimi idi,* [onunla] *qabaq-qabağa çıxdı və Bu Onu yerə yıxıb başını kəsib götürdü və Teymurun dərgahına apardı və bu işdən yüksək bir rütbə qazandı; bu «özünü göstərmə» Bunun bərabərinin ürəyinə təsir etdi və onu bərk şəkkə gətirib məcbur etdi ki bir çarə fikirləşə ki, bəlkə özünün tayı yanında daha yaxşı bir (iş görüb ad-san) qazansın; Onun adı Pirməhəmməd və ləqəbi Qənbər idi və körpü işində heç kəs ondan çox tanışlıq və sərriştəyə malik deyildi. O, bir gecə döyüş vasitələrini və öz adamlarını yığıb ilahi köməkliyə güvənməklə, boş və pünhan bir məhlə seçib pusquda durdu və elə gözlədiyi şərait və uğur içində münasib zaman olur, gah sinəsi üstündə süründü, gah da çöməlib iməkləyə-iməkləyə yol gedir və bir toxumun bəhrəsindən ki,* [o toxumu] *ürəyinin tarlasında əkmiş idi,* [bu barədə öz-]*özü ilə söhbət edir.*

*Ta o dəmədək ki sübh çağı üzündən niqabı çıxarıb atdı və xristianlar «götürülən körpü»yə tərəf geri döndülər və onu qurmaq üçün bir-birlərinə kömək edirlər, Pirməhəmməd körpü tərəfə həmlə edər və körpünün kəndirlərini qırar və Onlar*





*körpünü götürmək üçün əl* [tutmağa bir şey] *tapmadılar; bu halda Ona hücum etdilər və* [üstünə] *daş və ox yağışı yağdırdılar, Bu, əcəli heç nə ilə tapmayıb, bir iş ki, həllini nəzərdə tutmuşdu* [o işdən] *geri oturmadı və* [atılan] *ox və daşdan hansı Ona çatır*[sa] *baş-gözünə dəyir, Onlar beləcə vuruşma və cəngücidalda idilər ki, günəş çıxdı və ruzigar öz təəccüblü işindən barmağını dişlədi və dövranın gözü bərələ qaldı, Onlar ki mühasirə işində idilər, artıq ondan əl çəkərlər və necə ki deyilmiş oldu* [ki] *Teymur köç göstərişi verdirib,* [bundan başqa Teymur] *qərargah və çadırlarını* [da] *hündür bir məkana aparmış idi ki, qəfildən xəbər gətirən bir uğurlu adamının dilindən ürəyinin qulağı ilə bu müjdəni eşitdi:*

*Qapalı görsən də çarənin qapısını ümidsizliyə qapanma, Bil ki, bəndə aça bilməyən qapını Allah istədiyi vaxt bilər aça.*

*Teymurun uzaqdan nəzərinə çatdı ki, qalanın darvazası yanında bir güruh bir-birinə hücum edib mübarizə edirlər; və öz yaxın* [adam]*ları və köməkçiləri üçün dedi ki, mən budur görürəm, o şeyi ki, siz də görə bilərsiniz, tələsin və kömək edin və döyüş yerinə yaxın olub məni* ***onun*** (davanın) *necəliyindən agah edin. Buna görə getdilər ki, yenə xəbər əldə etsinlər və o gizli məsələni aşkar etsinlər və Onlar şir ürəklilərdən (elə) bir güruh idilər ki, düşmənçilik* [hissi] *və kinlilik öz təbiətlərində* [bir-birlərinə qarşı] *baş qaldırmamış idi və hamısı birlikdə aşağı düşən kimi elə göründü ki,* ***şeytan sifətlər*** (monqoloid irqində olanlar, Teymurun əsas ordusu) *ilə atdanmağa və qalxmağa və uçmağa qalxmışlar, o dəstənin qabağında gələnlər Pirməhəmmədi ölmüş hesab etdi ki, elə öz odunun atəşində yanırdı və Bu* (–Pirməhəmməd) *Onları uzaqdan görən kimi təzə bir həyat tapdı və titrəməsini və qüvvəsizliyini bir tərəfə qoyub dirçəliş və qüvvə qazandı.*

*Xaçpərəstlər körpünü götürməkdə acizliyə düçar olan kimi ondan üz çevirdilər və istədilər ki qalaya daxil olalar və onun darvazasını möhkəm bağlayalar və bu niyyətlə bir də geri durdular, o zaman Pirməhəmməd onlara hücum etdi və qalaya*

*daxil oldu və Onları darvazanı bağlamaq* [imkanın]*dan məhrum etdirdi, Onu qılıncla möhkəm yaraladılar və daş-qalaq etdilər və O, əl çəkmədi və elə bu işin həlli üçün öz səy və çalışmasını artırdı və daş və dəmir ki Ona dəyir, agah olmurdu.*

*Ta o döyüşkən şiri-mərdlər yetişdilər və qəzəb yağışı və hiddət seli kimi göydən və yerdən kömək və yardıma rəvan oldular və qızışmış şirlər kimi Onların üzərinə şığıdılar və Pirməhəmmədi Onların caynaqlarından qurtardılar, o zaman xaçpərəstləri ayağı bağlı dustaqlar edib Onların mallarını talan etdilər və Onların arvad-uşaqlarını əsir götürdülər. Pirməhəmmədi Teymura çatdırdılar və* ***Onu*** (Teymuru) ***Bunun*** (Pirməhəmmədin) *niyyət və xəyalından agah etdirdilər, sonra Bunun qanı daman yaralarına diqqət yetirdilər – onların sayı on səkkizə çatırdı*[!], *Teymur Buna razılıq etdi və çoxlu vədlər verdi və Onu yüksək mərtəbəyə aid olan bir rütbəyə malik edib Təbrizə göndərdi və o diyarın başçılarına və fərmandehlərinə sifariş etdirdi ki, həkim və dərman düzəldənlər Bunun başına yığılsınlar və tam sağalmasına çalışsınlar və Onlar* ***Onun*** (Pirməhəmmədin) *müalicəsində çox çalışdılar və Teymurun fərmanını və (yenə) Onun sifarişini yaxşı həyata keçirdilər və bir çarə axtaranla bir çarə tapıb* [Pirməhəmmədin müalicəsini] *o dərəcədə bacardılar ki,* [tezliklə] *Onun xəstəliyini mükəmməl* [surətdə] *sağaltdılar, elə ki yaralar ondan daha yaxşı idi ki, dərman qəbul etdi və Teymurun yanına getdi, Teymur Onu qoşunlarının bir hissəsi üzərində sərkərdəliyə təyin etdi və ləşgərlərindən çoxlu güruhun fərmandehliyini Onun ixtiyarına verdi.*

### Gürcülərin işinin ardı və Onlar tərəfindən vasitəçiliyə Şeyx İbrahim hakim-e Şirvanın təhrik edilməsi

*Bu qala və mağara Gürcüstan qüllələri arasında iki göz kimi idi və o vaxt ki, dövlətin üzü görən nemətdən bəhrəsiz qalar, yəqin edilər ki, müsibətlilik və matəm həngaməsi yaxınlaşmışdır, öz güclərini əllərindən verərlər və həm də Onları birləşdirən*





*«ip» qırılar, çarə qılmaq əndişəsi yer üzərində «çöməldi» və qiyamət qalmaqalı «ayaq üstə» durdu, salamat (əmniyyət) və hə3mrəylik Onların diyarına əlvida dedi və cəhənnəm atəşi qəzəbli çöhrəsi ilə Onların pişvazına tələsdi, Teymur o bir uğur və fəthi yaxşı yozdu və Gürcüstan məmləkətlərinin «xilası» qəsdi ilə yüyəni boşaldıb öz şeytan sifətlər ordusunu hərəkətə gətirdi*[ ki], *Onların həyat xırmanını amansız atəşlə yandıra və Onların ölüm kəfənini qılınc qayçısı ilə biçə və ox iynəsi ilə tikə və intiqamın dili bu ayəni Onlara oxudu:*

أَلَمْ تَرَ أَنَّا أَرْسَلْنَا الشَّيَاطِينَ عَلَى الْكَافِرِينَ تَؤُزُّهُمْ أَزًّا (Görmədinmi Biz kafirlərin üzərinə onları yoldan çıxarıb günaha sövq edən şeytanları göndərdik?)[110]

*Gürcülər günah və təqsirlərinin əfv edilməsi üçün elə bir çarə qılan adam axtardılar ki, ondan əvvəl yırtılmış olan həyat libaslarını yenidən tikələr və ondan əvvəl qırılmış həyat zəncirini yenidən birləşdirələr, «fəryad-e əlaman» bayrağını qaldırdılar və Şeyx İbrahim hakim-e Şirvandan öz qurtuluşları üçün kömək istədilər, öz işlərinin yüyəni Onun tədbir əlinə tapşırdılar və O, gürcülərlə qeyri-məzhəbdə olsa da, Onu bir başçı seçdilər, bu zaman yay fəsli Gürcüstan adamları kimi meydanı tərk etmiş və payız fəsli Teymurun ləşkərləri kimi kölgəsini dünyaya salmış idi, «sultanlıq bayraqları» ağacların budaqlarından ən yuxarını bəzəmiş və dağlıq yerləri şərəfləndirmiş və axşamların nəsim küləyindən nəm götürən yer üzü «Davudi zireh» örtmüş və o şeylər ki, hərəkət edən və hərəkət etməyənlərdən cahanda vardır, Teymurun kömək və yardımına yetişmiş idi və mən demişəm:*

Xuda bir bəndyə şərait yaratsa,Olarlar düşmənlərinin yardımçıları.

Bu pozğunluqdan qurlulmaq istəsə o kəs,Davam gətirməlidir odda yanmağa.

Əgər bacarmasa itirər ağlın, Zar edər güllər tək yanı tikanlı.

*Şeyx İbrahim Teymurun dərgahına gəlib yeri öpdü və necə ki padşahları öyürlər, Onu* [eləcə] *tərif etdi və özü bəndələr duran yerdə dayanıb icazə istədi ki söz desin və onun cavabını eşit-*

*mək şərəfinə nail olsun. Teymur icazə verdi, onda O dedi: Padşahın mehribançılığı və Onun aciz fəqirin könlünü alması və Onun bol rəhmət və tükənməz lütfündən faydalanan mən bəndəni söz ərz etməyə təhrik etmiş ki, indi **Şərif rəy*** (Teymur) *qarşısında aşkardır və buna görə Allaha şükür ki arzu oxu məqsəd hədəfinə oturub və ürəyin ümidi muradın astanasına girmiş olubdur; bizim havadarın heybəti yer üzünün şərq və qərbini bürüyüb və Onu vuruş və çarpışmadan qorxusuz etmişdir, uğurlu ləşgəri nə qədər hesablaya bilsələr, onun sayı **ondan*** (hesab edilə biləndən) *daha çoxdur və sayda nə qədər saymaq mümkün olsa, **onların*** «uğurlu ləşgər»in *əlində əsir və dustaq **ondan*** (saymaq mümkün olan saydan) *daha artıqdır, xüsusilə tatar adamları ki xoşbəxtlik Onlardan üz döndərmiş və özləri yoxluq diyarında yer tapmışlar,* [Onlara] *qışın soyuğu bol ziyan yetirib və Onların nəfəsləri kəsilməkdədir və beləcə, Bu gedişatda çox keçsə, zəlil günə qalanlar və zəlillər məhv olar və **xırda böyüklər*** (orta təbəqəyə mənsub adamlar) *və **xırdalar*** (aşağı təbəqə, qara camaat) *ölüm yoluna yollanarlar, bu ölkənin işi bəlkə cahanın bütün ölkələrinin işlərindən ən çətinidir ki, Sənin üçün başqa nəticə verdi, bu ölkənin başçı və böyüklərinin hamısı bu bəndədə Padşahın inayətini görüb və qonşuluq səbəbindən mən bəndəni vasitəçiliyə seçmişlər və Şərif rəyin sədəqələrindən əziz bağışlanmaq*[a] *ümid edənlərdirlər ki, istədikləri ondan qeyri şey* [deyil], *hər hansı bir mübarək fikrə gəlsən və ali əmr buna işarə etsə bu bəndə və o camaat qəbul gözü ilə görməkdəyik və fərmana tabe olmaqdan qeyri yol seçmərik və əgər əsas məqsəd maldır*[sa], *gərək,* **bu bəndə** (– yəni mən) *onun təqdiminə duram. Bu evin oğlu üçün mal-dövlət hardadır ki, o evdə nəyə sahibdir ki? Nökər bu tərz iş görən deyildir; bəlkə bu baxımdan ki zəhmət və əziyyət iki tərəfdən bəhrə verdi və qonşuluq haqqı yerinə yetdi və Rəsul-e Əkrəm (S.) buyurdu ki, Cəbrayıl həmişə mənə qonşunun halının gözlənilməsini sifariş etməkdədir; budur böyük adamların şərif rəyi və əgər nökər* [də] *ümidsiz geri qayıtmaz*[sa] *süvabı daha çox olar.*





*Teymur Bunun xahişini qəbul edər və Onun və Onların mallarından ziyadə bol bir mal istəmiş olub; Şeyx İbrahim o istənilənləri **Onun*** (Teymurun) *xəzinəsinə göndərdi və özü köçər və **Onun*** (Teymurun) *qışlağının xalçasını Qarabağ içində sərər və bu*[nlar] *806( 1403)-cı ildə* [olmuş] *idi.»[111]*

Ankara döyüşündən geri dönən Əmir Teymurun 1403-cü ildə Gürcüstandan keçməsi, gürcü qalalarını tutması və orada törətdiyi dağıntılar Nizaməddin Şaminin və Şərafəddin Əli Yəzdinin eyniadlı əsərlərində – «Zəfərnamə»lərdə, geniş şərh olunsa da «Əcaibül-məqdur» dakı bu dair təfərrüat onlarda yoxdur. Düzdür, Ş. Ə. Yəzdi Əmir Teymurun Gürcüstana son hücumlarından bəhs edərkən, həqiqətən də lap axırda «mağaralıq»dan və «sandıq»lardan söhbət açır.[112] Amma o həmin hadisənin «Abxaz diyarı»nda[113] cərəyan etdiyini göstərir və bu barədə onun yazdıqları «Əcaibül-məqdur»dakılardan fərqli olaraq, ötəri və qarma-qarışıqdır. Heç şübhə etmirik ki, Ş. Ə. Yəzdi «Abxaz diyarı» deyərkən, ya sadəcə, səhvə yol vermiş, ya da ki Şəki ölkəsinin xristianlar yaşayan şimalını nəzərdə tutmuşdur. Amma hər halda, Teymurun «Abxaz diyarı»ndan geri dönməyə başlamasının bu müəllif tərəfindən göstərilmiş dəqiq tarixini, yəni oktyabrın 1-i, bazar ertəsi gününü,[114] Əmir Teymurun Şəki ölkəsindən geri dönmə tarixi hesab etmək və tarixi xronologiyaya tətbiq etmək mümkündür.

Ş.Ə.Yəzdi həmin gündən sonra Əmir Teymurun ovla məşğul olmasından və daha sonra isə bir müddət əvvəl əsir düşmüş bir qrup «gürcü sərdarı»nın Gürcü çarı Georginin yanına göndərməsinin nəticəsi kimi əks tərəfdən gəlmiş elçiləri qəbul etməsindən bəhs edir. Burada da sülhün baş tutmasında «gürcülərin aradüzəldəni olan» Şirvanşah Şeyx İbrahimin müsbət təsiri göstərilir, amma onun aradüzəltmə işi, Ərəbşahdakı kimi geniş şərh olunmur, sadəcə, Teymur dərgahında həmin məsələ müzakirə olunarkən «gürcü»lərin xeyirinə çıxış edir.[115]

O ki qaldı sözügedən 1403-cü il hadisələri barədə ibn Ərəbşahın yazdıqlarına, hansılar ki yuxarıda onların hamısının

tərcüməsi verilib, bu hekayətlər daha çox, bir adamın dilindən deyilən təəssürata, yaxud xatirəyə bənzəməkdədir. Diqqət yetirsək ki, «Əcaibül-məqdur»un müəllifi 1401-ci ildə ailəsi ilə birlikdə teymurilər tərəfindən əsir götürülmüsdür, bu halda, onun, Əmir Teymurun 1404-cü ildə Səmərqəndə qayıtmasına qədər Cağatay ordusunda saxlanıldığını, 1403-cü ildə həmin ordu ilə birlikdə Şəki ölkəsində olduğunu və orada baş verən bəzi hadisələri, hansılar ki sonralar «Əcaibül-məqdur»da qələmə almışdır, onları o vaxt, 14 yaşında ikən, şəxsən müşahidə etdiyini güman etmək olar.

Heç şübhə yoxdur ki, ibn Ərəbşahda adı çəkilən Gəl-Gör-Get qalası daha sonralar «Gələsən-Görəsən» adlananmışdır və xarabalığı da indiki Şəki şəhərindən bir neçə km. şimaldadır. Vətən tarixçiliyində ilk dəfə burada, indi bizim tərəfimizdən irəli sürülən bu fikir, heç də yalnız adların oxşarlığına əsaslanmır. Belə ki qalanın İbn Ərəbşah tərəfindən edilmiş təsviri də məhz, Gələsən-Görəsən qalasına uyğun gəlməkdədir. Amma «mağaralıq»ı Şəkiyə aid edə bilməyimiz üçün əlimizdə belə bir tutarlı dəlil, yaxud istinad edilməli elə bir şey yoxdur. Özü də bir az yuxarıda qeyd olunduğu kimi, Ş.Ə.Yəzdi oranın adını «Abxaz diyarı»nda vaqe olan hadisələr bəhsində çəkmişdir. Amma bunlara baxmayaraq, biz «mağaralığ»ı Gələsən-Görəsən qalasının yaxınlığında axtarmağa və 16-cı əsrin ortalarındakı «Sığnaq»la,[116] yaxud da indiki Marxal'la[117] eyniləşdirməyə üstünlük veririk.

*[1] Bax:* عبدالحسين نوائي، اسناد و مكاتبات تاريخي ايران از تيمور تا شاه اسماعيل، تهران-۱۳٤۱و ۱۳۵۶() *səh. 54 – 57*

*[2] Bax:* سيد على مويد ثابتي، اسناد ونامه ها ى تاريخي، تهران-۱۳٤٦

*Ə. Nəvayinin təshihi ilə müqayisədə elə bir əhəmiyyət daşımayan cüzi fərqlərə malikdir. Biz sözügedən məktubun yalnız Ə. Nəvayi redaktəsindən iqtibas gətirəcəyik.*

*[3] Seyid Əhməd 1399-cu ilin yanvar ayında hakimiyyətə başlayıb və Şəki hökmdarı kimi tarixi mənbələrdə onun adına axırıncı dəfə 1423/1424-cü il hadisələri ilə əlaqədar olaraq təsadüf edirik. Bəzən onun 1382 –1438-ci illərdə hakimiyyətdə olduğu göstərilir (Bax: Сведения о народах Кавказа (1404 г.)( Иоанн де Галонифонтибус), Баку –1979, qeyd: 139; yaxud: Путешествие по Европе, Азии и Африке (Иоганн Шильтбергер). Баку –1984, qeyd: 181), lakin əlbəttə ki bu səhvdir.*





*[4] Bu nəşrlə tanış ola bilməmişik.*

*[5] Bu nəşrlə tanış ola bilməmişik.*

*[6] U. Uvatov (1974), səh. 10, 11, 26*

*[7] Bax:* تاليف: ابن عربشاه، زندگانى شگفت آور تيمور(ترجمهء كتاب عجايب المقدور فى اخبار تيمور، ترجمه: محمد على نجاتى)، طهران –۱۲۳۹

*[8] [9] İoann de Qalonifontibus yazır: Burada hakimiyyət müsəlmanların əlindədir. Burada həm gürcülər (– oxu: pravoslavlar), saratsinlər (– oxu: müsəlmanlar), darginlər və ləzgilər yaşayır. Onların (– əslində, onların xristianlarının) məzhəbləri gürcülərlə eynidir, amma artıq qeyd edilənlərdən başqa, [həm də əlavə etməliyəm ki,] onlar özlərinin bir neçə xüsusi [dini] mərasimlərini də icra edirlər. Иоанн да Галонифонтибус, 25.*

*[10] İoann de Qalonifontibus sözünə belə davam edir: Amma ölkə bütünlüklə səhhət üçün yararlı deyil, bundan başqa əhali bağırsaqlarına qaz yığılmasından və sağlamlıqlarının zəifliyindən əziyyət çəkir, kənar yerdən gələnlər burada çox yaşaya bilmirlər. Əlbəttə, bunları ciddi qəbul etmək mümkün deyil!*

*[11] Gürcüstanla həmsərhəd olan Şəki ölkəsində də az-çox sayda gürcünün yaşaması təbii bir haldır. Lakin 4 cəhətə – hansılar ki aşağıda göstərirk, diqqət yetirsək belə bir nəticə çıxara bilərik ki, İ. D. Qalonifontibus «gürcü» deyərkən, həm də məxsusi dini mərasimləri olan provoslav məzhəbli albanları, yaxud provoslav məzhəbli oğuzları nəzərdə tuturmuş:*

*1. O vaxtlar bu «gürcü»ləri Şirvanşah Şeyx İbrahim »tatar» adlandırırdı (Bax: );*

*2. Qeyri-türklər tərəfindən oğuzların «tatar» adlandırılması faktına 2 dəfə «Kitabi Dədə Qorqud»da da təsadüf edirik: IV boyda «kafirlər» Qazan xan oğlu Uruz bəyə «tatar oğlu» (Kitabi Dədə Qorqud, səh. 80), X boyda isə «təkurun arvadı» Qazan*

*xanın özünə «tatar» deyir (Yenə orada, s. 144).*

*3. Necə ki İ.D.Qalonifontibus Şəki ölkəsi əhalisinin etnik tərkibini təsnif edərkən daha çox dini amilə üstünlük verir (məsələn, «.burada həm gürcülər, saratsinlər, müsəlmanlar. Yaşayır), Şəki əyaləti əhalisinin 1824-cü il siyahıya alınması aktlarında da belə edilmişdir (Məsələn, Vartaşen kəndində yaşayan pravoslav udinlər gürcü, qriqoryan udinlər isə erməni kimi qeydə alınıblar.*

*4. İ.D.Qalonifontibus bu Şəki ölkəsidə yaşayan gürcülər barəsində həm də bildirir ki «Onların məzhəbləri gürcülərlə eynidir, amma onlar özlərinin bir neçə xüsusi mərasimlərini də icra edirlər.*

*[12] Mənbədə: Saraceni.*

*[13] Yenə orda: Thurigi.*

*[14] Yenə orda: Lazi.*

*[15] Yenə orda: Laggi.*

*[16] Mənbədə: Lagzi*

*[17] İoann de Qalonifontibus daha sonra ləzgilər barədə əlavə edir: Bu ləzgilərin həyatı, gərək ki, mövcud olan qanunlarla nizamlanır. Onlardan bir qismi müsəlman, başqaları gürcü (– oxu: provoslav), bir qismi isə xristiandır ( – oxu: katolikdir). Onlar çox iti yeriyirlər və yaxşı ox atanlardırlar. Bax: Иоан де Галонифонтибус, səh. 151.*

*[18] ИОАНН ДЕ ГАЛОНИФОНТИБУС, 25*

*[19] Yeri gəlmişkən, buna xeyli oxşar olan bir xəritə isə «Azərbacan tarixi»ndə dərc olunub, hansı ki lap başlanğıcda bu barədə artıq yazmışıq:*

*[20] Zeynəddin bin Həmdullah Qəzvini (1990), səh. 48*

*[21] Ərməğanda: [Kürd].*

*[22] Ərməğanda yoxdur.*

*[23] Ərməğanda: [müxaliflik].*

*[24] səh. 54 – 55* (١٣٤١|١٣٥۶ اسناد و مکاتبات تاریخي ایران از تیمور تا شاه اسماعیل

*[25] Azərbaycan tarixçiliyində Şirvanşah Huşəngin ölümü*





*və Şeyx İbrahimin hakimiyyətə başlama vaxtı qəti olaraq 1382-ci il kimi qəbul edilib. Biz isə bunu o qədər də ciddi hesab etmirik. Belə ki Şirvanşah Huşəng 1382-ci ilin payızında hələ sağ idi. Bax: Zeynəddin bin Həmdullah Qəzvini (1990), səh. 46*

*[26] Əmir Teymurun vəsiyyətləri (1991), səh. 36*

*[27] 1482 –1483-cü illərdə Şirvan şəhərlərində Cəlair sultanı Qiyasəddin Əhmədin adından sikkə kəsilirdi (Bax: M. A. Сейфеддuнu (1981), 224). 1385-ci ildən ta h.1390-cı ilə qədər isə burada Qızıl Orda xanı Toxtamışdan qeyri, digər hökmdarın adından sikkə zərb edilməyib. Deməli, Şirvan 1385-ci ilə qədər Cəlairlərin, bundan sonra isə Qızıl Ordanın ərazisi imiş.*

*[28] F. Mestopskiyə görə, Teymurləng həmin vaxt Toxtamış xanla qarşılaşmaqdan çəkinmişdir. Bax: Foma Mestopski (1956), səh. 11.*

*[29] M. A. Сейфеддuнu (1981), 224*

*[30] Ərməğanda: [dəz-e Kuçik (–»kiçik qala», yaxud «kiçik miqdar»)] və bu səhvdir.*

*[31] Ərməğanda: [etdirmiş idik].*

*[32] Ərməğanda: [Onun vilayətləri və ölkə və məqamı müyəssər oldu]*

*[33] səh. 54 – 55* (١٣٤١|١٣٥۶ اسناد و مکاتبات تاریخي ایران از تیمور تا شاه اسماعیل

*[34] Bu yalnız Z. Bünyadovun türkcədən çevirməsində var. Bax: Nizaməddin Şami (1992), səh. 11–12*

*[35] Bu yalnız Z. Bünyadovun türkcədən çevirməsində var. Bax: Nizaməddin Şami (1992), səh. 11–12*

*[36] Bax, 23-cü qeydə.*

*[37] Bax, 23-cü qeydə.*

*[38] Fikrimizcə, bura müasir Azərbaycan Respublikasının Ağdaş rayonu ərazisinə uyğun gəlir.*

*[39] Bax, 23-cü qeydə.*

*[40] Bu toponimin farsca mənası «qırmızı su» deməkdir. Sorxab qalası 16-cı əsrin birinci yarısında Şirvanşahlara məx-*

*sus idi və onların öz əraziləri üzrə ən qərbdə, Qəbələ ilə Kür çayı arasında yerləşən müdafiə istehkamı idi. Arxeoloq F. V. Qədirov'a görə Sorxab, indiki Göyçay və Türyançay dərələri arasında, Ərəb Kükəl kəndindən şimalda, Surxayxan dağının zirvəsində olub və indi də xarabalığı həmin yerdə qalmaqdadır. Lakin tədqiqatçı etiraf edir ki, yerli əhali həmin qalanı Sorxab yox, ya Surxayxan, ya da Qaraçala adlandırır.( Bax: F. V. Qədirov (1984), səh. 79).*

*[41] Nizamuddin Şami (1956), səh. 57; necə ki F. Taur bu hissəni Zəfərnamə-nin müxtəlif əlyfzma nüsxələrinin, o cümlədən ondan köçürülmüş digər əsərlərin müvafiq mətninə əsasən «montaj» etmişdir, eləcə, biz də orada, sözlər arasında olan rabitəsizliyi aradan qaldırmaq üçün Z. Bünyadovun türkcədən çevirməsinə və Ş. Ə. Yəzdi Zəfərnaməsi'nin Daşkənd nəşrinə əsasən müəyyən əlavələr etdik.*

*[42] Mətndə: şəklində idi və cümlənin müvafiq hissəsini ən yaxşı halda belə tərcümə etmək mümkün idi: Elə ki ərəbləş (diril)miş (–üaxud: ərəbdən dönmüş) Şəki vilayəti hümayun məvkibin çadırları oldu,... Göründüyü kimi ifadə düzgün alınmır – necə ki, vilayət çadır ola bilməz! Lakin Zəfərnamə mətninin bir neçə yerində şablon ifadə: işlədildiyinə görə (Bax: Шарафуддин Али Яздий (1972) səh. 270a; 341b; 352a ). biz dəqiqləşdirə bildik ki, əslində burada da elə – (qurulan yer) yazılmalı idi, sadəcə, katib tərəfindən nöqtə və hərəkə xətalarına yol verilmişdir; və bundan başqa, həmin hekayəti Ş. Ə. Yəzdidən öz Rövzət üs-səfa'sına köçürmüş Mirxond da müvafiq yerdə eyni sözün sinonimi olan – نصب işlətmişdir (Bax: (١٢٧١) ،ميرخواند səh. 45).*

*[43] N. Şamidə: ta ləkziləri (ləzgilər yaşayan yerlərə qədərki əraziləri, yaxud ləzgilər yaşayan yerləri də) qarət etsinlər. Mümkündür ki, bu hadisə indiki Şəki şəhərindən bir qədər şimalda baş verib. Amma Şəkiyə hücum, payızın sonuna təsadüf etdiyindən Əmir Teymur ləzgilərlə Şəki düzlərində də qarşılaşa bilərdi. Belə ki, məhz, həmin mövsümdə, Dağıstanda yaşayan ləzgilərin bir qismi – əsasən Samur çayının orta hövzəsində*





*məskunlaşanlar, öz qoyun-quzularını Şəki düzlərinə endirirlər. Məsələn, 19-cu əsrin əvvəllərində tərtib olunmuş sənədə əsasən ləzgilər bu iş üçün həmin vaxt Şəki xanına müvafiq vergi də ödəyirlərmiş. (Bax: Камеральное описание жителей города Нухи и Шекинской провинции за 1824 год..., səh. 70) Hal-hazırda Şəki şəhərinin xeyli ləzgi sakini var və Şəki, Oğuz, Qəbələ rayonlaprında da ləzgi kəndləri mövcuddur. Amma Şəki şəhərində yaşayan ləzgilərin əksəriyyəti və Şəki rayonunun bəzi kəndlərində yaşayan bir çox ləzgilər son 30-35 il ərzində Rutul rayonunun (RF, Dağıstan MR) Xnauli (Xnov) kəndindən köçüb gələnlər, yaxud onların övladlarıdır. Şəki, Oğuz və Qəbələ rayonlarındakı ən köhnə ləzgi kəndlərində yaşayanlardan əksəriyyətinin əcdadlarını isə bura Şəki xanı Məhəmmədhəsən xan (fasilələrlə hakimiyyətdə olub: 1784 – 1804) Dağıstan, yaxud Quba xanlığı ərazisindən köçürmüşdür.*

*[44] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindədir. Daşkənd əlyazmasın-da:Məhəmməd Dərviş.*

*[45] Mətndə: şəklindədir. Fikrimizcə, bu Zaxur'a (Orta əsr gürcü mənbələrindəki Tsukuti'yə) – indiki Şəki şəhərindən bir qədər şimal-qərbdə, Samur çayının yuxarı hövzəsində yerləşən tarixi vilayətin adına uyğun gəlir. Mirxondda: (Zayif) (Bax: (١٢٧١) ،ميرخواند səh. 45).*

*[46] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindəndir. Daşkənd əlyazmasında: istila.*

*[47] Əlyazmada səhvən: ibn*

*[48] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindəndir. Daşkənd əlyazmasında yoxdur.*

*[49] Шарафуддин Али Яздий (1972) səh. 181b – 182a; Göründüyü kimi bu hadisələr barədə N. Şamiyə nisbətən Ş. Ə. Yəzdidən gətirdiyimiz iqtibas həcmcə xeyli çox olsa da, keyfiyyətcə, heç də o qədər üstün deyil.*

*[50] İran alimlərindən Ə. Nəvayi yazır ki, orlat –Bəlx ətrafında sakin olmuş Cağatay (–Çingiz xanın oğlu, 1227/1241-ci illlərdə cənub-şərqi monqol ulusunun xanı) xanədanından,*

*qədim Xorasan tayfalarından biridir. (Bax: Hasan Rümlu, AHSAN AL- TAVARİKH, Edited by: Dr. A. H. Navai, Téhéran – 1970, səh. 822*

*Ə. Nəvayi bu sözün digər mənası barədə isə F. Rəşidəddindən iqtibas gətirir: Orlat kəlməsinin mənası budur ki, bu şəxs ata-anasının qabağında nazənin idi (Bax: yenə həmin nəşr (F.Rəşidəddin, Tərcüme-ye bərname-ye elminsəki, səh.: 869) səh. 822). Hər halda, birinci versiya daha münasibdir. Belə ki tarixi mənbədə Seyid Əlinin oğlunun adı ilə də yanaşı Orlat kəlməsi işlədilmişdir ki (Bax: F.Sümer (1984), səh. ??? ), bu da həmin sözün nəsil, yaxud tayfa adı olduğuna dəlalət edir.*

*[51] Nizaməddin Şami (1992), səh. 11–12*

*[52] Əlyazmada səhvən: Təqlis.*

*[53] Əlyazmada səhvən yalnız: nozul (–düşmək).*

*[54] Ola bilsin, bura indiki Şəki şəhərindən 12-15 km. cənubdakı Daş-yüz deyilən ərazidir.*

*[55] Əlyazmada buraxılıb.*

*[56] Шарафуддин Али Яздий (1972) səh. 270a/b; Bu dəfə eyni hadisə barədə hər iki müəllifdən gətirdiyimiz iqtibas nə həcmcə və nə də məzmunca bir-birindən o qədər də fərqlənmir. Müqayisə etməyə dəyəsi yeganə şey isə budur ki, Ş. Ə. Yəzdidə olan el və vilayət-e Bərtaz, yaxud dağ və çöl Bərtaz ifadələrinə N. Şamidə təsadüf etmirik.*

*[57] səh. 348a/b* شرف الدين علىزدى (١٩٧٢)،

*[58] Путешественники об Азербайджане (1961) səh. 50.*

*[59] səh. 66* ابن عربشاه (١٢٣٩)،

*[60] M. A. Сейфеддини (1981) .*

*[61] Bu dəfə daha münasib hesab etdiyimizə görə, birinci N. Şamidən deyil, Ş. Ə. Yəzdidən iqtibas gətiririk.*

*[62] Əlyazmada səhvən: şah.*

*[63] 1824-cü ildə tərtib edilmiş siyahıyaalma sənədində Şəki əyalətinin şimal-şərqində ya-şayan provoslav məzhəbli udinlərin miliyyəti «gürcü», qriqoryan məzhəblilərinki isə «erməni» kimi göstərilib.13 O cümlədən, həmin sənəddə Sultan-*





*Nuxa kəndinin (–Qutqaşın mahalı) nə udin, nə erməni və nə də gürcü dilini bilməyən və yalnız türkcə (–oxu: azərbaycanca!) danışan qriqoryan məzhəbli sakinlərinin milliyyəti də «erməni» kimi göstərilir.13. 4 Ona və digər şeylə-rə (–hansılar ki, biz hələ bir qədər sonra bəhs edəcəyik) görə belə bir mülahizə də irəli sürmək mümkündür ki, yuxarıda «gürcü» adlananların bir qismi və ya hamısı bəlkə də gürcü yox, əs-lində, o vaxtlar Şəki ölkəsinin şimalında yaşamış provoslav məzhəbli xristianlar idi.*

*[64] Əlyazmada yalnız: şüşə*

*[65] Əlyazmada səhvən yalnız: sultan.*

*[66] Əlyazmada: dirənib.*

*[67] Əlyazmada buraxılıb.*

*[68] Cümlənin bu hissəsi bizim tərəfimizdən, İbn Ərəbşaha istinadən (Bax: səh.66(* ابن عربشاه (١٢٣٩)، *) əlavə edilib. Məqsədimiz hadisəni bir qədər də canlandırmaq, mətni informasiya cəhətdən daha da zənginləşdirməkdir.*

*[69] Əlyazmada səhvən: gəldi.*

*[70] Əlyazmada: Bu şir (Kəlilə və Dimnə-dən?), yaxud Əsəd adlı hansıa şəxs haqqında olan ərəbcə ibarədir.*

*[71] 348b – 349b.* شرف الدين على يزدى (١٩٧٢)،

*[72] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindəndir. Daşkənd əlyazmasında yoxdur.*

*[73] səh. 356a.* شرف الدين علىزدى، (١٩٧٢)،

*[74] ƏMİR TEYMURUN VƏSİYYƏTLƏRİ (1991), səh. 73*

*[75] Fikrimizcə, o, bu miqdardan az döyüşçü ilə «Hülaku xan ulusu»nu əldə saxlaya bilməzdi və həmin miqdardan artığa isə ehtiyacı yox idi.*

*[76] Парсадан Горгиджанидзе (1990), səh. 43.*

*[77] ƏMİR TEYMURUN VƏSİYYƏTLƏRİ (1991), səh. 100*

*[78] ƏMİR TEYMURUN VƏSİYYƏTLƏRİ (1991), səh. 103.*

*[79] Mətndə: ərgin; Bizim tərəfimizdən redaktə edilmiş variant isə Rövzətüs-səfa mətninin müvafiq bəhsinə əsasəndir. Orada: Gorgin (–Georgi) hakim-e Gürcüstan (Bax: səh. 98* میرخواند (١٢٧١)، *)*

*[80] Nəşrdə çex dilində qeyd edilib: Ajouté par celui qui collationna le manuscrip Z.Voir p. XVIII*

*[81] Bax əvvəlki qeydə.*

*[82] Bax əvvəlki qeydə.*

*[83] Necə ola bilər ki, teymurilər uzaqdan atdıqları oxla öldürdukləri Seyid Əlinin başını rahatca kəsə və hələ üstəlik, Təbrizə də apara bilərdilər? Axı onlar özləri acınacaqlı məğlubiyyətə uğramış, qaçmağa üz qoyaraq döyüş meydanından canlarını zorla qurtarmışlar! Yəqin ki N. Şami Əmir Teymurun qəzəbindən qorxaraq teymurilərin məğlubiyyətini ört-basdır etmək üçün belə yazmağa məcbur idi və həmin səbəbdəndir ki, buradakılar Ş. Ə. Yəzdinin Zəfərnamə'sində öz əksini tapmamışdır.*

*[84] NIZAMUDDİN ŞAMİ (1956), səh. 148. Göründüyü kimi, Ş. Ə. Yəzdiyə nisbətən, N. Şaminin müvafiq bəhsi, həcm və təfsilatca bir qədər kəm olsa da bəzi təfərrüat yalnız burada var. Məsələn, Sultan Tahirin Alıncaq qalasına təyin etdiyi şəxslərdən birinin adı (və milliyyəti); Seyid Əli Orlatın dağın bir zirvəsindən, minik heyvanının belindən yıxılaraq həlak olması və başının isə kəsilərək Təbrizə aparılması; nəhayət, məlum hadisə haqda Əmir Teymura məlumat verilməsi üçün bir nökərin Səmərqəndə (– əslində Hindistana) göndərilməsi.*

*[85] Bunlar həm də Ş. Ə. Yəzinin Zəfərnamə'sində təkrarlanır.*

*[86] Гийасаддин Али (1958), səh. 186; səh. 340a/b.* شرف الدين على يزدى (١٩٧٢)،

*[87] ƏMİR TEYMURUN VƏSİYYƏTLƏRİ (1991), səh.95.*

*[88] ƏMİR TEYMURUN VƏSİYYƏTLƏRİ (1991), səh. 42*

*[89] Bəzi tədqiqatçılara görə Seyid Əhməd şirvanşahlar xanədanandandır, hakimiyyət dövrü isə 1382–1438-ci iləri əhatə edir.23 Hər halda, aydındır ki, birinci tarix səhih deyil, belə ki Se-yid Əhməd 1399-cu ildə hakimiyyətə gəlmişdir.*

*[90] Əmir Teymurun ordusunda həqiqətən də Ömər Taban adlı əmir olub, lakin həmin iki sözü başqa variantda oxuyaraq şanlı əmr, yəni şanlı fərmanlar kimi də tərcümə etmək mümkündür.*





*[91] Əlyazmada: Süleyman.*

*[92] səh. 352a/b.* شرف الدين على يزدى (١٩٧٢)،

*[93] Ola bilsin ki, Şirvanşah Şeyx İbrahim həmin şeyləri, əslində, Şəki hökmdarı Seydi Əhmədin «əfv olunması»nın əvəzində təqdim edib. Belə ki daha sonra görəcəyik ki, o, Şəki ölkəsinin bir hissəsində yaşayan sakinlərin də «bağışlanması» üçün Əmir Teymura çox böyük miqdarda mal-dövlət vermişdir və bu hərəkətini onunla əsaslandırmışdır ki, qonşuları çox kasıb yaşadıqlarından özləri heç nə verə bilməzdilər. Sözsüz ki, o dövrlərdə dünyanın ən mühüm ticarət yollarının Şirvandan keçməsi, orada neft mədənlərinin olması və s. şeylər şirvanşahlara külli miqdarda qazanc gətirməkdə idi və onlar bu xüsusda bəxti gətirməmiş Şəki hökmdarlarından qat-qat varlı olmaqla, istənilən vaxt həmin qonşularının da əvəzinə mal-dövlət sərf edə bilərdilər.*

*[94] NIZAMUDDİN ŞAMİ (1956), səh. 153 – 154.*

*[95] Mərhum akademik Ziya Bünyadovun türk dilindən (əsəri bu dilə farscadan Necati Lüğon tərcümə etmişdir) çevirməsidə xeyli konkretləşdirmə var: Bundan əvvəl Şəki vilayətinin haki-mi olan Seyyid Əlini öldürdükdən sonra, oğlu qiyam edərək atasının yerinə keçmişdi. O, Əmir Teymurun gəldiyini eşidib qorxdu və Şirvan məliyi Şeyx İbrahimi vasitəçiliyə sövq edib, Əmirin yanına gəlir, itaətini ərz edir və yeri öpmək şərəfinə nail oldu, qüsurlarından dolayı əhv və mərhəmət dilədi. Əmir Teymur onu əzizləyəb təltif etdi, sonra da atasının mənsəb və məqamını özünə verdi. Nizaməddin Şami (1992), səh.18.*

*[96] səh. 352b ; Bax: qeyd 81.* شرف الدين على يزدى (١٩٧٢)،

*[97] Kvadrat mötərizə içindəki hissə Tehran nəşrindədir. Daşkənd əlyazmasında yoxdur.*

*[98] Bax: əvvəki qeydə.*

*[99] Bax: qeyd 85-ə.*

*[100] Əlyazmada: Tənşəkidən. Mirxondda: Şəkidən* ميرخواند، (١٢٧١) *səh. 101).*

*[101] Mətndə: kəbran, yəni «ataşpərəstlərin».*

*[102]*

*[103] səh. 354b – 355b.* شرف الدين على يزدى (۱۹۷۲)،

*[104] 15-ci əsrin birinci yarısında cərəyan etmiş hadisələr barədə rəvəyətdə Kiş çayının əvvəllər «Aq su» adlanmasına işarə edilir...(Bax: Кярим аъа Фатещ (1993), səh.10 ) Bu çay hal-hazırda Əyri çay hövzəsinə daxildir. Lakin 17-ci əsr mənbəsinə görə o vaxtlar Kiş( kəndin)ə qədər şimaldan cənuba, sonra şərqdən qərbə doğru axır... böyük Alazana tökülür'müş (Bax: Царевичъ Вахушти (1904), səh.115) Deməli, daha əvvəllər indiki Əyri çayın hövzəsi şərqdə Kiş dərəsi ilə məhdudlaşırmış və həmin çay buradan başladığına görə, Alazana qovuşana qədər Kiş adlanırmış. Lakin heç də həmişə belə olmamışdır. Məsələn, 20-ci əsrin əvvəllərində Nuxa şəhərinin ətrafından yığılan sular toplanıb Əyri çay səmtindən Dəhnələr dərəsini keçib Turuta keçmişdir...(1925) səh. 17-ci əsrdə yaşamış məşhur türk səyyahı Övliya Çələbi öz Səyahətnaməsində 1647-ci ildə Şəki qalasında da olduğunu, oradan isə şərqə doğru səyahət edərkən əvvəlcə, bu qalanın canib-e şərqində, bir mərhələ yerdə Zəngi (–Danqi? Qarasu?) nəhrinə tökülən Qnut (–Küngüt?) çayını keçdik'lərini buradan da şimala doğru gedərkən Qabur nəhrini Özdəmir oğlu Osman Paşa körpüsündən keçdik'lərini və Qoyun keçidi nam məhələ vardıq'larını və həmin keçiddən keçib şimala, geniş səhralar içindən gedərək Aq su nəhrini də übur (–keçmək) etdik'lərini bu ardıcıllıqla göstərdikdən sonra sonuncu çay, yəni Aq su nəhri barədə orada əlavə edir ki, bu nəhrə əcəmlər (– burada: yerli əhali) Gilan çayı deyilər; Ərəş dağlarından gəlib (oxu: keçib) Kür çayına mülaqi (– birləşən) olur (Bax: səh. 289-90)Ərəş dağlarından keçib Kür çayına tökülən isə yalnız bir çay – indi «Əlican» adlanan çay olmalıdır; belə ki o yaxınlarda həmin xüsusiyyətdə digər bir çay yoxdur və deməli, indiki Əlican çay vaxtilə Ağ su adlanıbmış! Yeri gəlmişkən, bu çaya 20-ci əsrin əvvəllərində Alciyan deyirdilərsə, o, 15-ci əsrin ortalarında Əlcikən adlanmışdı (Bax: Bədr Şirvani ( ) səh. ). Bu noqteyi nəzərdən ehtimal etmək olar ki, Şəki rayonundakı Köndələn dağ silsiləsinin qarşısındakı Elçı yolu, yəqin Əlican – Alciyan, Əlcikən çayının köhnə məcrasıdır (Rəşid bəy Əfəndiyev yazır: Köndələn dağ silsilələrinin arxası boyu əsgi zamanədə Elçi yolu namında bir şəhrəh var imiş ki, buna Elçi yolu deyərlər. Qəbələ mahalına və Daş-yüz səhrasına keçmək üçün Elçi yolunun böyük sətratəsi əhəmiyyətləri var... (1925) səh. 4) Beləliklə, naticə hasil etmək mümkündür ki, necə ki indiki Əyri çay daha əvvəl Kiş dərəsindən başlamış və Kiş adlanmışdır, eləcə, indiki Əlican çay da bir vaxtlar Kiş dərəsindən başlamış və Ağ su, yəni Kiş çayının başqa adı ilə tanınmışdır!*





*[105] ПАРСАДАН ГОРГИДЖАНИДЗЕ ИСТОРИЯ ГРУЗИИ (1990), səh. 42*

*[106] Əmir Teymur 28 iyul 1402 tarixdə vaqe olmuş məşhur Ankara döyüşündən geri dönürdü.*

*[107] Düz mötərizə içindəki ifadə əvəzinə mətndə: bu ayələr*

*[108] Surə: 16 (سورة النحل); ayə: 79.*

*[109] Buradakı «Gürcüstan adamları» ifadəsi (yaxud «gürcü» sözü) etnik məna daşıya bilməz. Belə ki iqtibas gətirilən mətnin sonunda – Şeyx İbrahimin dilindən deyilən sözlərə diqqət yetirsək görərik ki, orada söhbət aslində «tatarlar»dan gedirmiş. Yəqin ki gürcülərlə eyni məzhəbdə olduqlarına görə onlar «Gürcüstan adamı» (yaxud «gürcü» ) kimi təqdim edilmişlər. Şəki ölkəsi əhalisinin «tatar» adlandırılmasına gəlincə isə, fikrimizcə burada qeyri-adi bir şey yoxdur. Axı, o vaxt şəkililər türk hesab edilə bilməzdilər. Çünki türklər əslində teymurilər özləri idilər. Onların türkmən adlandırılmaları da mümkünsüz idi. Belə ki türkmənlər köçəri həyat sürürdülər. Yeri gəlmişkən, qeyri-türklər tərəfindən oğuzların «tatar» adlandırılması fakına 2 dəfə «Kitabi Dədə Qorqud»da da təsadüf edirik: IV boyda «kafirlər» Qazan xan oğlu Uruz bəyə «tatar oğlu» (Kitabi Dədə Qorqud, səh. 80), X boyda isə «təkurun arvadı» Qazan xanın özünə «tatar» deyir (Yenə orada, s. 144).*

*[110] Surə 19 (سورة مريم); ayə 8.*

*[111] səh. 204-212* ابن عربشاه (۱۲۳۹)،

*[112] səh.* ،(١٩٧٢) شرف الدين على يزدى

*[113] Orta əsr farsdilli mənbələrində Abxaz diyarı məfhumu, indiki Abxaziya ərazisinə yox, əsasən Kaxetiyanın şimalına (– Mərkəzi Gürcüstan) şamil edilmişdir.*

*[114] səh. 440 b* ،(١٩٧٢) شرف الدين على يزدى

*[115] (1972) səh.* ،(١٩٧٢) شرف الدين على يزدى

*[116] 1551-ci ildə Şah Təhmasib Şəkiyə hücum edərndə, yerli əhalinin bir qismi, məhz, Sığnağ'a sığınmışdı (Bax: səh.* ، (1931) حسن روملو*). Az. MEA Tarix İnstitunun Şəki filialının baş elmi işçisi N. Muxtarovun şəhadətinə görə Sıgnaq Gələsən-Görəsən qalasından bir neçə km. şimaldadır və həmin yer indi də «Sığnaq» adlanmaqdadır. Yeri gəlmişkən, həmin məsələdə Gələsən-Görəsən qalasının yaxınlığındakı məşhur bir yerin – Marxalın, adına da diqqət yetirməyə dəyər. Nəsə, bu toponim bizə «mağaralıq» sözünü xatırlatmaqdadır və hesab edirik ki Marxal elə, məhz, mağaralığ'ın təhrif olunmuş forması ola bilər.*

*[117] Marxal, Şəki şəhərindən şimalda, Kiş kəndinin qarşısında, Gələsən-Görəsən qalasının isə cənub-şərqindədir və hal-hazırda ora istirahət obyektidir.*

01.03.2009

## 10.4. ŞƏKİLİLƏR OSMANLI SARAYINDA VƏ TÜRKİYƏ ORDUSUNDA

***Ədalət Tahirzadə***

### YAZARDAN BİR-İKİ SÖZ

Bu yazıda mən Azərbaycanın Şəki şəhərindən Osmanlı torpaqlarına gedərək «Yıldız» sarayında özünə yüksək mövqe qazanmış qürənə Məhəmmədəmin Dargazadə, onun kiçik qardaşı, general-mayor Həsən Behcət paşa və çar zülmündən qurtularaq ailəsiylə birlikdə Bursanı özünə ikinci vətən seçmiş ipək taciri Hacı İlyas Sarıkərimli'nin general oğulları Məhəmməd (Məhəmmədnuru/ Mehmet Nuri Bərköz) və Mahmud (Mahmud Bər-





köz) paşalar haqqında söz açacağam.

Öncə bildirim ki, adı dünyadakı 78 tarixi şəhər siyahısında bulunan Şəki Azərbaycanın, tarixi 2.500 ili aşan ən əski şəhərlərindən, ən önəmli mədəniyyət, sənaye və ticarət mərkəzlərindəndir. Şəkililər hər zaman azad yaşamağı sevmiş, onlara ağalıq etmək istəyən ərəblərlə də, Əmir Teymurla da, Səfəvilərlə də, Nadir şahla da, çar ordusuyla da, kommunist rejimiylə də qanlı savaşlara girmiş, özgürlüklərini hər zaman hər şeydən üstün tutmuşlar. Bu gün Şəki, ərazisi 2.432,8 kv. km, əhalisi 165,9 min kişi olan (2006) rayonun mərkəzidir.

Mövzuya keçməzdən qabaq iki önəmli məsələyə toxunmağı gərəkli sayıram.

Birincisi, bu kişilərin yaşamını əks etdirən bəlgələrin çoxunda onların Dağıstan'ın Şəki, yaxud Nuxa/Noxu şəhərində doğulduğu yazılır. Bu sözlər isə Türkiyə oxucusunu çaşdırır. Burada da iki mövzuda anlaşılmazlıq mövcuddur. Bilməliyik ki, çar dönəmində «Azərbaycan» adlı bir dövlət, ölkə yoxdu – bütün imperatorluq «Rusiya» adı daşıyırdı. Ancaq Şəki dağlıq bir bölgədə yerləşdiyinə görə oralılar özünü Osmanlıda «Dağıstanlı» kimi tanıtmışlar, halbuki Dağıstanla Azərbaycan arasında keçilməz Qafqaz dağları vardır və bugünün özündə də Şəkidən Dağıstana keçmək mümkün deyildir. Başqa bir mövzu da Şəki-Nuxa/Noxu adı ilə bağlıdır. Rusiya Quzey Azərbaycan torpaqlarını işğal etdikdən az sonra Şəki xanlığını ləğv etdi və onun bir neçə min illik şərəfli adını da yaddaşlardan silmək üçün dəyişdirərək Nuxa/Noxu etdi (1840)[1], Sovet dönəmində də bu ad təqribən 50 il yaşadıldı və «Şəki» adı yalnız 1968-ci ildə (!) yenidən qaytarıldı.

İkincisi, doğrudur, bu kişilərin hər biri haqqında Azərbaycanda və Türkiyədə az-çox yazılıb, onların yaşamı topluma tanıdılıb. Ancaq mən öncəki qaynaqlardan da yararlanmaqla yeni bilgi və bəlgələri ortaya qoymağa cəhd etdim.

Məni adı keçən kişilər haqqında araşdırmalar aparmağa ruhlandırmış Azərbaycan Milli Elmlər Akademiyası (AMEA)

Şəki Regional Elmi Mərkəzinin direktoru Prof. Dr. Zəkəriyyə Əlizadə'yə, bu məqaləni yazmağa məni təşviq etmiş dəyərli dostum Ömər Özcan'a, mövzu ilə bağlı qaynaqları taparaq Türkiyədən mənə yollamış dəyərli jurnalist dostum Mina Tansel'ə, bir çox yeni bilgi, bəlgə və fotoları lütfkarlıqla mənə göndərmiş olan korgeneral (general-polkovnik) Məhəmmədnuru Bərköz paşa'nın oğlu Prof. Dr. Sina Bərköz'ə minnətdarlıq bildirməyi özümə vicdan borcu sayıram.

## QÜRƏNA MƏHƏMMƏDƏMİN HACI ƏBDÜRRƏHİM ƏFƏNDİ OĞLU DARĞAZADƏ (h.1271/m.1854, Şəki-25 sentyabr 1925, İstanbul)

Məhəmmədəmin bəyin həyatını incəliklə araşdırmış üç önəmli qaynaq mövcuddur. Prof. Dr. Əli Birinci'nin «Asyayi-Vüstə səyyahı qürəna Məhəmmədəmin bəyin hekayəsi» adlı məqaləsi M.Darğazadənin həyatını arxiv bəlgələrinə dayalı incələyən indiyədək yazılmış ən ciddi elmi tərcümeyi-haldır. Yazar Osmanlı dönəminin mövzu ilə bağlı bütün arxiv materiallarını gözdən keçirib və Məhəmmədəmin bəyin ailəsi, doğumu, evliliyi və ölümü, təhsil və iş həyatı, şəxsiyyəti, əsərləri haqqında ilk dəfə ətraflı bilgi verib.

M.Darğazadənin «Səyahətnamə»sini 2007-ci ildə mükəmməl bir biçimdə yayınlatmış olan nəvəsi Prof. Dr. Mühibbə Darğa'nın kitaba yazdığı «Babam mabeynçi Darğazadə Məhəmmədəmin bəy (Sultan II Əbdulhəmidin qarinlərindən)» adlı ön sözdə də bəlgələrə düşməyən bir çox dəyərli bilgilər verilib. Ayrıca M.Darğazadənin qızı Xeyriyyə Kərimzadə'nin, adı keçən kitabın baş tərəfində yer alan»Məhəmmədəmin bəyin həyatı» başlıqlı tərcümeyi-halı da ailə arxivi bəlgələrinə və Məhəmmədəmin bəyin ailə üzvlərinin güvənilən xatirələrinə dayanaraq qələmə alındığı üçün olduqca önəmlidir.

Mövzuya keçməzdən öncə M.Darğazadə ilə bağlı iki düşüncə üzərində durmaq istəyirəm.





Birincisi, nəticəsi Murat Darğa'nın özkeçmişini əks etdirən bir saytda bunlar yazılıb: «Murad Darğanın ata tərəfi əslən Qaraqalpaq türklərindən olub, Özbəkistanın Xivə xanlığında darğa ikən köç edərək Azərbaycan Dağıstan Şəkiyə yerləşmiş, sonra da İstanbula gəlmişlər»[2]. Düzdür, qızı Xeyriyyə xanım və nəvəsi Mühibbə xanım bununla bağlı bir söz deməmişlərsə də özü «Səyahətnamə»də Xivə xanı Məhəmmədrəhim xan'la görüşü təsvir edərkən belə yazır: «Bəndəniz zatən o tərəflər əhalisindən bir adamın oğlu olub oralarca pədərimin şöhrəti məni dəxi hüsni-surətlə tövsiyə etdirmiş olduğu kimi.». Yaxud «.Çağatay lisanını isə Xivəlilər qədər gözəl söyləməkdə bulunmuş olduğumdan yerlidən heç bir fərq olunmazdım».

İkincisi Məhəmmədəmin bəyin Sultan II Əbdülhəmid xan'ın Başmabeynçisi olması və Əbdülhəmid xan tərəfindən ona paşalıq verilməsi haqqında iddiadır. Azərbaycan oxucusu üçün xatırladım ki, Osmanlı sarayında mabeynçi padşahı qoruyan, xalqla Babi-Ali (hökumət, sədrəzəmlik) arasında əlaqə yaradan, padşahın dışarı ilə işlərinə baxan və diləkləri onun özünə çatdıran, saraya gələn ziyarətçilərin ziyarətlərini düzənləyən, saray protokolunu gerçəkləşdirən saray məmurudur. (Mabeynçi əvəzinə, «yaxın» anlamındakı «qürənə» sözü də işlədilib). Əbdülhəmid xan dönəmində dövlətin idarəsi Babi-Alidən çox, saraydan yürüdüldüyü üçün Mabeyn dairəsi 1876-1908-ci illər arasında dövlətin ən güclü qurumuydu. Mabeyn dairəsi genişləndikcə mabeynçilərin sayı da artıb. Mabeynçilərin ən yüksək yönəticisinə Başmabeynçi (Sər-qürənə) deyilir, onun yardımçısı isə İkinci mabeynçi adlanırdı.

Osmanlının bütün Başmabeynçilərini müəyyənləşdirmiş Prof. Dr. Yılmaz Öztuna'nın, doğruluğu şübhə doğurmayan siyahısında Başmabeynçi Əmin əfəndi var, ancaq onun Başmabeynçiliyi 1844-1846-cı illərdə olub. Həmin siyahıda bala rütbəli Məhəmmədəmin bəyin adı isə Başmabeynçi Hacı Əli paşa'nın dönəmində (1894-1908) yalnızca mabeynçi olaraq keçir. Tarixlərdən də göründüyü kimi, bu iki Əmin bəyi heç cür qarış-

dırmaq olmaz.

Paşalıq məsələsinə gəlincə, Prof. Dr. Əli Birinci'nin incələdiyi sicillərdə də Əmin bəyin son rütbəsi «bala» olaraq göstərilib. Prof. Dr. Yılmaz Öztuna yazır: «Bala, vəzir'dən bir pillə aşağı mülki rütbədir. Birinci fəriq isə bugünkü orgeneral'dır. Bu iki rütbə mülki və hərbi rütbələr olaraq bir-birinə təndir. Bu rütbə sahibləri də Avropa protokolunda ekselans'dır, klassik dönəmdə olsun bu pillənin Avropanın markiz (fr. marquis) soyluluq dərəcəsinə qarşılıq olduğu söylənə bilir. Birinci fəriq daim «paşa»dır. «Bala» isə mənşəyindəki ünvana görə ya əfəndi, ya bəy'dir. Balalara əsla paşa deyilməz».

***

Ömrünün 30 ildən çoxunu Osmanlı imperatorluğuna xidmətdə keçirmiş Məhəmmədəmin bəy Darğazadə hicri tarixlə 1271-ci (miladi 1854) ildə Azərbaycanın Şəki şəhərində Hacı Əbdürrəhim əfəndi Darğa Əhməd oğlu ilə Dostu xanım'ın ailəsində dünyaya göz açıb. İlkin adı «Məhəmmədəli» olub, Osmanlı sarayında xidmətə başlarkən ona «Məhəmmədəmin bəy» deyilib (bu ad bir çox qaynaqlarda «Əmin bəy» kimi də işlədilib). Soyadı babası Darğa Əhməd'in adından götürülüb. Məhəmmədəmin əfəndinin «Səyahətnaməsi»nin «Üsuli-hökumət» bölümündə «darğa» sözünün Xivə'də «xanın lətifəçisi» anlamında işlədildiyi göstərilsə də monqol köklü bu rütbə Azərbaycan türkçəsində «şəhər, qəza, mahal, ya vilayət hakimi» anlamı da verməkdədir.

Babası – zamanının böyük ipək, barama tacirlərindən olan Hacı Əbdürrəhim əfəndi Hindistan, İtaliya (Milan) və Fransa (Marsel) arasında ticari ilişgilər qurubmuş. O, «məhəlli ibtidai məktəbdə müqəddəmati-ülum etmiş» olan 9 yaşlı oğlu Məhəmmədəlini də 1863-cü ildə yanına alıb Marselə aparıb, onu orada əmisi oglu Səlim əfəndi'yə, Madam Andree'yə və Fransız Liseyi müdirinə əmanət edərək Şəkiyə dönüb. Yalnız 6 ildən sonra Fransaya qayıdan atası bu qədər müddət ailəsindən xəbərsiz





yaşamış 15 yaşlı Məhəmmədəlini yanına alaraq Dərsəadət'ə (İstanbul'a) gəlib və oğlunu dərslərin fransızca verildiyi Məktəbi-Sultaniyyə'yə verib. 2 il oxuduqdan sonra bir haqsızlıq üzündən bu məktəbdən ayrılan Məhəmmədəli 1871-də Hüquqi-Şahanə Məktəbi'ndə oxumağa başlayıb. O, ikinci sinifdəykən xəstələnib. Həkimlər səyahətə çıxmasını tövsiyə ediblər. 1877-nin aprelində o, İstanbuldan yola çıxaraq Poti'yə, oradan Tiflis və Gəncə'dən keçərək doğma yurdu Şəki'yə gedib. O sıralarda babası Hindistandaymış. Xəstəliyi burada da müalicə edilə bilmədiyi üçün həm Hindistandakı babasını axtarmaq, həm də uzunmüddətli səyahətdə bulunmaq məqsədiylə Şəkidəki ailəsindən ayrılaraq «böyük mərasimlə gedib», Bakı'ya gəlib və oradan Xəzər dənizi üzərindən keçərək Orta Asiya (Türküstan/Asiyayi-Vüstə) gəzintisinə çıxıb. Xivə, Daşkənd, Xocənd, Kaşğar, Əfqanıstan və Hindistan'ı gəzib, sonra yenidən İstanbula dönərək Hüquqi-Şahanə Məktəbində oxumağa davam edib.

Hüquq tələbəsi ikən Əhməd Midhət əfəndi'nin təşviqi ilə «Asiyayi-Vüstə'yə Səyahət» onun «Tərcümani-həqiqət» qəzetində hissə-hissə verilib. Səyahətnamə kitab şəklində basıldıqdan sonra Sultan II Əbdülhəmid'in diqqətini çəkib. Sultan onunla görüşərək söhbətləşib və «Yıldız» sarayı kitabxanasına məmur olaraq görəvləndirib (2 mart 1880). Əli Birinci'nin bildirdiyi kimi, «6 sentyabr 1882-də Sultanın ən yaxın və inandığı çevrəsinə, yəni qürənə arasına daxil edilən Məhəmmədəmin bəy tam iyirmi yeddi il Sultan Əbdülhəmidin yanında çətin və həssas şərtlərdə bu vəzifəsini ifaya müvəffəq oldu». Məhəmmədəmin bəyin ən son vəzifəsi 14 avqust 1908-də qarineyi-sani şəhriyari məqamı oldu. İttihadçılar Əbdülhəmidi taxtdan endirdikdən sonra 27 aprel 1909-dan «təbəddüli-səltənət həsabiylə» (hakimiyyət dəyişikliyi üzündən) açıqda qalıb, görəvi bitib. Sultanın ətrafında bulunmuş yüksək mövqe tutan bir çoxları ağır cəzalandırılsa da namusluluğu və düzgünlüyü ilə tanınmış, siyasi intriqalardan daim uzaq qaçmış Məhəmmədəmin bəyə kimsə toxunmadı və o, təqaüdə çıxdı. 11 il sonra, «yaxından tanıdığı və etimad etdiyi

anlaşılan» Sultan Vəhidəddin onu «Xəzineyi-xasseyi-şahanə»nin ümumi müdirliyinə və eyni zamanda onun idarə heyətinin sədrliyinə təyin etdi (17 aprel 1920-25 fevral 1922).

***

Məhəmmədəmin bəy sarayda bulunduğu müddətcə də Azərbaycanla əlaqəsini kəsməyib. Azərbaycanın, o sıradan Şəkinin tanınmış kişiləri onun yanına gələrək yardımlarından faydalanıblar. Məsələn, məşhur Şəki şairi İsmayıl bəy Nakam (1841-1906) Sultan Əbdülhəmid dönəmində bir müddət İstanbulda bulunub. Məhəmmədəmin bəy İstanbulda onun şeirlər divanını nəşr etdirmək istəyib, əsəri senzor baxışından da keçirdib və kitabın basılmasına Sultandan icazə alıb. Ancaq Tahir adlı senzorun müqəddimə bölümünü və bəzi şeir parçalarını çıxarması üzündən Nakam əsərin basılmasını istəməyib. Sonralar divanın əlyazma mətni məşhur Əli Əmiri'nin əlinə keçib. Həmin əlyazma divanı indi Fateh «Millət» kitabxanasında 487 nömrə altında qorunur[3].

Xatırlatmalıyam ki, bu divanın müqəddiməsində şairin öz əliylə yazıldığı zənn edilən 26 səhifəlik bir məktub da var və bu məktub «Qürənayi-həzrəti-şəhriyaridən bir zata ərz və təqdim olunan istirhamnamə surətidir» cümləsi ilə başlamaqdadır. Adı keçən «qürəna»nın Məhəmmədəmin bəy olduğu şübhəsizdir.

***

Qaynaqlarda daha çox «Mabeynçi Əmin bəy» adıyla tanınan, avropalıların «Son Excellence (ekselans) Əmin bəy» deyə xitab etdikləri Məhəmmədəmin bəy poliqlot olduğu üçün (o, türkcədən başqa ərəb, fars və fransız dillərini çox yaxşı, ingilis, alman və italyan dillərini isə orta dərəcədə bilirdi) görəvində bu üstünlük göz önünə alınmışdı. O, güclü fransızcasıyla Sultan Əbdülhəmidə romanlar tərcümə etmişdi. Sultanın qızı Ayişə Osmanoğlu'nun xatirələrinə dayanan araşdırıcılardan biri yazır: «Sultanın bir vərdişi də gecə yatarkən bəndələrindən birisinə başucunda pərdənin arxasından detektiv və cinayət romanları ilə səyahətnamə kitabları oxutdurmasıydı. Ciddi əsərlərin, yuxusunu qaçıracağı düşüncəsiylə sanki bir layla niyyətiylə sözükeçən romanlara üstünlük verərdi. Roman oxuyan kişi padşahın uyuduğunu hiss edincə üsulluca dışarı çıxardı. [...] Ayrıca Nişan əfəndi adında biri özünə aid xüsusi dairəsində Avropa qəzetlərini oxuyar və dövləti maraqlandıran məqalə və yazıları tərcümə edərdi. Bunlar və gələn agentlik teleqraflarının tərcümələri günü-gününə padşaha ərz edilirdi. Sultan önəmli və ciddi tarix kitablarını isə gündüzləri Mabeynçi Əmin bəyə oxutdururdu». Əmin bəy bəzən Osmanlı şahzadələrinə fransız dili dərsi də keçirdi.





O, «avropalı zəvata, süfəraya rəfaqət edərək (zatları, səfirləri müşayiət edərək) Sultana xüsusi tərcümanlıq yapmaq kimi məsuliyyətli bir vəzifə» daşıyır, Osmanlı dövlətinin özəl əcnəbi qonaqlarına mehmandarlıq edirdi. Məsələn, II Əbdülhəmidin dostu, Prussiya kralı və Almanya imperatoru olan kayzer II Vilhelm və kraliça Auqusta-Viktoria 2.11.1889 və 30.11.1898 tarixlərində İstanbula gəldiklərində sarayda və şəhərdə kayzerə yoldaşlıq və bələdçilik işini Sultan məhz Məhəmmədəmin bəyə tapşırıb. Onun mehmandarlığından son dərəcədə məmnun qalan II Vilhelm Əmin bəyi «Qara Qartal» şərəf ordeni ilə təltif edib.

İtaliya şahzadəsi, kral I Umberto'nun oğlu vəliəhd Viktor Emmanuel və yoldaşı, Qaradağ şahzadəsi Helena 1900-də İstanbula gəldiklərində onlara mehmandarlıq etmək də Məhəmmədəmin bəyə həvalə olunmuşdu. Gənc ər-arvad bu yoldaşlıqdan çox məmnun qalmışdı. Onlar İtaliyaya dönməkçün Mərmərə'ni aşıb Çanaqqala'ya yol alarkən İtaliya kralı Umbertonun ölümü (29.7.1900) xəbəri Osmanlı sarayına yetişmiş, Sultan Əbdülhəmid: «Əmin bəy, sarayın rəsmi bir sürət qayığını hazırladıb arxalarınca gedin və İtaliya kralının vəfatını bildirib mənim təziyələrimi ərz edin və krallıqlarını təbrik edin» deyə əmr vermişdi. Çanaqqalada onlara çatan Əmin bəy əmri yerinə yetirmiş, vəliəhdə «Majestələri» («Zati-aliləri») xitabıyla İtaliya kralı olduğunu ifadə etmişdi. Beləcə, III Viktor Emmanuel'ə «Majes-

tələri» deyən ilk saray adamı bir Şəkili Türk olmuşdu!

Əmin bəy memarlığın incəliklərinə də bələddi və İstanbuldakı bir sıra binaların layihələndirilməsi və tikintisi zamanı Sultan onu memarların yanında görəvləndirib. Qızı Xeyriyyə xanım həmin tikililəri sadalayır: Şale köşkü, Etfal xəstəxanası, Heydərpaşa Tibbiyyə binası, Sənayeyi-Nəfizə binası (Gülxanədə Arxeologiya muzeyləri). Eskişehir Söğütdə ilk Osmanlı sultanlarının türbələrinin təmir işlərində də Əmin bəyin əməyi olub. II Vilhelmin İstanbula hədiyyəsi olan, Sultan Əhməd meydanındakı «Alman çeşməsi»nin quraşdırılmasına da (1901) Əmin bəy nəzarət edib.

Vilhelm İstanbulda xatirə çeşməsi ucaltdıqdan sonra II Əbdülhəmid də qarşı jest olaraq Berlində bir xatirə bina tikdirmək istəyib. Bu məqsədlə kayzer Berlin Universiteti Qadınlar Klinikası bağçasında ərazi ayırıb. Sultan Türk-alman dostluğunun simgəsi olacaq hərəsi 6 yataqlı iki xəstəxana binası («Həmidiyyə xəstəxanası») tikdirmək istəyən Sultan alman və italyan memarların layihələrini bəyənməyib və bu işi Türk memar Kəmaləddin bəyə tapşırıb. «.21 sentyabr 1902 tarixində Mabeynçi Əmin bəy saray baş memarı Nazim paşa və memar Kəmaləddin bəy hazırlanan üç layihəni də alaraq Almaniyanın İstanbuldakı elçisinə gedərək görüşmələr yapılmış və Sultanın memar Kəmaləddin bəyin hazırladığı layihəni münasib gördüyü ona bildirilmişdir».

Sultan Məhəmmədəmin bəyə o qədər ürək qızdırırdı ki, onu hətta ailəsinin sirləri sayılacaq məsələlərə də cəlb edirdi. Bəllidir ki, Sultanla oğlu şahzadə Əbdülqadir arasında münasibət xoşagəlməzdi. Bu mövzudan söz açan Ayişə Osnaoğlu «Atam Sultan Əbdülhəmid» adlı kitabında yazır: «(II Əbdülhəmid Bəylərbəyi Sarayında sürgün həyatı yaşarkən) Əbdülqadir əfəndi əsla gəlməmişdir. Əsasən o, atama qarşı daim küskün davranır, sosialist olduğunu iddia edirdi. «Burhanəddin əfəndi'ni bizdən üstün tutur» deyirdi. Özünə məxsus əcayib fikir və hərəkətləri vardı. Atamın heç xoşlamadığı hərəkəti etməkdən çəkinməz, məsələn, fəsini yana əyərək geyər, atamdan daim təqdir xəbər-





ləri alırdı. Atam çox dəfə Mabeynçi Əmin bəyi göndərərək nəsihət edərdi».

Bütün bunlar Məhəmmədəmin Dарğazadənin Sultan Əbdülhəmid sarayında nə qədər böyük nüfuzu olduğunu göstərir. Onun Osmanlı dövlətinə xidmətləri layiqincə dəyərləndirilib – o, məmurluq həyatı boyunca bir çox rütbə, orden və medala layiq görülüb. 1880-1904-cü illər arasında bütün dərəcələrdən (4 dərəcədən) Məcidi və Osmani, nəhayət, Murassa Osmani ordeni alıb. Bir çox əcnəbi dövlətlər də (Almaniya, İtaliya, Rusiya, Serbiya, İsveç, Qaradağ, Belçika, Fransa, Bolqarıstan, Siyam, Rumıniya, İran, Həbəşistan.) onu öz ordenləriylə təltif edib. Əmin bəyə verilən medallarınsa siyahısı çox uzundur.

***

Məhəmmədəmin bəyin ailə həyatı onu sevindirməyib, həmişə dərd-qəm içində, üzücü keçib. Öncə babasının istəyinə qarşı çıxaraq, özündən 11 yaş böyük boşnak qızı Məryəm Münirə xanım'la evlənib. Ondan övladı olmayıb, bu üzdən qadın ruhi sarsıntıya uğrayıb. 1888-də ikinci dəfə Rodoslu bir katolik qızla (müsəlman adı: Ləman xanım) evlənib, oğlu həkim Əhməd Səid Darğa (1899-1963) bu xanımdan doğulub. 1900-də onun ölümü Əmin bəyi sarsıdıb. 1904-də Zehniyyə xanım'la evlənib, qızı Fatma Xeyriyyə Kərimzadə (1905-13 yanvar 1985) bu xanımdan doğulub. Ancaq bir neçə il sonra Zehniyyə xanım[4] da vəfat etməsiylə bu üçüncü ailə də, nə yazıqlar ki, dağılıb.

Ailəsindəki sarsıntıları Məhəmmədəmin bəy Kadıköydə Osmaniyyə məhəlləsindəki Nişantaşı caddəsində 14 saylı köşkündə Şəkidən gətirtdiyi kiçik qardaşı Həsən (Behcət paşa), bacıları Səlimə, Xeyriyyə, Salihə və Fatma xanımlarla, övladları Əhməd Səid və Fatma Xeyriyyə, nəvələrı Mühibbə və Zərifə ilə məşğul olaraq unutmaq istəyib. Köşkündə hər gün böyük ailə toplantıları təşkil etmək ona üzüntülərini unutmağa gerçəkdən yardımçı olub. O, burada özünün yazdığı əsərləri, özəlliklə «Səyahətnamə»sini oxuyurmuş. «Yazıb bitirə bilmədiyi

«Mascotte» adlı operasına çox üzülürdü».

Məhəmmədəmin bəy 16 sentyabr 1925-də İstanbulda, adı keçən köşkündə dünyasını dəyişib və Qaraca Əhməd məzarlığında basdırılıb.

***

Məhəmmədəmin bəy özündə səyyah, həkim, rəssam, memar, musiqiçi, müəllim, dilmanc (tərcüməçi), diplomat, sosioloq, etnoqraf, şair. kimi bir çox peşələri birləşdirən gerçək bir bilgin və yazıçıydı. Onun qələminin məhsulu olan aşağıdakı kitablar günümüzədək gəlib çatıb.

**Elmi əsərləri:**

1. «Asiyayi-Vustaya» («İstanbuldan Asiyayi-Vustaya Səyahət») əsəri. «Səyahətnamə»də Əmin bəy yazır: «Bəndəniz Rusiya, Almaniya, İtaliya, Fransa, İngiltərəni bir çox gəzdim». Başqa bir yerdə isə deyir: «.Asiyayi-Vustaya bir deyil, iki səyahət verdim». Özəlliklə Türkmənlərə vurğun müəllif onların yaşamı, mənəviyyatı, əxlaqı və b. haqqında olduqca qiymətli və zəngin bilgilər verir. Bu bilgi çağımızın oxucusu üçün daha dəyərlidir. Məsələn, ermənilərin Türkmənlərin əxlaqına mənfi təsiri haqqında yazır: «Əsl Türkmənlərdə yalan söyləmək və adam aldatmaq məlum belə olmadığı halda bu səvahil xalqı ermənilərdən bittəhsil (öyrənərək) qayət firibgər (yalançı) və xüd'əpərvər (fırıldaqçı) olmuşlar». «Təkə Türkmənləri» bölümündə o bildirir: «Səlcuqların əsli işbu Təkə Türkmənləri olub» «Asiyada və bəlkə bütün dünyada hürriyyətə ən ziyadə rağib əhali bunlardır. İndiyə qədər həmən heç bir hökumətin təhti-idarəsinə girməyib, İran, Buxara və rusiyalılara qarşı öz istiqlallarını pək gözəl muhafizə etmişlər». Xivə xanı Məhəmmədrəhim xanla görüşünü təsvir edən bölümdə Əmin bəy yazır ki, xan «.Rusiya müharibəsinə dair məndən bir xeyli məlumat aldıqdan sonra xanədani-cəlilüş-şani-Osmaniyanın da Asiya və hətta bu Xarəzm qitəsindən olmaları[nın] bu məhəllər üçün də bir böyük mədari-iftixar (iftixar qaynağı) olduğunu və ara yerə İranın hayuləti (yolu kəsməsi, əngəl olması) ilə dövləti-Osmaniyyədən cüda düşmələri





[ni] özləri üçün mücibi-təəssüf bulunduğunu və Kaşğar əmirinin himayeyi-Osmaniyyəyə düxulundan çox ziyadə məmnun olub əgər Kaşğar hökuməti təəssüs və təəyyüd edərsə (qurular və güclənərsə) bütün Asiya xanlıqlarının da o ittifaqa girərək şövkəti-islamiyyənin artacağını bəyan eylədi». Məncə, əsəri elmi baxımdan araşdıranlar bu cür bir çox nöqtələrə özəlliklə diqqət yetirməlidirlər.

«Səyahətnamə» indiyədək hicri 1295-də (m. 1878) və 1986-da (2-ci basqısı 2000-də), 1998-də, 2007-də 4 fərqli biçimdə 5 dəfə nəşr edilib. Ancaq bizcə, əsərin ən kamil və elmi baxımdan ən dəyərli nəşri nəvəsi Prof. Dr. Mühibbə Darğa'nın, Prof. Dr. Müəmmər Özərgin'in çeviriyazısı üzrə hazırlayaraq 2007-də gerçəkləşdirdiyi son basqısıdır.

Osmanlı dövlətindən Orta Asiyaya ilk səyahəti gerçəkləşdirmiş səyyahın bu bahabiçilməz «Səyahətnamə»siylə bağlı Prof. Dr. Əli Birinci nə gözəl söyləyib: «.[Əmin bəyin] yalnız «Səyahətnamə»si belə adını yaşatmaq üçün kafidir». Əli Birinci səyyahın Xivə'dən sonra Daşkənd, Xocənd, Kaşğar üzərindən Əfqanıstan və Hindistan'a keçdiyini, oradan İstanbul'a döndüğünü bildirir və ardınca həmən qeyd edir: «Ancaq bu qismin hekayəsini, nə yazıq ki yazmayıb». Ancaq nəvəsi, Prof. Dr. Mühibbə Darğa, Xivədən sonrakı səyahətin də yazıya alındığını təsdiqləməkdədir: «Ailə böyüklərimiz və babam Dr. Əhməd Səid Darğadan, gəzisinin yayımlanmamış ikinci bölümünü yazdığı mətnin Quruçeşmədəki yalısında (sahil villasında) kül olduğunu[5] üzülərək illər əvvəl öyrənmişdim».

2. «İpək böcəyi bəsləmək üsulu» Osmanlı dönəmində ipəkqurdu saxlamağa dair ilk elmi əsərlərdəndir. Bu kitabın yazılmasını təsadüf saymaq yanlış olar. Unutmayaq ki, yazar dünyaya gözlərini açar-açmaz Şəkidə ipəkqurdu görüb, barama ilə məşğul olub. Prof. Dr. Zəkəriyyə Əlizadə'nin araşdırmaları «Şəki ərazisinin tut ipəkqurdunun yarandığı məkanlardan biri olmasına» şübhə yeri qoymur. O dönəmdə Şəki dünyada məşhur ipəkçilik mərkəziydi. Məhəmmədəmin bəy 9 yaşında olduğunda – 1863-

də Şəkidə dünyanın ən böyük ipək fabriki qurulmuşdu. Burada 452 çarx vardı və 1.861 işçi çalışırdı. Bu üzdən də Əmin bəyin ipəkqurdu haqqında əsər yazması çox təbiidir. 78 səhifəlik bu kitab hicri 1296/miladi 1879-da Dərsəadət'də (İstanbulda) Kırkambar mətbəəsində basılıb. Əli Birinci, Əmin bəyin bu kitabı Əhməd Midhət əfəndi'nin həvəsləndirməsiylə yazmış ola biləcəyini təxmin edir.

3. «Sığır bəsləmək üsulu» kitabının adını buradan oxuyuruq: «Mabeyinci Mehmet Emin Beyin Sicil Kaydı. T.C. Başbakanlık Arşiv Genel Müdürlüğü. O. No: 3199»». Türkiyə qaynaqlarında bu əsər haqqında heç bir bilgi yoxdur, ancaq biz AMEA M.Füzuli adına Əlyazmalar İnstitutunda onun bir nüsxəsini taparaq üzə çıxarmışıq. Üzərində «Sığır bəsləmək üsulu. Mürəttibi qürənayi-həzrəti-şəhriyaridən M. Əmin» yazılmış kitab Dərsəadətdə Mətbəeyi-Osmaniyyədə basılıb. Cildin üzərində və 72-ci səhifəsində basılma tarixi 1305/1887-88, titul səhifəsində isə 1306/1888-89 göstərilib. 8 bölümdən ibarət, bir çox şəkillərlə bəzədilmiş (şəkilləri Əmin bəyin özünün çəkdiyini düşünürük) 72 səhifəlik bu kitabda inək bəsləməklə bağlı hərtərəfli bilgi vardır.

4. «Müəllimi-lisanı-farsi». Hicri 1308-də (m. 1890/91) Dərsəadətdə Mahmud bəy mətbəəsində basılmış 234 səhifəlik əsər farscanı Türklərə öyrətmək üçün yazılıb. Bu kitab Məhəmmədəmin bəyin farscanı yüksək səviyyədə bilməsinin göstəricisidir.

5. «Müsəvvər tərifi-heyvanat». Dərsəadətdə ilk dəfə 1306/1889-da Mətbəeyi-Amirədə, ikinci dəfə 1310/1893-də Mətbəeyi-Osmaniyyədə basılmış kitabdır. Əsasən çocuqlar üçün hazırlanmış bu əsərdə heyvanlar aləmindən danışılır, heyvan növləri tanıdılır. Mətni 71 səhifə olan əsərə artırılan 23 qoşa səhifədə çox sayda müxtəlif (quruda gəzən, havada uçan və suda üzən) heyvanların rəngli şəkilləri verilib.

6. «Müsəvvər tərifi-ümməm». Dərsəadətdə 1308/1891-də Mətbəeyi-Osmaniyyədə basılmış 68 səhifəlik bu kitabda dünya millətlərinin tarixi, dünya tarixi genəlliklə araşdırılmaqda, millətlərin adları verilməkdədir. Əlavə 2 səhifədə rəngli 12 şəkil var.





**Fransızcadan tərcümələri:**

1. «Mərkəzi-Ərzə səyahət». Jül Vern'in (1828-1905) bu romanını «qürənayi-həzrəti-şəhriyaridən» Məhəmmədəmin bəy fransızcadan tərcümə edərək 1302/1884-85-də Dərsəadətdə Mətbəeyi-Osmaniyyədə basdırıb (416 s.). Bu, romanın Türkiyədə ilk tərcüməsidir.
2. «Beş həftə balon ilə səyahət». Jül Vernin 1863-də yazdığı ilk romanını fransızcadan çevirən Məhəmmədəmin bəy onu bu ad altında 1305/1887-88-də Dərsəadətdə Mətbəeyi-Osmaniyyədə nəşr etdirib (351 s.).

Bu tərcümələrin ikisi də Türkiyə çocuq ədəbiyyatının ilk örnəklərindən sayılır.

**Bədii əsərləri:**

1. «Mélange de Poésies - Turques et Persanes, Composées et Traduites en Français» (şeirlər toplusu). 85 səhifəlik bu fransızca kitab 1912-də Dərsəadətdə basılıb. Qızı Xeyriyyə Kərimzadə yazır ki, Məhəmmədəmin bəy bu «kitabını öz hesabına basdırmış, ancaq çox bəyənmədiyi üçün satışa çıxarmayıb. Halbuki şeirlər fəlsəfi, səmimi, hüznlüdür; ruhən yalqızlığı hiss edilir; məncə, Ömər Xəyyam tərzindəki kimi».
2. «Ana nəsihəti». Bu kiçik kitabın adını yalnız qızı Xeyriyyə Kərimzadənin yazısında görürük.

1. Bitirmədiyi əsərləri:
2. 1 Fransızca-türkcə lüğət.
3. «Mascotte» adlı opera mətni.
4. Qızı Xeyriyyə xanım yazır: «Şeirləri xaric, yarımçıq qalmış bu iki yazısı məndə yoxdur, itib». Atasını nəzərdə tutaraq, başqa bir yerdə bildirir: «Yazmağı bitirmədiyi Mascotte adlı operasına çox üzülürdü».

## SÜVARİ LİVASI (GENERAL-MAYOR) HƏSƏN HACI ƏBDÜRRƏHİM ƏFƏNDİ OĞLU DARĞAZADƏ (HƏSƏN BEHCƏT PAŞA) (1863-ədək, Şəki – 1925-dən sonra, İstanbul)

Osmanlı dönəmi Türkiyə tarixində önəmli xidmətlərdə bulunmuş bu dəyərli şəxsiyyət haqqında, heyf ki, Türkiyədə də, Azərbaycanda da indiyədək ayrıca heç bir yazı qələmə alınmayıb, onun həyatı bugünədək qaranlıqlar içində qalıb. Yalnız qardaşının qızı Xeyriyyə Kərimzadə babası Məhəmmədəmin Darğazadənin həyatını anladarkən əmisindən də yeri gəldikcə söz edib, nəvəsi Prof. Dr. Sina Bərköz isə İnternetdə onun haqqında ingiliscə qısa bilgi verib. Ondan söz açılan heç bir başqa qaynaq bizə bəlli deyil. Dəyərli Sina bəy atası və əmisi ilə birlikdə, babası (anası Ayişə Ülviyyə xanımın atası) Həsən paşa və onun böyük qardaşı Məhəmmədəmin bəyin olduqca qiymətli fotolarını və bir çox bilgiləri bizə göndərib. İnşallah, yaxın dönəmdə Türkiyə arxivlərində onun sicilləriylə şəxsən tanış olmaq umudundayam.

Həsən Hacı Əbdürrəhim əfəndi oğlu Darğazadə'nin (Həsən Behcət paşanın) doğum tarixi hələlik bəlli deyil. Xeyriyyə Kərimzadənin, əmisi haqqında yazdıqlarından öyrənirik ki, Məhəmmədəmin bəy Osmanlı sarayında vəzifə aldıqdan az sonra Şəkidəki atasını xəbərdar edir, «çox sevdiyi kiçik qardaşı Həsən'ı yanında istəyir», Həsən atasıyla İstanbula gəlir. Əmin bəyin 1854-də doğulduğunu və 9 yaşındaykən Şəkidən Fransaya aparıldığını göz önündə tutsaq, qardaşının ən gec 1863-cü ildə doğulduğu, İstanbula isə 1880-ci illərin başlanğıcında gəldiyi məntiqlə aydınlaşır.

Gənc Həsən «əsgərliyi çox sevdiyi üçün İstanbulda Hərbiyə Məktəbi'nə girir və süvari sinfini bitirib Osmanlı ordusuna zabit olaraq qatılır». Yenə Xeyriyyə xanımın bildirdiyinə görə, Həsən paşa «bir neçə il Sultana yavərlik də edib».

Xatırladım ki, qürənа olduqdan sonra Əmin bəy sultanın istəyiylə Nişantaşı'ndan Quruçeşmə'yə köçüb, bundan bir müddət sonra qardaşı Həsən də «yüzbaşılığa yüksəlib, süvari yüzbaşısı olub, Balkan hərbləri sonunda İstanbula köçkün olaraq gəlmiş Bolqarıstan Türklərindən Zeynəb Səlvət xanım'la evlənib və ailəsiylə Quruçeşmə'də bir köşk tikdirib və oraya yerləşib». Yaxın-yaxına olmaları özəlliklə ailədən yarımamış Əmin bəyi ovundurmuşdu.





Əmin bəy 1909-da saraydan ayrıldıqdan sonra uşaqlarıyla birlikdə Acıbadam'da bir köşkə çəkilib. Xeyriyyə xanım bildirir ki, «əmim Həsən paşa da təqaüdçü olaraq aşağı Acıbadamda tikdirdiyi bir başqa köşkə çocuqlarıyla yerləşib. Hər iki qardaş da Quruçeşmədəki evlərini kirəyə verib».

Həsən paşanın ölüm tarixi də bəlli deyil. Onun, 1925-də dünyasını dəyişmiş böyük qardaşı Əmin bəydən sonra Haqqın rəhmətinə qovuşduğunu düşünə bilərik.

Həsən paşanın Zeynəb Səlvət xanım'dan 3 qızı (Şərifə, Səbihə və Ayişə Ülviyyə) və bir oğlu (Kamal) olub. Ən kiçik qızı Ayişə Ülviyyə xanım korgeneral (general-polkovnik) Məhəmmədnuru (Mehmet Nuri) Bərköz'ün yoldaşı, Prof. Dr. Sina Bərköz'ün anasıdır. O, 24 yanvar 1993-də dünyasını dəyişərək Zincirliquyu məzarlığında dəfn edilib.

Tək oğlu Kamal Darğa 40 il, onun yoldaşı isə 2 il öncə vəfat ediblər. Övladları olmayıb.

***

Həsən Behcət paşanın əsgəri xidmətləri haqqında bilgimiz qıtdır. Sina Bərköz yazır: «Hərbi həyatı boyunca Osmanlı imperatorluğunun çeşidli yörələrində və bu arada Bağdadda süvari komandanı olaraq görəv yapıb».

Çeşidli qaynaqlarda eyni adı («Həsən Behcət») daşıyan, tanınmış rəssam olan bir xəritəçi zabitdən də söz edilməkdədir. Həsən Behcət paşanın onunla eyni adam olub-olmadığı ancaq ikisinin də əsgəri sicillərinin incələnməsindən sonra kəsinlik qazana bilər.

## KORGENERAL (GENERAL-POLKOVNİK) MƏHƏMMƏDNURU HACI İLYAS OĞLU SARIKƏRİMLİ (MEHMET NURİ BƏRKÖZ/NURİ BƏRKÖZ) (1889, Şəki – 16 yanvar 1975, İstanbul)

1912-ci ildən 1950-ci ilədək Osmanlı imperatorluğu və Türkiyə Cümhuriyyəti ordularında xidmət etmiş korgeneral (general-polkovnik) Mehmet Nuri Bərköz/Nuri Bərköz paşa kiçik qardaşı orgeneral (ordu generalı) Mahmud Bərköz paşa kimi Azərbaycan (Şəki) torpağının yetişdirməsi olaraq şərəfli adını Türk savaş tarixinə yazıb.

Mehmet Nuri paşanı (Mahmud Bərköz və Həsən Behcət paşaları da) Azərbaycana ilk dəfə tanıdan onun oğlu Prof. Dr. Sina Bərköz olub. O, Adil Bağırov'un ABŞ-da qurduğu «Virtual Azərbaijan» saytına ilk bilgini göndərib. Eyni yazının qısası - Wikipedia'da yer alır.

Bu bilgilərdən yararlanmış görkəmli Azərbaycan araşdırıcısı Prof. Dr. Vilayət Quluyev bəzi başqa bilgilər də əldə edərək bu kişilər haqqında dəyərli bir məqalə yazıb. Təəssüf ki, indiyədək bu üç paşanın ömür yolu arxiv bəlgələrinə söykənilməklə öyrənilməyib.

Mehmet Nuri Bərköz haqqındakı bu yazını biz onun, həyatda ikən Hərb Akademiyasında yazdığı qısa tərcümeyi-halı üzərində qurmuşuq. Bu tərcümeyi-halı oğlu Prof. Dr. Sina Bərköz ailə arxivindən götürərək lütfkarlıqla bizə təqdim edib. Əlbəttə, yazımızda bircə bu bəlgə ilə kifayətlənməyərək başqa qaynaqlardan öyrəndiyimiz bilgiləri də buraya artırmışıq.

Mehmet Nuri və Mahmud Bərköz qardaşları Azərbaycan'ın Şəki şəhərində yaşamış «Sarıkərimli», ya da «Sarıkərimoğulları» soyundandır (bu gün Şəkidə onlardan kimsə qalmayıb). Mehmet Nuri paşanın qayınatası olan Həsən Behcət paşa isə Şəkinin «Dərğazadə» soyundan gəlir. Hər iki soy Şəkinin «Yuxarıbaş» mərhəlləsindəndir və aralarında uzaq qohumluq vardır[6].

Mehmet Nuri bəyin anası Fəxrənnisa xanım, atası Hacı İlyas, onun atası Sarı Kərim, onun da atası Rəsul, anası isə Şəki-





nə'dir. Hacı İlyas Şəkidə ipək ticarəti ilə məşğul olur, zərgərlik də edirmiş.

1889-da Şəkidə doğulmuş Mehmet Nuri[7] ilk təhsilini buradakı rus-Türk məktəbində alıb. Ruslar Qafqaz Türklərini Türkiyədəki soydaşlarından ayırmaq üçün onlara «Tatar» dediklərinə görə həmin məktəbi də «rus-tatar məktəbi» adlandırırdılar. Mehmet Nuri, bu məktəbə getdiyi ilk gün evə döndüyündə anası Fəxrənnisa xanımdan «biz tatarıqmı?» deyə soruşub, anası da «xeyr, biz Türkük» deyə ona soykökünü anladıb. Ailə genəlliklə təəssübkeş Türk və müsəlman idi.

Kiçik bir əhvalat: Mehmet Nuri bəyin babası – Fəxrənnisa xanımın atası Həmid ağa 120 yaşına qədər yaşayıb. Bunu eşidən çar (güman ki, Nikolay) ona bir medal göndərib. Bundan sonra rus qəzetçilər 120 yaşlı qocanın fotoşəklini çəkmək üçün Şəkiyə gəliblər. Ancaq medal xaç şəklində olduğu üçün Həmid ağa onu boynundan asmağı rədd edib və foto medalsız çəkilib.

1905-ci ildə Hacı İlyas ailəsini də özüylə götürərək Osmanlı dövlətinə, ipək ticarətində bulunduğu Bursa şəhəri'nə köçüb. Bu köçün səbəblərinin başında Hacı İlyasın, iki oğlunun çar ordusunda əsgərə alınmasını istəməməsinin durduğu anlaşılır. Ancaq o, Bursaya gəldikdən az sonra oğullarının ikisini də bu şəhərdəki hərbi məktəbə vermiş, övladlarının Türk zabiti olacağından qürur duymuşdu. Nə yazıq ki, Hacı İlyas o fərəhli günü görə bilmədi – Bursaya gəldikdən az sonra 45 yaşlarında ürək xəstəliyindən vəfat etdi.

Xatırladım ki, Mehmet Nurinin Şəkidə dörd dayısı qalmışdı: Samət, Məcid, Hidayət və Mustafa (Həmid ağa oğulları). Ailə Bursaya köçdükdən sonra Samət dayısı onları baxımsız buraxmayıb, ziyarətlərinə gələrək (Bursa hərbi məktəbinin tələbələri olan bacısı oğulları ilə şəkil də çəkdirib) qayğılarını çəkib və sonra Şəkiyə dönüb.

Mehmet Nuri bəy orta məktəbi Bursa Əsgəri Rüşdiyyəsində və liseyi də İşıqlar Əsgəri Liseyində oxuduqdan sonra 1909-da Hərb Məktəbinə girərək 1912-də buranı bitirib.

1912-nin martında o, teğmən (leytenant) olaraq öncə Van'-da 11-ci kolordu (korpus) 33-cü tümən (diviziya) 97-ci alay birinci tabur ikinci bölükdə taqım komandiri olub, 1913-ün aprelində yenə Van'da 52-ci alay birinci bölükdə görəvləndirilərək gerilla (partizan) savaşı aparmaq və rus ordusunu öyrənmək üçün qısa bir müddət Güney Azərbaycan'a göndərilib.

1913-ün iyulunda yurda döndükdən sonra 1914-də üsteğmən (baş leytenant) rütbəsi alıb və 1916-yadək 33-cü tümən (diviziya) komandanı albay (polkovnik) Qalatalı Şövkət'in əmir subayı (yavəri) olaraq Sarıqamış savaşlarına qatılıb. 14 iyul 1916-dan 12 fevral 1917-yədək Ərzurumda İkinci Qafqaz Kolordusunun (korpusunun) bütün cəbhə savaşlarında iştirak edib, xüsusən marşal Fevzi Çakmağ'ın qərargahında rusca tərcüman vəzifəsində çalışıb.

1917-nin martında İstanbulda Ənvər paşa'nın Ümumi Qərargahında İstixbarat (Kəşfiyyat) Şöbəsinə təyin edilib və burada qısa bir müddət işlədikdən sonra «gizli kişiliklər (şəxsiyyətlər) altında» öncə bir il Stokholm və Kopenhagen'ə, daha sonra da Peterburq və Moskva'ya istixbarat işçisi olaraq göndərilib[8]. Birinci dünya savaşının sonlarına doğru yüzbaşılığa (kapitanlığa) yüksəlib.

1918-də Birinci dünya savaşının bitməsindən sonra Türkiyəyə dönərək 24 oktyabr 1919-da Hərb Akademiyasına girib, bir il oxuduqdan sonra, 18 may 1921-də Ulu Öndər Mustafa Kamal Atatürk'ün başlatdığı Qurtuluş Savaşına qatılmaq üçün Anadolu'ya keçərək öncə Genəlkurmay (Baş Qərargah) Şərq İşləri Müdirliyini, 1921-in noyabrından 1923-ədək də Qərb Cəbhəsi Qərargahı Üçüncü Şöbəsinin Müdirliyini edib[9].

Turqut Özakman'ın «Bu çılgın Türklər» romanının (İstanbul, «Bilgi» yayınevi, 2005) surətlərindən biri də yüzbaşı Mehmet Nuri Bərköz'dür. Əsərin «Sakarya savaşına hazırlıq (25 iyul 1921 - 13 avqust 1921)» adlı üçüncü bölümündə oxuyuruq:

«FEVZİ PAŞA da Ankarada qərargahdakılarla durumu dəyərləndirirdi. Ordu düşmənlə aranı 200 km. açaraq, yəni bir savaşa hazırlanmaq üçün gərəkən zamanı qazanmışdı.





Yunan ordusu da yıprandığı üçün çəkilən ordunu izləyə bilməyib durmuşdu. Hücuma keçə bilmək üçün ciddi hazırlıq yapması gərəkdi. Bu müddət iyirmi gün olaraq hesablanırdı.

Bu zamanı çox yaxşı dəyərləndirmək, zərbə yemiş ordunun silah və savaşçı əsgər sayını çoxaltmaq, kamil təşkilatını yenidən düzənləmək gərəkdi.

Sakaryanın şərqinə çəkilən orduda ancaq 30.000 savaşçı (tüfəngli əsgər) qalmışdı. Qalanları: istehkamçı, poçt, rabitəçi, sağlıq, orkestr, çörəkçi heyəti kimi siniflərin və yardımçı xidmət birliklərinin çoxu silahsız əsgərlər idi.

Mərkəz Ordusundan bir tümən (diviziya) təşkil etmək və yollamaq istənmişdi. Təhsil mərkəzlərində də beş minədək hərbçi vardı.

«Qalan boşluğu yeni əsgərlərlə dolduracağıq».

Yüzbaşı Nuri Bərköz: «Bəli, amma, paşam. - dedi,- tükənmiş xalq yenilmiş bir orduya yenidən dəstək verərmi? Üstəlik zaman çox dardır, ancaq yaxın bölgələrdən hərbçi toplaya bilirik. Bu kəsimin əsgərlik yaşına girənlərinin sayı ehtiyacı ödəyərmi? Yetər sayda hərbçi gəldi deyək, yeni əsgəri 10-15 gündə öyrədib savaşa hazırlamaq mümkündürmü? Bu qədər qısa müddət içində yeni bir əsgər nə öyrənə bilər ki?».

Problem bu qədər deyildi, əlbəttə.

Məsələn, bütün ratsiyalar xilas edilmişdi, amma çəkilmə sırasında çoxu xarab olmuşdu. Əldə ehtiyat hissə yoxdu. Məsələn, bütün süvarilərin əlində yalnız yüz on səkkiz qılınc vardı. Bu üzdən süvarilər hamılıqla piyada savaşı aparır, əsgərlər atlı hücuma süngü deyə uçları sivrildilmiş uzun zopalarla qalxırdılar. Məsələn, 75 mm-lik mərmi çox azalmışdı, halbuki topların çoxu bu çapdaydı. Cəbhə çox təcili bu mərmilərdən istəyirdi. Amma yaxın anbarlarda bu çapda mərmi yoxdu. Quru yoluyla şərqdəki anbarlardan gətirtmək isə aylar alırdı» (ss.217-218).

Bu dönəmin gerçək mənzərəsini göz önündə canlandıran «Türkiyə» qəzetinin yazarı İsmayıl Yağcı «Qurtuluş Savaşımız Batının vəhşiliyi ilə mücadilədir» adlı məqaləsində bunları anladır:

«Tarixin təsdiq edə bildiyi beş min illik Türk varlığını, bir həmlədə dünyadan silməyə həvəslənən Batının işğalçıları Böyük Hücumda başlarını daşlara vurdular.

26 avqust 1922-də başlayan Türk irəli həmləsi 30 avqusta gəlindiyində yunanı məğlub etdi. Çapqınçılar da darmadağın qaçmağa başladılar. Bu darmadağınla yanaşı, vəhşi niyyətləri və üzləri də tam olaraq ortaya çıxdı. Tərk etdikləri hər şəhəri, kəndi və tarlanı yandırıb-yaxdılar. İzmirə çıxdıqlarında yapdıqları vəhşilik on mislinə qalxmışdı.

Qərbi Anadolunu yunanlıların istilasından 15 may 1919-dan 9 sentyabr 1922-də İzmirdən dənizə tökülmələrinə, 17 sentyabr 1922-də Mudanyadan qovulmalarına qədər yandırdıqları yerlərin sayı 55.800-dür.

Dörd yüz əlli il Türklərin ədalətli idarəsində din, dil və ticarətlərində azadlığın ən genişini yaşatdığımız topluluqların Türkə layiq gördükləri vəhşilik. Bu gün Türkiyəni işgəncəçilikdə suçlayan qafillərə elanən bildirilir.

Elə bununla bağlı bir xatirə.

İstefadakı general Nuri Bərköz deyir ki:

«Düşməni qovalayan Türk qüvvətləri İzmirə doğru axarkən məni Uşak mövqe komutanı təyin etdilər. Orada minlərcə yunan əsirinin ehtiyaclarını ödəməyə çalışırdım. Yunan Başkomandan vəkili (müavini) Trikopis də Uşakda idi.

Bir gün yavərim Trikopisdən fransızca bir məktub gətirdi. Məktubda əsir general: «Dünən səlahiyyətli bir zabitdən əsir yunan zabitlərinin Ankaraya göndəriləcəklərini və Uşakdan Polatlıyadək piyada götürüləcəklərini öyrəndim. Bu zabitlərimiz savaş səbəbiylə yorğundurlar. Qidasızlıqdan düşkün və halsızdırlar. Nə şinel, nə yorğanları vardır. Bir neçə kilometr getdikdən sonra yıxılıb qalırlar. Məncə, ehtiyacı olanlara paltar və ayaqqabı verilməsi və avtomobillər ayrılması yaxşı olur. Bu xüsusa nəzəri-diqqətinizi çəkirəm»- deyirdi.

Trikopisi çağırtdım və «Mən sizləri sizin yandıra bilmədiyiniz, salamat qalmış binalarda saxlayıram. Altlarınızdakı yataqlar





insanlarını diri-diri öldürdüyünüz evlərdən alındı. Hələ dünən evlərinin yanmasını seyr etdiyiniz insanlar sizlə daha necə davransın? Ankaraya gedən dəmir yollarını siz xarab etdiniz. Yol yoxdur. Səkkiz yaşlı çocuqlarımız belə kilometrlərcə məsafəyə kürəklərində mərmi daşıyırlar. Məmləkətim qan ağlarkən bu göstərdiyimiz lütfkarlığı dünyada hansı millət göstərə bilir? Arxanızda buraxdığınız xarabalarda nə qoydunuz ki, nə istəyirsiniz? Bir il öncə zabitləriniz Uşakdan Sakaryaya yüyürərək gəlmişdi. O zaman necə yeridilərsə indi də elə gedəcəklər. Buralara sizi bizmi çağırdıq? Hansı üzlə bizlərdən mərhəmət istəyirsiniz!».

Bu sözlərimi gözləri yerdə dinləyən Trikopis, utandığından dodaqlarını dişləyirdi. Mənə doğru zoraki bir baxışla: «Bəzi zabitlərin israrı ilə o məktubu yazmışdım. Məni bağışlayın və o məktubu yox sayın»,- dedi».

Ulu Öndər Atatürk'ün Akşehirdəki həyatını incəliyinədək izləmiş Mehmet Koç «Atatürk Akşehirdə» adlı dəyərli əsərində 1922-ci il savaşından bəhs edərkən korgeneral (general-polkovnik) Nuri Bərköz'ün xatirələrindən də yararlanıb. Əsərin «Akşehir teleqrafxanası nəzarət altında» adlı bölümündə müəllif yazır:

«24 avqustda (1922-Ə.T.) yaşananları korgeneral Nuri Bərköz, xatirələrində:

«Qərb Cəbhəsi Qərargahı Akşehirdən savaş meydanına hərəkət edərkən kəşfiyyatdan bir tel gəlmişdi; bunda Trikopis ilə Diyenisin arasının pozulduğu bildirilməkdəydi. Teli Cəbhə Komandanına mən götürmüşdüm.

«-Bax, bu, yaxşı xəbərdir»,- dedi və qərargah Qocatəpəyə doğru hərəkətə keçdi. Cəbhə qərargahının avtomobil qismini, Adanalı dövlətlilərin Qərb Cəbhəsi Qərargahına hədiyyə etdikləri avtomobillər təşkil edirdi. Biz tam hərəkət edirdik ki, Başkomandan (Mustafa Kamal Atatürk - Ə.T.) məni çağıraraq:

«Nuri, sən burada qalacaqsan, teleqrafxananı əmrin altına alacaq, heç bir yerə xəbər sızmamasını təmin edəcəksən. Gələn xəbərləri mənə çatdırarsan!»- buyurmuşdular. Tez teleqrafxananı Üçüncü Şöbə müdiri Rasim bəy ilə bərabər əmrimizə aldıq.

Hücumun başladığı 26 avqustdan 30 avqusta qədər teleqraf məmurlarını evlərinə belə göndərmədim. Yeməklərini yanımızda yeyir, ayaqyoluna belə növbətçi yanında çıxırdılar. Hər kəs bu sükutdan şübhələnmişdi. Sıx-sıx Məclisdən axtarırlar, Başvəkil Rauf bəy, Daxiliyyə Vəkili Ədnan bəy Mustafa Kamal paşa ilə danışmaq istəyir, durmadan harada olduqlarını soruşurdular. Mən də verdiyim cavabda «əfəndim, Başkomandan qitəatla bərabər təftişdədir» kimi sözlərlə baş qatmağa çalışırdım. 27 avqustda Rauf bəy çox qızğın olaraq teleqraf başında: «Nuri bəy, nə olur? Hər kəs narahatdır, burada cürbəcür rəvayətlər danışılır.»,- deyə özündən çıxmışdı. Mən də cavabımda: «Əfəndim, cəbhədən top səsləri gəlir.»,- deyə cavab verdim. Halbuki mən Akşehirdəydim. Cəbhədən gələn top səsləri duyula bilməzdi.

Hücum başlayalı iki gün oldu, düşməndən bir xeyli yer qazanılmışdı. Ertəsi gün Rauf bəy maraqla təkrar sordu; mən gələn sualları cəbhəyə yetirir, Başkomandandan aldığım təlimata görə idarə edirdim. Ertəsi gün «Nuri bəy, cəbhədən nə xəbər?»- deyə sordular. Cavabımda: «Əfəndim, top səsləri uzaqlaşır, dərindən gəlir»,- deyərək bir əndişənin olmadığı, sevinəcək bir xəbərin yaxında rəsmi bir ağızla yetişə biləcəyi hissini oyandırırdım.

1 sentyabrda isə Akşehirdən Başkomandanın imzası ilə Məclisə bu teli çəkdim:

«Qərb Cəbhəsində 26 avqustda başlayan hücumumuz Afyonqarahisar, Altındaş, Dumlupınar arasında böyük bir meydan savaşı halında beş gün beş gecə davam etdi. Türkiyə Böyük Millət Məclisi Ordularının qəhrəmanlığı zəfərimizin təmin olunmasını mümkün etdi, zalım və məğrur bir düşmənin əsl qüvvətlərini ağıllara dəhşət verəcək qətiyyətlə məhv etdi. Ən böyük komandandan ən gəncinə qədər ordularımıza hakim olan fikir millətinin göstərdiyi vəzifə uğrunda, həyatını belə sevə-sevə verməkdir. Bunu müharibə meydanında görərək bütün millətimə xəbər verirəm».

Bunu çəkdikdən sonra Akşehirdə vəzifəm bitmişdi. Birbaşa cəbhəyə gəldim» şəklində bildirməkdədir».





Qurtuluş Savaşının sona yetməsindən sonra Mehmet Nuri bəy 1923-də başqa sinif yoldaşları ilə birlikdə Hərb Akademiyasında təhsilinə davam edib və 1925-də Akademiyanı bitirərək İzmir Möhkəmləndirilmiş Mövqe Komandanlığı İstixbarat Şöbəsi müdirliyinə təyin edilib.

O, 1927-də Ankarada Milli Əmniyyət İstixbarat Şöbəsi Müdirliyinə, 1929-da 189-cu alay 2-ci tabur komutanlığına, 30 avqust 1930-da yarbay (podpolkovnik) rütbəsinə yüksələrək Genəlkurmay Istixbarat Şöbəsi müdirliyinə təyin edilib.

Millətlər Cəmiyyəti Andının 8-ci maddəsinə görə 2 fevral 1932-də Cenevrə'də toplanan Silahsızlanma Konfransına dəvət edilən Türk heyətinə Genəlkurmay Başqanlığınca «hərbi ekspert» olaraq qatılması uyğun görülüb.

Cenevrədən dönüşdə 1932-1933-də Bolu'dakı 135-ci alayın komutan vəkili (müavini) olaraq qitə xidmətinə çıxıb və 30 avqust 1933-də albay (polkovnik) rütbəsinə yüksəlib.

Mehmet Nuri Bərköz 1933-ün oktyabrında Cümhuriyyətin 10-cu ili şənliklərinə qatılan və aralarında marşal K.Y.Voroşilov, marşal S.M.Budyonnı, Sovetlərin Ankara əski Böyükelçisi S.İ.Aralov, Sovet maarif naziri N.N.Bubnov, maarif nazirinin müavini Q.M.Krjijanovski və b. yer aldığı Sovet heyətinə mehmandar olaraq görəvləndirilib. Onuncu il törənləri dönəmində Voroşilov, Budyonnı və başqaları ilə Atatürk'ün özəl danışıqlarını da məhz Mehmet Nuri bəy tərcümə edib.

1933-1935-ci illərdə Ehtiyat Zabit Məktəbinin komutanlığı ona tapşırılıb.

1935-də Kiyev manevrlərinə dəvət edilən orgeneral (ordu generalı) Fəxrəddin Altay'ın başqanlığındakı hərbi heyətin qərargah başqanı olaraq görəvləndirilib.

1936-da Moskvaya «hərbi attaşe» təyin edilib və burada bir il işləyib. Bu münasibətlə Prof. Dr. Vilayət Quluyev yazır: «Müasir Türkiyənin qurucusu Kamal Atatürk Mehmet Nuri Bərközü yaxşı tanıyırdı, dəfələrlə şəxsi etimadını nümayiş etdirmişdi. Onun Ankaraya gələn Sovet heyətlərini müşayiət etməsi, Atatürkün qeyri-rəsmi rus dili tərcüməçisi olması, sonralar isə

Moskvada Türkiyənin hərbi müşaviri vəzifəsini tutması Bərközün SSRİ ilə hərbi və təhlükəsizlik sahəsində əməkdaşlıqda Qazinin inandığı simalardan biri olduğunu söyləməyə əsas verir».

Mehmet Nuri Bərköz 1937-də Trabzon Piyada Alayı komutanlığına, 1938-də İstanbul Maltəpədəki Piyada Atış Məktəbi komutanlığına, 30 avqust 1939-da da Sivasda və İslahiyyədə tuğay (briqada) komutanlıqlarına təyin edilib.

30 avqust 1939-da tuğgeneral (general-mayor) və 30 avqust 1941-də tümgeneral (general-leytenant) rütbələrinə yüksələrək Şərqi Bəyaziddə 53-cü sərhəd diviziyası komutanlığına, 1943-də Bornovada 57-ci diviziya komutanlığına, 1945-də İzmirdə 12-ci korpus komutanlığına təyin edilib.

30 avqust 1946-da korgeneral (general-polkovnik) rütbəsinə yüksəlib.

1947-də Genəlkurmay Başqanlığının hərəkat yarbaşqanı, 1949-da Türkiyə Jandarmasının Baş Komutanı təyin edilib.

1950-nin iyununda təqaüdə çıxıb. Bu təqaüdçülük əhvalatını «Hürriyyət» qəzeti yazarı Sonər Yalçın'dan dinləyək:

14 may 1950

Ümumi seçkilər oldu. Demokrat Partiyası sandıqdan birinci partiya olaraq çıxdı.

Cümhuriyyət tarixinin ən önəmli mülki hərəkətinin olduğu bu keçid dönəmində Ankarada bir dedi-qodu altdan-altdan danışılmağa başlandı:

«Hərbçilər dövlət çevrilişi edəcək!».

«Yüksək Hərbi Şura üzvləri toplantı edir».

«Komutanlar Çankaya Köşkünə çıxıb İnönüylə görüşdülər».

Mülki-hərbçi hər kəs gərgindi. Gözlər milli şef İsmət İnönüyə çevrildi.

İsmət paşa siyasi kulisləri hərəkətləndirən «ordunu təhrik edir» iddialarına cavab vermə ehtiyacı belə hiss etmədi.

Genəlkurmay Başqanı orgeneral (ordu generalı) Nafiz Gürman Cəlal Bayarın evinə getdi, söz verdi: «Ordu seçki nəticələrinə sayğılıdır».

2 iyun 1950.





Menderes kabinəsi Məclisdən yetərli səs aldı.

Ankarada narahatlıq sürürdü. Bəzi çevrələr hərbçilərin artıq müdaxilə edəcəyindən əmindi.

6 iyun 1950.

Gözlənilənin əksi oldu.

Cəlal Bayar ilə Adnan Menderes Türk Silahlı Qüvvətlərində böyük bir təmizləmə hərəkatinə başladılar.

Ordunun yüksək komandanlığı dəryazdan keçirildi.

Genəlkurmay Başqanı orgeneral (ordu generalı) Əbdürrəhman Nafiz Gürman, Hava Qüvvətləri komandanı orgeneral Zəki Doğan, Dəniz Qüvvətləri komandanı oramiral (donanma admiralı) Məhəmmədəli Ülgən, Jandarma Baş komandanı korgeneral (general-polkovnik) Nuri Bərköz, Genəlkurmay II Başqanı orgeneral İzzət Aksalur, Birinci Ordu komandanı orgeneral Asım Tınaztəpə, İkinci Ordu komandanı orgeneral Müzəffər Tuğsavul, Üçüncü Ordu komandanı orgeneral Mahmud Bərköz[10] kimi yüksək səviyyəli komandanlarla birlikdə toplam 15 general və 150 polkovnik istefaya göndərildi!

İstefaya göndərilənlər arasında Hərbi Şura üzvləri orgeneral Kazım Orbay, orgeneral Salih Omurtak kimi komandanlar da vardı.

DP hökuməti niyə belə böyük bir təmizləmə əməliyyatı aparmışdı?

«Bir gün Başbakanlığa bir polkovnik gəldi. Adnan Mendereslə özəl bir danışıq apardı, yüksək səviyyəli zabitlərin çevriliş hazırlığı içində olduğunu söylədi və Türk Silahlı Qüvvətlərində böyük təmizləmə hərəkəti beləcə başladı».

Söylənən buydu.

Halbuki işin əsli elə deyildi!.

Bayar-Menderes ordu içindəki «İnönüçü paşalar»ı təmizləmək istəmişdi.

***

Korgeneral Mehmet Nuri paşa Hərb ordeni, Gümüş Ləyaqət ordeni və İstiqlal ordeni ilə təltif olunub.

Onun yayınlanmış əsərləri:

E.Pekarski, Yakut Dili Sözlüyü, 1-ci cild, TDK, İstanbul, 1945 (tərcümə təşkilatı üzvü olaraq)[11].

M.P.Veltman, Böyük Hərbdə Kiçik Asiya və Türkiyənin Təqsimi (tərcümə).

Rusiyadan Mevsuk Məlumat (beş-altı əsər). Ümuri-Şərqiyyə arxivlərində.

General Fişmann, Gaz Nəviləri (tərcümə).

1950-1954-cü illər arasında «Ulus» qəzetində yayınlanan 10-adək məqaləsi.

Danışdığı şivələr və bildiyi yabançı dillər: Azərbaycan türkcəsini yaxşı, tatarcanı orta, rusçanı yaxşı, fransızcanı orta dərəcədə, İsveç dilini danışıq səviyyəsində, kürdcə orta dərəcədə.

Mehmet Nuri Bərköz 16 yanvar 1975-də Haqqın rəhmətinə qovuşub. «Milliyyət» qəzetində oxuyuruq: «Türk Ordusunun dəyərli komutanlarından, istefadakı korgeneral Nuri Bərköz dünən vəfat edib. Üç orden sahibi Bərköz 86 yaşındaydı. Bərközün cənazəsi sabah hərbi törənlə torpağa veriləcəkdir». Bu qəzetin 24 yanvar 1975 tarixli sayından öyrənirik ki, cənazə töreninə Türkiyə Ordusunun ən yüksək görəvliləri qatılıb.

Təəssüf ki, Mehmet Nuri paşanın ölüm tarixi bəzi qaynaqlarda yanlış olaraq 17 yanvar göstərilməkdədir.

Yuxarıda bildirdiyimiz kimi, Mehmet Nuri paşa Həsən Behcət paşa'nın qızı Ayişə Ülviyyə xanım'la (?-24.1.1993, İstanbul) ailə qurub. Bu evlilikdən onların bir oğlu – Prof. Dr. Sina Bərköz (1936) doğulub. Sina Bərköz uzun illər İstanbul Texnik Üniversitetində işləyərək professorluğa yüksəlib. 2000-ci ildə o, öz istəyi ilə təqaüdə çıxıb və akademik həyatına indi Bəhreyn Üniversitetində professor olaraq davam etməkdədir.

## ORGENERAL (ORDU GENERALI) MAHMUD HACI İLYAS OĞLU SARIKƏRİMLİ (MAHMUD BƏRKÖZ) (1895, Şəki – 23.04.1989, İstanbul)

Orgeneral (ordu generalı) Mahmud Bərköz paşa haqqında ilk bilgini böyük qardaşının oğlu Prof. Dr. Sina Bərköz İnternet-





də verib, sonra Prof. Dr. Vilayət Quluyev bu bilgidən yararlanaraq öz dəyərli məqaləsini yazıb.

Mahmud Hacı İlyas oğlu Sarıkərimli (Mahmud Bərköz) 1895-ci ildə Şəki'də dünyaya göz açıb, ilk təhsilini burada alıb. Ailəsi Bursa'ya mühacirət etdikdən az sonra Bursa Hərbi Rüşdiyyəsinə girib, 1915-də bu məktəbi bitirərək orduda xidmətə başlayıb. 1951-də orgeneral rütbəsində istefaya çıxanadək o, Türkiyə Ordusunda şərəfli bir zabit yolu keçib. Təəssüf ki, onun xidmət bəlgələri bu gün əlimizdə deyil, bu üzdən onun haqqında geniş bilgi almaq imkanımız yoxdur. Ancaq bildiklərimizi burada veririk.

Mahmud (Bərköz) Hərbiyyə Akademiyası'nda təhsilini davam etdirərkən Türkiyənin İstiqlal Savaşı başlanmış, o da böyük qardaşı Mehmet Nuri kimi təhsilini yarımçıq qoyaraq Vətən uğrunda ölüm-dirim savaşına atılmış, Atatürkün sadiq əsgərlərindən biri olaraq bir çox fədakarlıqlar göstərmiş, bu qutsal savaşdan qazi olaraq çıxmışdı.

Savaş bitdikdən sonra Hərbiyyə Akademiyasında təhsilini tamamlayaraq topçu zabit kimi çeşidli bölgələrdə və rütbələrdə xidmətdə bulunub. Korgeneral (general-polkovnik) Mahmud Bərköz paşanı 1948-də Milli Müdafiə Nazirliyi müstəşarı (nazir müavini) olaraq görürük.

11-12 iyul 1948-də yanlarında on zabitdən ibarət bir heyətlə Ankaraya gəlmiş ABŞ Hərbiyyə Nazirliyi müstəşarı Vilyam H. Draper, Xarici İşlər Nazirliyindən rəfaqətinə təyin edilən M. Frank Visner və ABŞ Baş Qərargah Heyəti Planlar və Hərəkat Dairəsi müdiri general-polkovnik Albert C. Redemayer'lə müxtəlif görüşlərə qatılanlar arasında müstəşar, korgeneral Mahmud Bərköz və Genəlkurmay Hərəkat Dairəsi yarbaşqanı, korgeneral Mehmet Nuri Bərköz də vardı.

Amerikanın Ordu günü münasibətilə Amerika Səfarəti hərbi attaşesi Mr. Rominson ilə yoldaşı 6 aprel 1949-da Ankara Palasda bir kokteyl vermişdilər. Kokteyldə Türkiyənin bir sıra yüksək səviyyəli görəvliləri arasında Milli Müdafiə Nazirliyi

Baş müstəşarı (birinci müavini), orgeneral Mahmud Bərköz, Jandarma Baş komandanı, korgeneral Nuri Bərköz də vardılar.

13 iyun 1949-da diplomatik kuryer Fuad Güzaltan'ın cənazəsi İstanbula aparılarkən Ankaradan keçdiyi zaman qatarın Ankara vağzalında dayanması əsnasında Güzaltanın cənazəsini Milli Müdafiə Nazirliyi Baş müstəşarı orgeneral Mahmud Bərköz, quru, hava və dəniz qüvvətlərinə mənsub generallar, zabitlər və bir çox yüksək səviyyəli görəvlilər salamlayıb.

Az sonra orgeneral Mahmud Bərköz Üçüncü Ordu komandanı təyin edilib. 6 iyun 1950-də yüksək səviyyəli komandanlarla birlikdə toplam 15 general və 150 polkovnik istefaya göndərilərkən onların arasında Üçüncü Ordu komandanı, orgeneral Mahmud Bərköz də vardı. Ancaq bir həftə sonra, 13 iyunda o daha önəmli bir görəv olan Milli Təhlükəsizlik Təşkilatının Baş katibi təyin edildi və 6 sentyabr1951-də bu vəzifədən təqaüdə çıxdı.

Prof. Dr. Sina Bərközün mənə bildirdiyinə görə, Mahmud Bərköz paşa 1989-cu ildə vəfat edib.

Mahmud Bərköz paşa, Qurtuluş Savaşı qazilərindən, 2-ci dönəm Sakarya millət vəkili mərhum briqada komandiri, polkovnik Mustafa Kərəm'in qızı Rəidə xanım'la ailə qurmuşdu. Canan Ülkər və Bəliğ Bərköz'ün anası, Həsən Kərəm, Nəşidə Kərəm və Vədat Kərəmin böyük bacısı olan Rəidə Bərköz ərindən 7 il öncə – 18.5.1981-də Haqqın rəhmətinə qovuşub.

İki uşağı olan (oğlu Cihan Ülkər və qızı Nilüfər) qızları Canan Ülkər də vəfat edib.

Mahmud paşanın oğlu Dr. Bəliğ Bərköz (26.5.1921, İstanbul-18.1.2001, Los-Altos /Kaliforniya/ABŞ) ABŞ-ın Kaliforniya ştatını Los-Altos şəhərində yaşayırdı. Buradakı «Kaliforniya Türk-Amerikan Birliyi»nin (TAAC – Turkish American Association of California) qurucu və başqanlarından, genəlliklə ABŞ Türk topluluğunun liderlərindən idi. Bəliğ bəyin övladı yoxdur. Yoldaşı özündən öncə vəfat edib.





## YAZARIN SON SÖZÜ

Bu məqalədə Azərbaycanın Şəki şəhərində doğulmuş 4 görkəmli kişinin yaşamını qısaca da olsa izlədik. Mabeynçi Məhəmmədəmin bəyi çıxmaqla onların 3-ü haqqında Türkiyə arxivlərində hələ araşdırmaların aparılmamış olması, onların Türkiyə və Azərbaycan toplumlarına layiq olduqları səviyyədə tanıdılmaması tarixi bir ədalətsizlikdir. Ümidvaram ki, yaxın dönəmdə biz onların hər biri haqqında qalın-qalın kitablar oxuyacağıq. İnşallah!

3.4.2011, Bakı.

---

[1] Nuxa/Noxu Şəki şəhərinin yaxınlığındakı bir əski kəndin adı idi. O kənd indi Şəki şəhərinə qovuşub.

[2] Cümlə originalda yanlışdır.

[3] M. Ali Resulzade. Şair İsmail Nakam. – «Azerbaycan Yurt Bilgisi», yıl:3, 27.4.1934, sayı 28, ss.154-155. Məqalə yazarı Məhəmmədəli Rəsulzadə buradakı bilgilərin bir çoxunu «İstanbulda yaşayan Şəki alimlərindən Saleh bəyəfəndi»dən alıb (s.155).

[4] Məhəmmədəmin bəyin zövcələrinin adlarını Xeyriyyə Kərimzadə'nin adı keçən yazısından aldıq. Əli Birincinin məqaləsində bu adların yanlış verildiyini düşünürük.

[5] Məhəmmədəmin bəyin buradakı yalısı 1919-un martında İstanbuldakı böyük yanğında külə dönmüş, bütün əntiqə əşya, saray rəssamlarının hədiyyə etdiyi tablolar, böyük, Harəkə taban xalıları və kitabxanası məhv olmuşdu. Bax: Hayriye Kerimzade. Mehmet Emin bey'in hayatı, ss. xxx-xxxi.

[6] Sina Bərközün mənə yazdığına görə, Mehmet Nuri Bərközün ulu babası – onun ana tərəfdən nənəsi Nurcahan xanım'ın atası Hacı Məhəmməd kişi Həsən Bəhçət paşanın babası Darğa Əhməd'in qardaşıdır.

[7] Sina Bərközün mənə yazdığına görə, Məhəmmədnuru paşanın Azərbaycandakı adı sadəcə «Məhəmməd»dir. İkinci

«Nuri» adını, o zamanların adətinə görə, Bursada bir xocasının verdiyini (başqa Mehmetlərlə qarışmasın deyə) özü oğluna danışıb. Deməli, o, Azərbaycanda «Məhəmmədnuru» adı daşımayıb. Qardaşların «Sarıkərimli» soyadı daşıdıqları da şübhəlidir. Nuri paşa sadəcə «Sarıkərimoğullarından» olduqlarını söyləyirmiş.

[8] Mehmet Nuri Bərköz Türk hərbi əsirlərinin rus hərbi əsirləri ilə dəyişdirilməsi ilə görəvli «Hilali-Əhmər» (Qırmızı Aypara) Cəmiyyəti heyətinə üzv kimi qatılaraq Sankt-Peterburq'a göndərilib. Bu heyətin başında Türk siyasi düşüncə tarixinin və özəlliklə Türkçülük tarixinin görkəmli simalarından olan (əslən Kazan tatarı) Yusuf Akçura bulunmaqdaydı. – Sina Bərköz.

[9] Bu sinifdə oxuyanlar birinci ili 24 oktyabr 1919 – 7 iyul 1920-də tamamladıqdan sonra Anadoluda Milli Mücadiləyə qatılıblar. Savaşda Qərargah zabitlərinə ehtiyac olduğundan, ancaq bu zabitlər yalnız bir il təhsil gördüklərindən, böyük hərbdə olduğu kimi, Ankarada Genəlkurmay Rəisliyində 1922 ilində bunlara məxsus üç aylıq bir kurs açılıb və bunun nəticəsində imtahanla qərargah zabiti olublar. Qurtuluş Savaşından sonra bu sinif Yıldızdakı məktəbdə iki il oxuyaraq təhsillərini tamamlayıb. O zaman müxtəlif səbəblərlə qərargah zabiti olmayanlar məktəb təhsilini tamamladıqdan sonra olublar. Bu sinifdən qərargah zabiti olmayan qalmayıb.

Bu sinif Anadoluya gəldikdən sonra İstanbulda Hərb Akademiyasında heç bir sinif qalmamışdı. Buna görə 1921-də İstanbulda bir giriş imtahanı açılıb, 25-ədək zabit məktəbə qəbul edilib və bir il təhsil görüblər. Bunların arasında Şahzadə Faruq əfəndi də vardır. Ancaq İstiqlal Hərbindən sonra Genəlkurmay Başqanlığı bu sinfi qəbul etməyib və təhsillərinə son verib. – Sina Bərköz.

[10] Burada yanlışlıq olduğunu düşünürəm. Mahmud paşa 6 sentyabr 1951 tarixinədək orgeneral (ordu generalı) rütbəsi ilə Milli Təhlükəsizlik Təşkilarının Baş Katibi işləyib, yəni təqribən bir il sonra istefaya çıxıb.





[11] Əsərin tərcümə təşkilatında başda Əbdülqadir İnan olmaq üzrə Prof. Əhməd Cəfəroğlu, korgeneral Xalis Bıyıktay, tümgeneral Nuri Bərköz, Rəşid Rəhməti Arat, Əli Hüseyn Turan (Hüseynzadə Əli bəy), istefadakı podpolkovnik Yaqub Orak, istefadakı mayor Rəmzi Kilərcioğlu, konsul müavini İsmayıl Şərafəddin Yula, Həmdi Tokər, Qaffar Güneyden, Abdullah Battal Taymas, Fuad Toktar, Orxan Şamxal, Əbdülcabbar, Kərim Odər, Həsən Abdullah Ortəkin, Şəfiqə Qaspıralı, Sabur Rəsulun əməyi keçmişdir. – Sina Bərköz.

## QAYNAQLAR

Doç. Dr. Ali Akyıldız. II. Abdulhamid'in çalışma sistemi, yönetim anlayışı ve Babıali'yle (Hükümet) ilişkileri. – Osmanlı siyaset, s. 289.

Ali Birinci. Asya-yı Vusta Seyyahı Kurena Mehmet Emin Beyin Hikayesi. – «Türk Yurdu» dərgisi, mart 2006, c. 26, sayı 223, ss. 72-77.

Azərbaycan dilinin izahlı lüğəti. I cild. Bakı: «Şərq-Qərb» nəşriyyatı, 2006.

Ədalət Tahirzadə. Şəkinin tarixi qaynaqlarda. Bakı: «Master» nəşriyyatı, 2005, s.188.

Hayriye Kerimzade. Mehmet Emin Beyin hayatı. – İstanbuldan Asya-yı Vusta'ya Seyahat. Seyyah Mehmet Emin Efendi'nin Seyahatnamesi. Hazırlayan: Profesör A.Muhibbe Darga. İstanbul: Everest Yayınları, 2007.

İstanbuldan Asya-yı Vusta'ya Seyahat. Seyyah Mehmet Emin Efendi'nin Seyahatnamesi. Hazırlayan: Profesör A.Muhibbe Darga. İstanbul: Everest Yayınları, 2007.

M. Ali Resulzade. Şair İsmail Nakam. – «Azerbaycan Yurt Bilgisi», yıl:3, 27.4.1934, sayı 28, ss.154-155.

Mehmet Yavuz. Berlinde Türk-İslam mimarisi. – Sanat dergisi, s. 89.

«Milliyyət» qəzeti, 17.1.1975, s.3.

«Milliyyət» qəzeti, 10.3.1978, s.5.
«Milliyyət» qəzeti, 19.3.1978, s.6.
«Milliyyət» qəzeti, 25.1.1993, s.10.
Soner Yalçın. Demokrat Parti'nin 'balans ayarı' 6 Haziran 1950 darbesi. – «Hürriyyət» qəzeti, 4 mart 2007. <http://hurarsiv.hurriyet.com.tr/goster/haber.aspx?id=6056843&yazarid=218.
Türk Kurtuluş Savaşı. Belgelerle Türk Tarihi Dergisi Yayını, Istanbul: Menteş Matbaası, 1968, s. 213-217.
Vilayət Quluyev. Türk ordusunun azərbaycanlı generalları. Onların əksəriyyəti əslən Şəkidən olublar. – «525-ci qəzet», 8.11.2008.
Yılmaz Öztuna. Devletler ve hanedanlar. Türkiye (1074-1990). Cilt:2. Ankara, Başbakanlık Basımevi, 1989.
Zəkəriyyə Əlizadə, Nazim İbrahimov. Şəki ipəyi uzaq karvan yollarında. Bakı: «Master» nəşriyyatı, 2007, s.42. Bu kitabda Şəkidə ipəkçiliyin və ipək ticarətinin tarixi, ipək tacirləri haqqında geniş bilgi vardır.
http://en.wikipedia.org/wiki/Nuri_Berkoz.
http://byegmgovtr.xn--ler-1la8h.net/YAYINLARIMIZ/AyinTarihi/1948/temmuz1948.htm.
http://byegmgovtr.xn--ler-1la8h.net/YAYINLARIMIZ/AyinTarihi/1949/haziran1949.htm.
http://culturecityistanbul.blogspot.com/2009/10/dolmabahce-palace-collections.html.
http://www.hanemiz.com/turk-kulturu-ve-medeniyeti/159355-tarihi-haritalar.html. Xəritələrlə bağlı bütün bilgilər bu saytdandır.
http://kurtmeydani.blogspot.com.
http://www.nadirkitap.com/musavver-tarif-i-hayvanat-mehmet-emin-kitap935172.html.
http://turksibersavunmakuvvetleri.tr.gg/T.ue.rkiye-Cumhuriyeti-Kronolojisi--k1-3-k2-.htm.
http://webcache.googleusercontent.com/search?q=cache:DaxoqeLYQRIJ:byegmgovtr.xn--ler-1la8h.net/YAYINLARIMIZ/





Ayin-Tarihi/1949/nisan1949.htm+An%C2%ACkara+Palasta+bir+koktely+vermi%C5%9Flerdir.+Kokteylde&cd=1&hl=ru&ct=clnk&gl=az&source=www.google.az
http://www.zerbaijan.com/azeri/NB_CV.htm.
33. http://www.zerbaijan.com/azeri/HBP_CV.htm.
www.muratdarga.blogspot.com.
http://www.nadirkitap.com/melange-de-poesies-turques-et-persanes-composees-et-traduites-en-francais-m-emin-bey-kitap1236095.html.
Mehmet Koç. Atatürk Akşehirdə. Akşehir Belediyesi Kültür Yayınları. Akşehir, Bahçıvanlar Basım Sanayi A.Ş., 2010, s. 59.
15. Soner Yalçın. Osmanlı Sarayi'nda Bir Sosyalist – Şehzade Abdulkadir. – «Hürriyet» qəzeti, 04.10.2009.
«Türkiyə» qəzeti, 7 sentyabr 2005.
http://www.familysearch.org/Eng/Search/SSDI/individual_record.asp?recid=552604145&lds=3&region=1&regionfriendly=&frompage=99. http://www.zerbaijan.com/azeri/MB_CV.htm.

Bu yazı Türkiyədə – Ankarada çıxan məşhur «Türk Yurdu» dərgisinin 100 illik yubileyinə həsr olunmuş özəl nömrədə (iyul 2011, cild 31, sayı 287, ss. 245-260) dərc edimiş məqalənin Azərbaycan türkcəsinə uyğunlaşdırılmış qəzet variantıdır.

# 10.5. NUXA QALASININ VƏZİYYƏTİ BARƏDƏ MAYOR LİSANEVİÇİN 1819-CU İLDƏ TƏRTİB ETDİYİ

## AKT:

| ORİJİNAL | TƏRCÜMƏ |
|---|---|
|  ВЪ КРЕПОСТИ |  QALADA |
| **Домъ, выстроенный Мамадъ-Гасанъ ханом.** | **Məhəmməd Həsən xanın tikdirdiyi ev:** |
| В первомъ отделенiи онаго главный корпус о двухъ этажахъ. | Onun birinci hissəninin əsas korpusu iki mərtəbəlidir. |
| Въ нижнемъ зала, называемая Диванъ-Ханы, – въ коей и теперь Городовой Судъ, –раскрашенная въ азiатскомъ вкусе; | «Divanxana» adlanan aşağıdakı zal – onda da və indi Şəhər Məhkəməsi, Asiya üslubunda rənglənmişdir. |
| Окошки во всю стену, подымающiася вверхъ желѣзными скобками и набранныя резьбою изъ разноцвѣтныхъ стеколъ, коихъ много повыбито; | Bütün divar boyu pəncərələr dəmir tutacaqlarla yuxarı qaldırılır və oyma naxış içərisində rəngbərəng şüşələrdən yığılmışdır, onlardan da çoxu sındırılıb. |
| главная часть залы по карнизу, по стене и по камину убрана зеркалами, вклеенными въ стену; | Zalın əsas hissəsi – *karniz*)-ın, divarın və buxarının üzəri suvağa yapışdırılmış güzgülərdən yığılmadır. |





| | |
|---|---|
| многiя штуки зеркальныя повынуты и выбиты; | Çoxlu güzgü düşmüş və sındırılmışdır. |
| потолокъ штучный, выкрашенный разноцветно подъ лакомъ и середина набранная штучно зеркалами; | Tavan dənə-dənə hissələrdən təşkil olunub və müxtəlif yağlı boyalarla rənglənib, ortası isə dənə-dənə güzgülərdən yığılmışdır. |
| по сторонамъ две ниши съ дверьми и медными накладками. | Hər tərəfdə bir guşə – qapılı və mis *cəftə*(mətndə: *накладка*)-lı. |
| Въ зале двое дверей створчатыхъ также съ накладками. | Zalın (iki) taylı qapıları da beləcə cəftəlidir. |
| Входъ въ залу съ двухъ прихожихъ комнатъ, по обеимъ сторонамъ залы расположенныхъ. | Zalın içinə giriş zalın hər iki tərəfində olan iki dəhlizdəndir. |
| Через каждую комнату по одному покою также выкрашенному по стенамъ и потолку; | Hər dəhlizdən sonra beləcə divarı və tavanı rənglənmiş bir otaq. |
| въ каждомъ изъ нихъ по два окошка, набранныя изъ разноцветныхъ же стеколъ, из коихъ малая част целая. | Onların hər birində iki pəncərə – eləcə rəngbərəng şüşələrdən yığılıb, onlardan da az hissəsi salamatdır. |
| Входъ въ переднiя комнаты – по каменнымъ лестницамъ о четырехъ ступеняхъ. | Dəhliz-otağın içinə giriş dörd pilləli daş pilləkənlərlədir. |
| Полы въ покояхъ ничемъ не насланы. | Otaqların döşəməsinə heç nə döşənməyib. |
| Въ верхнемъ этаже столько же покоевъ и также расположены как въ нижнемъ. | Yuxarı mərtəbədə də bu qədər otaq var və eləcə aşağıdakılar kimi yerləşir. |
| Стены и потолокъ росписаны подъ лакомъ и съ золотомъ. | Divarlar və tavan yağlı və zərli boyalarla naxışlanıb. |
| Окошки во всехъ трехъ покояхъ во всю переднюю стену, | Hər üç otağın pəncərələri qabaq divara düzülüb, |

| а въ зале и въ задней стене, – подъемныя вверхъ съ разноцветными же стеклами, резьбою набранныя и также выбитыя. | Zalda isə arxa divarda da var – elə, yuxarıya qaldırılan və oyma naxış içərisində rəngbərəng şüşələrdən yığılan, amma şüşələri o birilərinki kimi sındırılıb. |
|---|---|
| Передъ каждой прихожей комнатой маленькое крыльцо; въ полусводе капитальной стены, когео верхъ и половины стены набраны штучно зеркаломъ, во многихъ местахъ разшибеннымъ. | Hər dəhliz-otağın qarşısında kiçik eyvan – əsas divarlarının yarımgünməzində, yuxarının hamısı və divarın yarısı güzgülərdən yıbılıb, amma çox yerində bu güzgülər sındırılmışdır. |
| Входъ въ ое прхожия комнаты по длинной лестнице в каждую особо. | Hər iki dəhlizin içinə giriş hər birinə ayrıca uzun pilləkənlər vasitəsilədir. |
| Краска и позолота вверху покоеве отъ мокроты дождевой, а внизу отъ нечистоты, испорчены. | Boya və zər yuxarıdakı otaqlarda yağış suyundan, aşağıdakılarda isə nəmişlikdən zarab olub. |
| Сзади покоевъ маленькій садикъ съ водоемомъ и испорченнымъ фонтаномъ | Otaqların arxasında kiçik bağça – hovuzlu və xarab olmuş fəvvarəli. |
| Съ правой стороны корпуса по линіи пят покоевъ разной величины с разными сенцами, а съ левой шесть покоев такіе-жь. | Korpusun sağ tərəfində sıra ilə müxtəlif böyüklükdə, müxtəlif oxşarlıqda beş otaq, solunda isə eləcə altı otaq. |
| Паралельно корпусу, на левой стороне воротъ со выходу, мечет домашная ханская со штучннымъ и выкрашенным потолком; | Korpusa paralel, sol tərəfdə giriş darvazası, xanın ev meçidi – tavanı dənə-dənə hissələrdən təşkil olunmuş və rənglənmiş. |
| В ней вдоль стенъ по четыре окошка безъ стеколъ и затворовъ. | Onun içində divar boyu dörd pəncərə – şüşəsiz və *cəftə* (mətndə: *zatvor*)-siz. |
| Съ правой стороны воротъ пять же небольшихъ покоевъ, надъ воротами три покоя с чердакомъ; | Darvazadan sağ tərəfdə beş eləcə böyük olmayan otaq, darvazanın üstündə çardaqlı üç otaq. |





| по какъ сіи покои, такъ и прочие по сторонамъ главнаго корпуса находящіеся, не имеютъ ни дверей, ни окошекъ и во всемъ требуютъ большой поправки. | Həmin otaqlar necə, əsas korpusun digər tərəfində yerləşənlər də elə, qapısız və pəncərəsizdirlər və hamısının əsaslı təmirə ehtiyacı var. |
|---|---|
| Пространство между покоями занъато садикомъ теперь опустошеннымъ. | Otaqların arasında bağça var idi – indi itib-batıb. |
| Передъ главнымъ корпусомъ теперь водоемъ о трехъ отделенияхъ и пяти фонтанахъ, испорченныхъ какъ и водоемы. | Əsas korpusun qarşısındakı üç hissəli və beş fəvvarəli hovuzun, indi özü necə fəvvarələri də elə xarabdır. |
| Под низомъ корпуса, какъ и отъ воротъ впарово, арестантская, а далее конюшки; | Korpusun aşağısında, darvazadan sağda türmə, daha sonra tövlələr. |
| В лево кладовая и амбары во многих отделенияхъ. | Solda anbar və anbar təyinatlı çoxlu tikililər. |
| Вправо во флангъ главгаго корпуса отделенія сего альковъ, до половины с верху и потолокъ расписанный финифтью съ позолотою. | Baş korpusun sağ cinahı boyu onun *yataq otağı* (mətndə: *alkov*) şöbəsi – yuxarısından yarısına qədər və tavanı zərli minalarla naxışlanmış. |
| Въ потолке живописномъ вделано зеркало длиною в аршинъ; | Tavan bir arşın uzunluğunda güzgülərlə bəzədilib. |
| въ стеняхъ были также выделаны четыре зеркала, по теперь вынуты. | Divarlarda da belə dörd güzgü düzəldilmişdi, lakin indi çıxarılıb. |
| По сторонамъ маленькаго дворика отъ главныхъ покоевъ къ алькову закрытаго съ двухъ сторонъ параллельно стенами, | Əsas otaqlardan hərəmxanayadək uzanan iki paralel divar kiçik həyəti bir-biri ilə əlaqəsi olmayan tərəflərə ayırır. |
| есть два небольшиие покоя также параллельно одинъ другому черезъ дворикъ, росписанные живописью и съ золотом, безъ дверей и съ подъемными | Kiçik həyətin içində bir-birinə beləcə paralel iki böyük olmayan otaq var – divarları rəsmlər və qızıl suyu ilə işlə naxışlanmış, qapısız, xarab və təmirə |

| окошками, испорченные и требующіе поправки. | ehytiyacı olan qaldırılan pəncəli. |
|---|---|
| Въ альковe полъ высланъ обделаннымъ камнемъ, по сторонамъ алькова по одному покою просто оштукатуренному безъ дверей же. | Hərəmxanada döşəmə daşlardan döşənib, hərəmxana ərazisində bir otaq qapısız-zadsız, sadəcə, suvaqlanıb. |
| Сзади алькова покой также расписанный, имея въ альковe три окошка безъ стеколъ и въ противную сторону окошко подъемное изъ разноцветныхъ стеколъ мелко набранныхъ | Hərəmxananın arxasındakı otaq da naxışlanıb, hərəmxanada olan üç pəncərə şüşəsizdir və qarşı tərəfin pəncərəsi qaldırılandır, rəngbərəng şüşələrdən *yığılmışdır* (mətndə: *Blko nabrannıxc*) |
| Въ покое зеркала, выделанныя въ стену, выбиты, другіе совсемъ вынуты. | Otaqda divara bərkidilmiş bir güzgü sındırılmış vəziyyətdir, divarda ondan başqa da güzgülər olub, lakin indi yerləri tamamilə boşdur. |
| Съ одной его стороны покой небольшой для поклажи, а другой жилой покой; | Onun (– hərəmxana şöbəsinin) bir tərəfində yük yığmaq üçün bir böyük olmayan otaq, digər tərəfində isə yaşayış üçün otaq. |
| подъ низомъ три небольшие людскіе покоя, имея небольшой дворик; | Aşağıda kiçik həyətə malik üç böyük olmayan yaşayış otağı. |
| Со входу справа место для сада, огроженное плетнемъ. Это построеніе Джафаръ-Кули-Хана. | Girişin sağında çatgahla əhatələnmiş bağ üçün yer. Bu cür tərtibat Cəfərqulu xana məxsusdur. |
| Во второмъ отделеніи дома, занимаемомъ женою Измаилъ Хана, съ приходу маленькій дворикъ, с которого влево входъ по по испорченной лестнице съ деревянными ступенями на тротуаръ, расположонный вдоль покоевъ у самой стены. | Evin ikinci – İsmayıl xanın arvadına aid hissəsində içəri girən kimi kiçik həyət, hansı ki giriş solda – otaqlar boyunca, divarla yan-yanaşı düzəldilmiş səkiyə çıxan taxta pilləli xarab pilləkənlədir. |





| Идя по немъ, с приходу два покоя требующіе исправленъя; | Onunla qalxan kimi qaydaya salınmasına ehtiyac olan iki otaq. |
|---|---|
| далее покой съ выкрашеннымъ потолком, из коего входъ по лестнице каменной въ верхнее жилье; | Daha sonra tavanı rənglənmiş otaq, ondan da daşdan tikilmiş yuxarı yaşayış sahəsinin içinə pilləkənlərlə giriş. |
| въ немъ прихожая, влево одинъ покой, вправо зала расписанная и съ такимъ же потолкомъ. | Onun içində dəhliz, solda bir otaq, sağda isə tavanı naxışlanmış zal. |
| По средиене залы мраморный небольшой водоемъ; | Zalın ortasında mərdərdən düzəldilmiş böyük olmayan hovuz. |
| Из нее входъ въ покой выштукатуренный. | Ondan (zaldan) otağın içinə giriş suvaqlanmışdır. |
| Окошки во всехъ подъемныя, вверхъ набранныя изъ мелкихъ разноцветныхъ стеколъ. | Hamısında pəncərələr qaldırılandır və yuxarıları rəngbərəng xırda şüşələrdən yığılmışdır. |
| На верху чердакъ раскрашенный с золотомъ, имея четыре зеркала в стенахъ целыя и цеылыя окошки; | Yuxarıda zərlə rənglənmiş çardaq, divarlarda olan dörd güzgü salamatdır və pəncərələr də salamatdır. |
| вправо покоя нижняго мыльня о трехъ отделеніяхъ выштукатуренная. | Aşağıdakı sağ otaq – üç hissədən ibarət *qab yuyan yer* (mətndə: *mılğnə*) suvaqlanmışdır. |
| Съ приходу въ ворота кухня, отделенная каменною стеною. | Darvazadan içəri girən kimi keçidinin içində daşdan tikilmiş mətbəx. |
| Въ третьемъ отделеніи, матерью Измаиль-Хана занимаемомъ, со выходу на дворъ в нижнемъ жилье одинъ покой вправо и маленькій садикъ, влево другой покой, а далее черезъ наружный переходъ, разделяющій дворъ на два небольшія отделенія, служащия цвет- | İsmayıl xanın anasına aid üçüncü hissə – həyətə girişdə, aşağı yaşayış sahəsində bir otaq, sağda da balaca bağça, solda başqa otaq, bayır keçiddən sonra isə çiçəkliyə qulluq edənlər tərəfindən iki böyük olmayan hissəyə bölünmüş həyət və içərisi iki suvaqlı taxçası ilə |

| | |
|---|---|
| никами, покой раскрашенный съ двумя выштукатуренными нишами; | birlikdə rənglənmiş otaq. |
| спереди небольшая галлерея и небольшой водоемъ. | Daha irəlidə böyük olmayan eyvan (mətndə: галларея) və böyük olmayan hovuz. |
| Между сими покоями входъ ве верхнее жилье, где вправо лестницы одинь небольшой покой, влево четыре покоя съ галлереею же подъ штукатуркою просто, а на верху чердакъ, требущій поправки как и галлерея. | Bu otaqların arasında isə yuxarı yaşayış sahəsinin içinə giriş, pilləkənin sağında böyük olmayan bir otaq, solda sadə suvaqlanmış eyvanla dörd otaq, yuxarıda qaydaya salınmasına ehtiyac duyulan çardaq, həmçinin eyvanın da qaydaya salınmasına ehtiyac var. |
| Паралельно симъ покоямъ другой рядъ строенія, вмъщающаго в себъ вверху три покоя; | Bu otaqlarla qarşı-qarşıya, yuxarıda, digər tikililər cərgəsini təşkil edən üç otaq. |
| В одномъ изъ нихъ выкрашенномъ зеленою краскою два окошка со стеклами мълко набранными и два безь стеколъ. | Onlardan biri yaşıl boya ilə rənglənmiş, iki pəncərəsi xırda şüşələrdən yığılmış, ikisi isə şüşəsizdir. |
| Спереди простая галлерея, въ концъ которой небольшая кладовая; внизу три покоя для прислуги и кухни. | İrəlidə sadə eyvan, hansı ki, sonunda böyük olmayan anbar, aşağıda qulluqçular üçün üç otaq və mətbəx. |
| Весь домъ сей, исключая алкова, построенъ Мамад-Гасанъ Ханомъ и требует большой поправки. | Bütün ev, bu hərəmxana şöbəsi istisna olmaqla, Məhəmməd Həsən xan tərəfindən tikdirilmişdir və qaydaya salınmasına böyük ehtiyac var. |
| Все три отделенія сіи обнесены с трехъ сторонъ каменною стеною, имеющею по местамъ бастіоны и амбразуры для стрельбы из ружей. | Bütün üç hissə üç tərəfdən bürcləri və tüfəngdən atəş açmaq üçün mazğalları olan daş divarla əhatə olunub. |





| | |
|---|---|
| Вне дома, противъ отделенія замимаемаго женею Измаил-Хана золоженъ домъ Измаилъ-Ханомъ, въ коемъ отделанъ один покой въ восми углахъ о семи окошкахъ с большими стеклами, которыхъ много уже не достаеть | Evdən kənarda, İsmayıl xanın arvadının oturduğu hissənin qarşısındakı evin bünövrəsi İsmayıl xanın göstərişinə əsasən qoyulmuşdur, hansı ki bir otaq səkkiz künclü və böyük şüşələri olan yeddi pəncərəli... İndi vaxtilə həmin pəncərələrdə olmuş böyük şüşələrinin əksəriyyəti yerində deyil. |
| Полъ паркетный неоконченъ; стены обштукатураны с живописными картинами.Построена конюшия, но не окончена. | Döşəmə parketdən döşənib, amma bu iş heç də tam başa çatdırılmamışdır. Tövlə tikilib, da başa çatdırılmayıb. |
| Выше дома ханскаго къ верхним воротамъ домъ о трехъ покояхъ, ветхій, с садомъ, принадлежащій Гаджи-Хану, къ коему принадлежить конюшия и еще флигель, разделенный хойцами на небольшие простые покои. Правее верхнихъ воротъ мечеть изъ сженаго кирпича, построенія также Гаджи-хана и отъ времени много испорченная. | (Məhəmməd Həsən) xanın evindən yuxarıda – yuxarı qapıya doğru Hacı xana aid olan üç otaqdan ibarət, köhnə, bağbağçalı bir ev, yenə ona aid at tövləsi və xoyluların adi otaqlara böldükləri altaçıq (mətndə: флигель). Yuxarı darvazanın sağında, bişmiş kərpicdən inşa edilmiş məscidi də Hacı xan tikdirmişdir və zamanla əlaqədar xeyli xarab olmuşdur. |
| Ниже оной магазинъ провіантомъ занятый; | Ondan aşağıda ərzaqla dolu anbar. |
| ещо ниже кухня ханская, годная только для солдатской кухни. | Daha aşağı yolda yalnız əsgər mətbəxinə uyğun gələn xan mətbəxi. |
| Прочее строеніе, въ крепости занятое солдатми и хойцами, принадлежитъ разнымъ владельцамъ из шекинцовъ. | Qalada şəkililərdən olan müxtəlif nüfuzlu şəxslərə aid tikililər əsgərlər və xoylular tərəfindən tutulmuşdur. |

| Mayor Lisaneviç tərəfindən yazılmış, «Statskiy Sovetnik» Moqilevckiy tərəfindən təsdiq edilmişdir. | (*Казенная экспедиция Верховного Грузинского правительство – Описание Шекинской провинции составленное в 1819 году генерал майором Ахвердовым.*, Tiflis – 1866, Dövlət Tarix Arxivi, fond 24, s/v 72) |
|---|---|
| Qeyd: Yuxarıdakı foto şəkillərin bu sənədə birbaşa aidiyyatı yoxdur, biz onları Əlyazmalar İnstitundan tapdıq, təxmini müəyyənləşdirdik ki 19-cu əsrdə çəkilib və mövzuya uyğun olduğuna görə bu səhifədə yerləşdirdik. | **Rus dilindən tərcümə etdi: Aydın Məmməd** |

## 10.6. NUXA «XAN QƏBİRİSTANLIĞINDAKI BAŞDAŞLARIN KİTABƏLƏRİ HAQQINDA[1]

***M. S. Nemətova***
***Azərbaycan EA Xəbərləri, İctimai elmlər ser. 1961, №6***



Azərbaycanda memarlıq abidələri içərisində mühüm yer tutan memorial abidələrdən başdaşılar üzərində çox vaxt istər paleoqrafiya və istərsə məzmun cəhətdən maraqlı kitabələrə rast gəlmək olur. Bir sıra ictimai-iqtisadi məsələlərdə və eləcə də memarlıq və incəsənət tarixində bunların öyrənilməsi mütləq lazımdır. Azərbaycanda tarixən bir neçə memarlıq məktəbləri olmuş və bir çox görkəmli sənətkarlar yetişmişdir. Hər memarlıq məktəbinin özünə məxsus müəyyən orijinal üslubu olmuşdur. Bu məktəblərin yetişdirdiyi





memar, nəqqaş, xəttat və b. mahir ustaların üslub məsələsində yerli materialların da az rolu olmamışdır. Məsələn, Şirvan – Abşeron memarlıq məktəbinə xas olan yerli material əhəngdaşı üzərində aparılan işi Azərbaycanın şimal–qərb rayonlarındakı çayların gətirdiyi bərk daş layları üzərində tətbiq etmək çətin idi. Usta yumşaq əhəngdaşı üzərində istədiyi mürəkkəb naxışı və ya kitabəni həkk edə bilirdi. Əhəngdaşı üzərində həkk olunmuş kitabələrin şriftləri daha böyük, bəzən hərflərin boyu təqribən 30–40 sm.ə qədər çatırdı. Lakin bərk daş üzərindəki kitabələr daha kiçik, daha yığcam yazılırdı. Buna baxmayaraq, bərk daş üzərində işləyən ustalar gözəl sənət əsərləri yaratmağa çalışmışlar. Bu cəhətdən VIII–XIX əsrlərə aid olan Nuxa və Zaqatala[2] ustalarının işləri çox maraqlıdır. Bu məqalədə, əsas etibarı ilə, Nuxada yerli əhali tərəfindən «Xan qəbristanlığı» adlanan yerdə qalmış Nuxa xanlarına və onların nəsillərinə aid olan başdaşıları üzərindəki kitabələrdən bəhs olunacaqdır. Tarixi ədəbiyyatda qeyd edildiyinə görə, vaxtı ilə həmin yerdə 15 –20-yə qədər qəbir daşı olmuşdur ki, bunlardan 10-u hazırlanma üslubuna görə incəsənət üçün maraqlı üçün maraqlı ola bilər[3].

Burada bərk daşlardan başqa, əhəngdaşı və mərmərdən düzəldilmiş və digər memarlıq məktəblərinə aid ediləcək başdaşılar da vardır. Bunların hamısı Nuxa xanlarının nəslini və XVIII-XIX əsr Nuxa xəttat və nəqqaşlarının işlərini öyrənmək üçün əhəmiyyətlidir. İndi də ayrı-ayrı abidələrin şərhinə keçək.



**Hacı Şəmsəddin bəyin başdaşısı.** Bu başdaşı Nuxada «Xan sarayı»nda saxlanılmaqdadır. Memarlıq abidələrini qoruyan idarənin Nuxa rayon Soveti İcrayə Komitəsinin nəzdindəki şöbəsinin əməkdaşı Ənvər Paşayevin dediyinə görə, həmin daş saxlandığı yerə «Gilək məscidi»nin[4] yanından gətirilmişdir. Başdaşının (1-ci şəkil) yuxarı hissəsində həkk olunmuş şərikləkdirilmiş zanbaq çiçəyi içərisində Təəliq xətti ilə bu sözlər qeyd olun-

muşdur: «1230-cu il tarixdə - سنه التاريخ ١٢٣٠ » . Zanbaq çiçəyindən aşağıdakı düzbucaqlıya olan keçiddə süls xətti ilə «Rəbiüləvvəl ayının 12-də yazıldı رفىحر" الاولى ربيه شهر١٢ " sözləri oxunur. Daha sonra düzbucaqlı içərisində iki sətirdə belə yazılmışdır: حاجى اوغلى بگنك حجعبدالرحمن فاتحه ونچاي شريفى روحى بكينك شمسالادين

Kitabədən aydın olduğu kimi, başdaşı Hacı Əbdürrəhman bəyin oğlu Hacı Şəmsəddin bəyin qəbri üzərində olmuşdur. Başdaşı 1230-cu il rəbiüləvvəlin 12-də (22.02.1815) yazılmışdır. Kitabədə adı çəkilən Hacı Əbdürrəhman Nuxa xanı Səlim xanın oğlu olmuşdur[5]. Hacı Şəmsəddin isə onun nəvəsidir

**Fətəli xanın başdaşısı.** Fətəli xanın epitafiyasının (2-ci şəkil) dövrəsi qərənfil çiçəklərindən hörülmüş haşiyə ilə əhatə olunmuşdur. Başdaşının yuxarı hissəsində qərənfil, zanbaq, altıyarpaqlı çiçək, sətirlərarası haşıyələrdə isə çiçək yarpaqları toxuması həkk olunmuşdur. Başdaşının orta hissəsində ərəb dilində nəsx xətti ilə beş sətirdə həkk olunmuş kitabənin oxunuşu belədir:

هذا مرقد الاميرالكريم المرحوم جليل المرحوم الشوكة والشان
فتحعلى خان ابن الاميرالكريم المغفوراجل الخوانين
العظم حسين خان ادخلهماالله تعالى فى اعلى الجنان
قدارتحل من دارالفناء الى دارالباء ومات فى ثانى من
هرجمادى الاخر فى يوم الجمعه بعد الظهرالتاريخ قى سنه ١٢٣٠

T ə r c ü m ə s i: *Bu qəbir, kəramətli ağa, əmir, bağışlanmış, xanların böyüyü, əzəmətli Hüseyn xanın oğlu – allah, onların hər ikisini cənnətlərin ən yüksəyində yerləşdir, rəhmətlik kəramətli əmir, şə'n-şövkətli, böyük Fətəli xanınındır. 1230-cu il tarixdə, cəmadiülaxır ayının ikisində puç və mənasız həyat evindən daimi evə köçdü və vəfat etdi.*

Qeyd olunan sətirləri əhatə edən ikiqat haşiyələrdə aşağıdakı sözlər oxunur;

Sol haşiyədə:

فهب لى زلتى فاغفر ذنوبى
فانك غافر الذنب العظيم





يامن بك حاختى و روحى بيديكَ
عن غيركَ آعرضت و اقبلت الليك
لالى عمل صالح و استظهر به
قد جئتك راجنا توكلت عليك

T ə r c ü m.ə s i: *Bizim səhvlərimizdən keç və günahlarımızı bağışla. Sən doğrudan da böyük günahları bağışlayansan, ey (Allah), mənim ehtiyacım sənədir və canım sənin əlindədir. Başqasından üzr çevirib, sənə doğru döndük, mənim arxalana biləcək heç bir yaxşı işim yoxdur, sənə ümid bağlayaraq təvəkkül edirəm.*

Sağ haşiyədə:

فك بعين جود الو فى تامل
كالجنان الدنيه الدنيا ترى
بقيي سوف جميعا فيها و
نوالجلال ربك جه و ويبقى
اهلا للفردوس لست الهى
الجحيم نار على قوى ولا

T ə r c ü m ə s i: *Kainata fikir gözü ilə baxsan, düşünsən, alçaq dünyanı cənnət kimi görərsən, Bütün ondakı mövcud şeylər puç olacaqdır; ancaq sənin, cəlal sahibi Allahının üzü baqi qalar. Ey mənim Allahım, cənnət əhli deyiləm, cəhənnəm oduna da tabım yoxdur!*Aşağı haşiyədə:

فليس الى من سوالك شفيع

T ə r c ü m ə s i : *Mənim üçün səndən başqa vasitəçi yoxdur.*

Yeri gəlmişkən, qeyd etmək lazımdır ki Fətəli xanın başdaşısı və ümumiyyətlə «Xan qəbristanlığı»ndakı başdaşıların kənarı çatmatağ formasında bişmiş kərpiclə hörülmüşdür. Fətəli xanın başdaşısının sağ tərəfi uçulub tökülmüş və bu kiçik təsadüf, böyük və maraqlı bir məsələnin üstünü açmışdır. Vaxtı ilə kərpic tikinti alında qalmış başdaşının sağ tərəfində bir neçə kəlmə, bir-birindən əlaqəsiz sözlər yazılmışdır. Bu kəlmələrdən bəzisi tamamilə aydın oxuna biləcək dərəcədə, bəzisi isə ayırd edilməsi mümkün olmayan şəkildə yazılmışdır ki, bunların da, abidəni işləyən ustaların imzası olduğunu güman etmək olur.

Həmin kəlmələrdən شكرى - *Şükri* sözü aydın oxunur. Buna əsasən demək olar ki, Nuxa abidələrini işləyən birinin adı və ya təxəllüsü *Şükri* olmuşdur. Bu abidələri incəsənət nöqteyi-nəzərindən öyrənən memar Nərgiz Əsgərova, oradakı işlərin hamısını həmin ustaya aid etmişdir.[6] Lakin qeyd olunan daş üzərində Şükrinin adından başqa, digər imzaların da olması Nuxa «Xan qəbristanlığı»nda olan bərk daşı üzərindəki bütün işlərin hamısının bir ustaya deyil, bir neçə şəxsə aid olduğunu göstərir. Abidələrdən məlum olduğu kimi, ustalar çox vaxt öz işləri üzərində adları ilə yanaşı, peşələrini – memar, bənna. Həkkak, xəttat, nəqqaş və bu kimi sənət sahibi olduqlarını qeyd edirlər.

İndiyə qədər məlum olan abidələr üzərindəki epiqrafik sənədlərə əsasən, demək olar ki, bəzən bir usta eyni abidə üzərində bir neçə iş aparmışdır. Məsələn, daşın üzərindəki naxışları çəkmiş, kitabələri yazmış və daşa həkk etmişdir və yaxud bunun əksinə. Bəzən eyni bir abidəni müxtəlif ustalar işləmiş, məsələn, biri naxışlarını çəkmiş, ikincisi kitabəsini yazmış, üçüncüsü isə bunları daşa həkk etmişdir.

Deməli, bir usta həm nəqqaş, həm xəttat və həm də həkkaklıq sənətini bilməklə, abidəni hər cəhətdən təkbaşına işləyərək yaratmışdır. Buna XVII əsrə aid usta Məhəmməd Salehin, XIX əsrin birinci yarısında Gəncədə yaşayıb-yaratmış Mirzə Mehdinin işlərini misal göstərmək olar[7].

Qeyd olunanlara əsasən, ehtimal etmək olar ki, eyni usta tərəfindən yaradılmış abidə müstəqil işləyən ustalara aiddir. Bunun əksinə olaraq, bir neçə sənətkar tərəfindən işlənmiş abidələri bir sıra sənətkarın əməyini bir yerdə birləşdirən, artıq XVIII – XIX əsrlərdə müəyyən əmək bölgüsünə malik sənətkar qruplarının «emalatxana»sının məhsulu hesab etmək olar. Ona görə də Fətəli xanın başdaşısı üzərindəki imzaların bir yerdə işləyən müxtəlif ustalara aid olduğunu desək, səhv etmiş olmarıq.

Biz buna 1957-ci ilin yayında Bərdədə işlədiyimiz zaman, bir sinə daşında Fətəli xanın başdaşısında olduğu kimi, bir neçə kiçik imzalara (3-cü şəkil) rast gəlməklə, daha da əmin olduq.





Burada, Nuxa abidələrindən fərqli olaraq, imzaların yanında sənətkarların peşələri qeyd edilmişdir[8]. Nuxa abidəsi üzərindəki usta adı və imzalarının görünməz yerdə yazılması, həmin ustaların ictimai vəziyyətini öyrənmək üçün də maraqlıdır. Kitabədə adı çəkilən Fətəli xan, Şəki xanı Hüseyn xanın oğludur. Fətəli xan qonşu dövlətlərin köməyindən istifadə edərək, xanlıq uğrunda mübarizə aparan qardaşları Məhəmmədhəsən və Səlim xanın hakimiyyətdən uzaqlaşdırılması ilə əlaqədar olaraq, bir neçə dəfə Şəkidə xanlıq etmişdir. Onun xanlığı hər dəfə çox azmüddətli olduğu üçün, o, Şəki xanlığında görkəmli rol oynaya bilməmişdir. Fətəli xan hicri 1198 (= 1783/4)-ci ildə hakimiyyət başına gələn qardaşı Məhəmmədhəsən xan tərəfindən kor edilmişdir. Şəki xanlığını öz vassalına çevirməyə çalışan Şirvan hökmdarı Mustafa xan hicri 1219 (+1804/05)-cü ildə Şəkidə taxt-tac uğrunda mübarizə aparan hər iki qardaşı –Məhəmmədhəsən və Səlim xanı Şirvana gətirdib Şeyx Əli bəyi Nuxaya naib təyin edir[9].

Bundan narazı olan nuxalılar, 1219 (+1804/05)-cu ildə Fətəli xanı yenidən xan seçirlər. Bu əhvalatı eşidən Mustafa xan, Səlim xanı azad edir. Səlim xan Nuxa bəyləri ilə əlaqəyə girərək, gözlənilmədən Nuxaya hücum edib Fətəli xanı hakimiyyətdən devirdi. Bu dəfə Fətəli xan iki-üç ay xanlıq etmişdir. Daha sonra rus qoşunlarının Şəkiyə gəlməsi ilə əlaqədar, Fətəli xan yenə xan təyin edildi. Fətəli xandan sonra Şəki xanlığı Xoy xanlarından Cəfərqulu xanın əlinə keçdi[10]. Epitafiyadan aydınlaşdığına görə, Fətəli xan 1814-cü il mayın 11-də vəfat etmişdir[11]. Xanlıqdan isə 1804/05-ci illərdə kənar edilmişdir. Fətəli xanın Kərim ağa adlı ancaq bir oğlu olmuşdur[12]. Tarixi ədəbiyyatda səhv olaraq Əbdüllətif Əfəndinin adına yazılmış «Şəki xanlarının ixtisar üzrə tarixi» adlı əsərin müəllifi də Fətəli xanın oğlu Kərim ağa olmuşdur. Kərim ağa «Fateh» təxəllüsü ilə bir sıra şeirlər də yazmışdır[13].

**Kərim ağanın başdaşısı üzərindəki kitabə.** Kərim ağanın epitafiyası (4-cü şəkil) bərk daş üzərində xüsusi ustalıqla işlənmişdir. Başdaşı bütöv bir daşın üzərində çatma tağ formasında

həkk olunmuş, dövrəsi isə bişmiş kərpiclə tikilmişdir. Başdaşının çatma tağlı yuxarı hissəsində şana gülü, altıyarpaqlı çiçək və b. bitki naxışları həkk olunmuşdur. Abidənin kitabə olan hissəsi və kitabələrin sətirarası boşluqları çiçək naxışları ilə bəzədilmişdir. Çiçək haşiyələrindən içəridə Quran ayəsi yazılmış kitabələrdən əmələ gətirilmiş ikinci bir haşiyə də vardır ki, bu abidəyə xüsusi gözəllik verir. Usta-həkkak buradakı kitabələrdən, eyni zamanda başdaşını bəzəmək məqsədinə böyük məharətlə istifadə etmişdir.

Ərəb dilində Nəsx xətti ilə yazılmış kitabələr belə oxunur;

Sağ haşiyədə:

الهی لست للفر دوس اهلا
ولا احری لی نار الجحیم فهب لی زلتی فاغفر ذنوبی
فانك غافرالذنب العظیم

T ə r c ü m ə s i: *Ey mənim Allahım, cənnət əhli deyiləm, cəhənnəm oduna da ləyaqətim yoxdur. Mənim günahlarımı bağışla və səhvimdən keç, çünki sən böyük günahları bağışlayansan!*

S o l h a ş i y ə d ə:

تجاوز عن ضعیف قد اتاك
مفراً بالذنوب قددعاك
فان ترحم فانت اهل لذاك
و ان تطرد فمن یر حم سواك

T ə r c ü m ə s i : *Sənin yanına gələn zəifin günahından keç. Öz günahlarını iqrar edərək səni çağırır. Əgər rəhm etsən, sən buna layiqsən, əgər qovsan, səndən başqa kim ona rəhm edər*?!

O r t a d a :

هذا مر قد الامیر الکریم جلیل الشو کة و
الشان خادم الفرقان عالیجاه کریم آقا بن الامیر
الاکریم علیجاه فتحعلی خان اسکنهما الله فی الجنان وقف
و قد ار تحل من الفناء الی البقاء فی خمس و سبعین و ماتین بعد الف
و قد توفی جماد الاولی فی یوم الرابع

T ə r c ü m ə s i : *Bu qəbir, yüksək cəlallı, kəramətli əmir, Fətəli xanın oğlu, şə'n-şövkətli əmir, Qurana xidmət edən bəxşişkar, alicah Kərim ağanındır – Allah onların hər ikisini cənnətdə yerləşdirsin – doğrudan da (onun qəlbi) dayandı və min iki yüz yetmiş beşinci ildə puç evdən daimi evə köçdü, yəni vəfat etdi. Cəmadiüləvvəl ayında dördüncü gün vəfat etmişdir (=7. XII 1858*[14]*)*.





Yuxarıda qeyd edildiyi kimi, Nuxa xanlığı Fətəli xandan sonra Xoy xanlarının idarəsi altına keçdiyi üçün, Kərim ağa Nuxada xan olmamışdır[15].

Onun dövlətdə nə kimi rol oynadığı da bəlli deyildir. Lakin Kərim ağa «Şəki xanlarının ixtisar üzrə tarixi» əsərində göstərir ki, o hələ kiçik yaşlı olduğu zaman Şirvan xanı Mustafa xan, Fətəli xanla dostluq əlaqəsini möhkəmləndirmək bəhanəsi ilə, onun Şirvana göndərilməsini xahiş etmişdir. Mustafa xanın Səlim xanla birlikdə ona qarşı sui-qəsd hazırlanmasından xəbəri olmayan Fətəli xan, kiçik yaşlı oğlu Kərim ağanı hicri 1219 (=1804/05)-cu ildə Mustafa xanın yanına göndərmişdir. Uzun müddət Şamaxıda yaşamış Kərim ağa, ancaq rus çarı tərəfindən Xan təyin olunmuş Cəfər Qulu xanın vaxtında, hicri 1244-cü ildə, zülqədənin 20-də (25.V. 1828[16]) qayıtmışdır[17][18].

**Hüseyn xanın qızının başdaşısı.** Bütöv bir daşa çatma tağ formasında həkk olunmuş bu başdaşının (5-ci şəkil) kənarı, nəbati naxışlar ilə haşiyələnmişdir. Yuxarı hissədə simmetrik şəkildə cürbəcür çiçəklər, aşağı hissədə isə beş sətirlik kitabə vardır. Kitabə yazılmış orta hissənin sağ və sol kənarlarında hədis yazılmışdır. Kitabələr uzunsov xonçalar içərisində yazılmışdır. Xonçaların aralarında boş qalan yerlər isə ucu şiş yarpaqlı çiçəklərin harmonik toxumasından ibarət nəbati motivlər ilə bəzədilmişdir.

Kitabənin oxunuşu belədir;

sol haşiyədə:

الهی لسب للفردوس اهلا
و لا (قوی) علی نارالجحیم
فهب لی زلتی فاغفر ذنوبی
فانك غافر الذنب العظیم

T ə r c ü m ə s i : *Ey mənim Allahım, cənnətə layiq deyiləm,*

*cəhənnəm oduna da davamım yoxdur. Mənim günahımı bağışla və səhvimdən keç. Çünki sən böyük günahları bağışlayansan.*

*Sağ haşiyədə: [olmalıdır* اتاك*]*

[19]تاجاوز عن ضيعيف قد اتيك
مقير أ بالذنوب قد دعاك
فانت احل لذاك[20]فان تغفر
و ان تطرد فمن يرحم سواك

T ə r c ü m ə s i : *Sənin yanına gələn bir zəifdən keç. Günahlarını iqrar edərək, səni çağırır. Əgər rəhm eləsən, sən buna layiqsən, əgər qovsan, səndən başqa ona kim rəhm edər?*

O r t a d a:

هذ (ا) مر قد المرحومة المغفورة
المبروزة الكريمة
النبيئة النجيبة السيدة العالية النسيبة عمدة الخو اتين العليات درة التاج المخدرات
جنة الجا ( يگاه) جميله خانم بنت الامير الكريم و المولي الجليل عظيم صاحب
الشو كت الشان
حسين خان ادخله الله تعالى فى سرا ئر الجنان قد ار تحلة من بيت الفناء الى
دار البقاء فى اواخر شهر ربيع الاول توفى
فى يوم الا ثنين تاريخ سنة احدى خمسين و ماقين و بعد الف ۱۲۵۱

T ə r c ü m ə s i : *Bu qəbir, böyük, şə'n-şövkətli, kəramətli əmir, yüksək ağamız Hüseyn xanın qızı mərhum, günahı bağışlanmış, xeyirli bəxşişkar, nəcib, ağıllı, tərbiyəli, ali rütbəli xanım, qadınların etimadı edilmişinin nəslindən olan ismətlilərin tacının incisi, cənnət məkanlı Cəmilə xanımındır. Yüksək Allah onların hər ikisini Cənnət taxtlarında əyləşdirsin. Fanisindən daimi evə həqiqətən, rəbiüləvvəl ayının axırında köçmüşdür. Min iki yüz əlli birinci il tarixdə, ikinci gündə vəfat etmişdir.1251 (=27.VI 1835)*[21].

Kitabədən aydın olduğu kimi, epitafiya Nuxa xanı Hüseyn xanın qızınındır.

**Göyçək xanımın başdaşısı.** Göyçək xanımın başdaşısı (6-cı şəkil) da bərk daşdan hazırlanmışdır. Naxışları və kitabəsinin








xətti və ümumiyyətlə, hazırlanma üslubu ilə yuxarıda qeyd olunan epitafiyalara bənzəyir. Nəbati motivlər eyni ilə burda da təkrar olunmuşdur. Lakin buna baxmayaraq, bu başdaşını digərlərindən ayıran xüsusiyyət də vardır. Başdaşının çatma tağ formasında olan hissəsi nəbati naxışlar motivi ilə haşiyələnmışdir. Həmin nəbati motivli haşiyə aşağıya. Spitafiyanın kitabəli hissəsinə endikcə, yazılarla əvəz olunur.

Ortada həkk olunmuş, içərisində yazı yerləşən uzunsov rozetkaların arası isə halqavarı surətdə bir-birinin içərisindən keçən bitki motivləri ilə bəzədilmişdir. Süls və nəstə'liq xətti ilə yazılmış kitabələrin oxunuşu belədir;

Sol haşiyədə:

الهى عبدك العاصى اتاك
مقيراً بالذنوب قد دعاك
فان تغفر فانت اهل لذاك
و ان تطرد فمن يرحم سواك

T ə r c ü m ə s i : *Ey mənim allahım! Üsyankar qulun günahlarını iqrar edərək səni çağırır. Əgər günahlarından keçsən, buna layiqsən. Əgər qovsan, səndən başqa kim rəhm edər?*

Sağ haşiyədə:

يا من بك حاجتى و روحى بيدك عن غيرك اعرضت
و اقبلت اليك
لالى عمل صاليح استظظهر به
قد جئتك راجناً توكلت عليك

T ə r c ü m ə s i : *Mənim ehtiyacım vardır. Səndən, başqasından üz döndərib, sənə tərəf üz çevirdim. Mənim arxalana biləcəyim bir düzgün işim yoxdur. Sənə təvəkkül ümidi ilə yanına gəlirəm.*

O r t a d a :

هذا مرقدالمرحومة المغفورة المبرورة الكرمة النبيلة النجيبة
عمدة الخواتين العليات درة التاج المخدرات كوكوجك خانم
بنت الامير الكريم و المولى الجليل الفخيم عظيم الشو كة و الشان

حسين خان خلد الله هما فى سرائر الجنان قد ار تحلت من دار الفناء الى
دار البقاىٔ فى خمس و ستين و ماتين بعدالف فى شهر رجب فى سنه ١٢٢٥

T ə r c ü m ə s i : *Bu qəbir şə'n şövkətli, kəramətli əmir, yüksək məlik, Hüseyn xanın qızı, bəxşişkar , xeyirli, nəcib, bağışlanmış, mərhumə, ali rütbəli xanımların seçilmişi, ismət tacının incisi – Göyçək xanımındır. Allahtala onları cənnət taxtlarında yerləşdirsin, fani evdən daimi evə min iki yüz almış beşinci ildə (1265), rəcəb ayında köçmüşdür.*

Kitabədən göründüyü kimi, Hüseyn xanın qızı Göyçək xanım hicri 1265-ci ilin rəcəb ayında (=23.V. 1846)[22] vəfat etmişdir. Hacı Seyid Əbdülhəmidin «Şəki xanları və onların nəsilləri» əsərində Göycək xanımın adı çəkilmir. Səhv etmədən, demək olar ki, həmin kitabə Şəki xanlarının nəsillərinin boş qalan hissələrini doldurmaq üçün kömək edər.







**Əbdülhəmid ağanın başdaşısı.** Mərmərdən hazırlanmış bu başdaşı (7-ci şəkil) da Nuxada «Xan qəbristanlığı»ndadır. Beş sətirlik kitabəsi olan abidə çatma tağ formasında həkk olunmu nəbati naxışlar ilə bəzədilmişdir. Çiçəklərin içərisində ibriq, xəncər və qılınc şəkilləri vardır.

Nəsx xətti ilə yazılmış kitabənin oxunuşu belədir:

[23]كل من اليها فان و يبقى و جه ربك ذو الجلال والاكرام
الموت كاس كل ناس شاربه و القبر باب كل ناس داخله





هذا قبر المرحوم المغفور المعقول من دار الغرور الى
دار القرار و هو الامير الكريم العبد الحميد اقا بن عبدالهاشم اقا من نسل بلده
نخو خانو
غفر الله لهم و لجميع المسلمين و المسلمات آمين وفى سنة ١٢٧١

T ə r c ü m ə s i : *Bütün yaranmışlar puçdur, rəbbim, sən daimisən, rəbbim, sənin kəramətli və cəlallı üzün əbədidir. Ölüm bir qədəhdir ki hamı ondan içməlidir, qəbir bir qapıdır ki hamı ondan keçməlidir. Bu qəbir mərhum, bağışlanmış, qəflət evindən istirahət evinə köçmüş, Nuxa xanlarının nəslindən olan Əbdülhəşim ağanın oğlu, kəramətli əmir Əbdülhəmid ağanındır. Allah onların hər ikisini və bütün müsəlman qadın və kişiləri bağışlasın. 1271-ci ildə (=1854/55)*[24] *yazılmışdır.*

Kitabədə adı çəkilən Əbdülhəmid ağanın atası Əbdülhəşim ağa, Nuxa xanı Məhəmmədhəsən xanın oğludur[25].

**Güllü xanımın başdaşısı.** Güllü xanımın başdaşısı (8-ci şəkil) bərk daş üzərində yuxarıdan çatma tağ formasında düzəldilmişdir. Epitafiyanın dövrəsi çiçək naxışları həkk olunmuş ensiz haşiyə ilə əhatə edilmişdir. Yuxarı hissəsində nəbatı naxışlar, aşağıda isə kitabələr yazılmışdır. Ortada dörd sətirdə yazılmış kitabələr üç tərəfdən, içərisində hədis və quran ayələri həkk olunmuş kiçik xonçalar ilə əhatə olunmuşdur. Ərəb dilində nəsx – süls xətti ilə yazılmış orta kitabələr xırda çiçək yarpaqları ilə bəzədilmişdir. Kitabələrin oxunuşu belədir;

O r t a d a :

هذا مرقد المرحومة الكريمة النجبة گلى خانم بنت
الامير الكريم نجب النجباء العظام كريم آقا اسكنهما الله تعا(لى)
فى عيشيه راضيه و فى جنة عالية رحمهما الله و قد توفت فى سنة
خمس وسبعين وبعد الف و ماتين فى شهر ربيع الاخر يوم انى و عشر ين

T ə r c ü m ə s i : *Bu qəbir əzəmətli, nəciblərin ən nəcibi, bəxşişkar əmir Kərim ağanın qızı, mərhumə, nəcib, kəramətli Güllü xanımındır. Allah onların hər ikisinə rəhmət eləsin. Min iki yüz yetmiş beşinci ildə, rəbiülaxır ayının onikinci günü vəfat etmişdir* (19.11.1858).

Sağ haşiyədə:

تامل فی الو خود بعین فکر
تری الدنیا الدنیا کالجنان
و مافیها حمعا سوف یبفتی
وجه ربك ذو الجلال
لقد خطر فیها لو تاملت خطبها
الاکل شیء ما خلا الله باطل

T ə r c ü m ə s i :

*Varlığa fikir gözü ilə bax,*
*Alçaq dünyanı cənnət kimi görərsən!*
*Səndən başqa bütün hər şey tez puç olar.*
*Ancaq sənin cəlallı üzün əbədidir.*

*Onda xatirimdən keçdi ki, əgər onun böyüklüyünü fikir* etsən[26]
*Allahdan başqa hər şey puçdur!*







Sol tərəfdə:

محمد سید الکونین و الثقلین
فی الفریقین من غروب

T ə r c ü m ə s i :

*Məhəmməd hər iki dünyanın, varlığın cənnətə və cəhənnəmə gedənləri ağasıdır.*

Kitabələrdən göründüyü kimi, Fətəli xanın nəvəsi və Kərim ağanın qızı Nuxada yaşayıb, orada da dəfn olunmuşdur.

**Məhəmmədhəsən xanın qızı Tutu ağanın başdaşısı.** Tutu ağanın başdaşısı (9-cu şəkil) aşağı hissədən dar, yuxarı qalxdıqca enli və üçpərli tağ formasında, badamlı daşından düzəl-





dilmişdir. Başdaşının üz tərəfi içərisində nəsx–süls xətti ilə kitabələr yazılmış uzunsov rozetkalar və mahiranə həkk olunmuş çiçəklər vardır. Arxa tərəfdə isə içərisində simmetrik surətdə zanbaq və başqa çiçəklər həkk olunmuş güldan çəkilmişdir. Başdaşının yanlarında içərisində nəstə'liq xətti ilə ərəb dilində kitabələr yazılmış uzunsov rozetkalar vardır. Orada olan digər başdaşılarından fərqlənən həmin epitafiya öz gözəlliyi ilə qəbristana daxil olan hər bir tədqiqatçıya vaxtı ilə çox mahir bir ustanın yaşayıb-yaratdığını xatırlatmaqdadır.

Başdaşının üz tərəfindəki kitabənin oxunuşu belədir:

هذا مر قد المرحومة المبرورة
خاتون معظمه وبانوی مکرمه حاجی طوطی اغا بنت عالیجاه
محمد حسن خان طاب اله ثراهما

Sağ tərəfdə:

الف و ماتان و سبعون و ست
یا شفیع المذنبین سینده ایت مرحمت

Sol tərəfdə:

صاحب قبره الهی ایله عفو و مغفرت

T ə r c ü m ə s i :

*Bu qəbir alicah Məhəmmədhəsən xanın qızı, mərhumə, xeyirli, əzəmətli xatun, hörmətli xanım Hacı Tutu Ağanındır – allah onların torpağını pak etsin! Min iki yüz yetmiş altıncı ildə.*

*Ey qiyamət gününün şafei, bu xanıma rəhmət et. Ey mənim allahım, bu qəbir sahibini bağışla və günahından keç.*

*Kitabələrdən göründüyü kimi, Nuxa xanı Məhəmmədhəsən xanın qızı Tuyu ağa hicri 1276*[27] *(=1859/60)-cı ildə nuxada vəfat etmiş və «Xan qəbristanlığında dəfn edilmişdir. Əbdülhəmidin yazdığına görə, o, İsmayıl xanın qadını olmuşdur. İsmayıl xandan onun iki qızı varmış*[28]

**Səltənət bəyimin başdaşısı.** Qırmızımtıl mərmərdən hazırlanmış həmin başdaşının (10-cu şəkil) yuxarısı yarımdairə şəklindədir. Başdaşının dövrəsi ucu şiş səkkizyarpaqlı çiçəklər və çiçək saplaqlarının harmonik toxunmasından əmələ gətirilmiş



nazik qaytan ilə haşiyələnmişdir. Başdaşının əsas bəzəyini təşkil edən süls xətti ilə yazılmış kitabələrin oxunuşu belədir:

يا غافر الذنوب
هو الحی الذی
لايموت
کل من عليها فان و يبقی و جه ربك
کل نفس ذايقة[29]ذوالجلال و الاکرام
الموت ثم هذا مرقد[30]الينا ترجعون
المرحومة المغفورة سلطنت بکيم
بنت عاليجاه اسکندر خان و له ملك
نادی (نياذی) کل يوم لدواللموت و انبو للخراب
فی شحر ۲۲ صيام سنه ۱۲۸٥ مرحوم شد



Tərcüməsi: *Ey günahları bağışlayan, ölməyən canlı ancaq odur. Bütün canlılar puç olacaqdır. Rəbbim, daimi olan sənin cəlallı, kəramətli üzündür. Bütün yaranmışlar ölümə məhkumdur, sonra bizə tərəf qayıdacaqsınız. Bu qəbir ali rütbəli İsgəndər xanın qızı, mərhumə, bağışlanmış Səltənət bəyimindir. 1285-ci ilin ramazan ayının 22-zxdə vəfat etmişdir (=5.1.1869).*

**Əbdülhəmid ağanın qızı Telli bəyimin epitafiyası**[31]. Ağ mərmərdən düzəldilmiş epitafiya (11-ci şəkil) nəstə'liq xətti ilə fars-ərəb dillərində yazılmış kitabələr və nabatı ornamentlər ilə bəzədilmişdir. Başdaşının orta hissəsindəki süls xətti ilə yazılmış beş sətirlik kitabə ərəbcə belə oxunmuşdur:

هذ( آ) المرحومه المغفورة المبرورة
تلی بگيم بنت عاليجاه عبدالحميد اقا
المعروف بشکی خانوف غفر الله





لها و لو الديها بحرمة الفاتحه
و قد توف فی سنه ۱۳۱٥

T ə r c ü m ə s i : *Bu qəbir Şəkixanov (kimi) tanınan, ali rütbəli Əbdülhəmid ağanın qızı, rəhmətlik, bağışlanmış, xeyirli Telli bəyimindir – allah onu və valideynlərini bağışlasın – hörmətlə, fateha və 1317-ci ildə vəfat etmişdir.*

Başdaşının sağ və sol tərəfindəki xonçalar içində fars dilində nəstə'liq xətti ilə kitabələr həkk olunmuşdur:

ای مدر فرخنده بکنيك نظری من
از گردش ايام چه آمد بسر من
من تازه گلی بودم اندر چمن باغ
نشگفته گلی بال ومن خزان ريخت
کشيده است فلك بر سينه ام داغ
نه گل چيدم، نه بوسيدم در اين باغ

T ə r c ü m ə s i :

*Ey xoşbəxt ana, mənə bir bax,*
*Dünyanın dövr eləməsindən gör başıma nə gəldi.*
*Mən çəmən bağında təzə bir güldüm,*
*Hələ açılmamışkən xəzan yarpağımı və qanadımı tökdü.*
*Fələk sinəmə çəkmişdir dağ,*
*Nə gül dərdim, nə qoxudum bu bağda.*

Kitabədə adı çəkilən Əbdülhəmid ağa Nuxa xanı Fətəli xanın oğludur[32].

Yuxarıda qeyd olunan abidələr 18014 -1858-ci illərə aiddir. Həmin qəbristanlıqdan tapılan digər başdaşının kiçik bir parçası (12-ci şəkil) üzərində 1209 (=1794)-cü il tarixi qeyd edilmişdir. Bundan başqa, Azərbaycanın şimal-qərb rayonlarında bərk daş üzərindəki eyni üslublu kitabələrə rast gəlmək olur ki, onların tarixi daha qədimə gedib çıxır. Bunlara əsasən demək olar ki, şimal-qərb rayonlarının özünə məxsus memarlıq məktəbi və xüsusi üsluba malik olan xəttat və nəqqaşları olmuşdur. Həmin xəttat, nəqqaş və həkkaklıq yuxarıda qeyd edildiyi kimi, öz işlərini çayların laylarla gətirdiyi bərk daşlar üzərində aparmışlar. Bərk daş üzərində həkkaklıq işi aparılmasının nisbətən çətin olmasına

baxmayaraq, bu işin ustaları çətin ornament kompozisiyalarından əl çəkməmişlər. Onlar nəbati ornamentlərlə işlədikləri abidələrin bəzək elementlərinə epiqrafik motivlər də əlavə etmişlər. Bu abidələr üzərində nəbati və həndəsi ornamentlərə oxşayan ərəb əlifbasından bir bəzək elementi kimi çox məharətlə istifadə edilmişdir.

Qeyd olunan bərk daşdan hazırlanmış abidələr içərisində Kərim ağanın başdaşısı naxışlarının mürəkkəbliyi və qabarıqlığı ilə seçilir. Burada usta nəbati ornamentlərdə həkk etdiyi çiçəkləri daha canlı verməyə çalışmışdır.Kitabələr, əsas etibarı ilə, süls xətti ilə yazılmışdır. Lakin haşiyədə yazılan kitabələr nəstə'liq xətti ilə həkk edilmişdir. Xəttat az bir yerdə çox söz yerləşdirməklə bərabər, kəlmə və hecaları dal-qabaq yazmaqla, kitabə yazılan xonça (rozetka) və düzbucaqları, eləcə də abidəni bəzəmək məqsədi ilə bir-birinə oxşar hərflərdən simmetrik bir bəzək elementi yaratmağa çalışmış və bunun öhdəsindən məharətlə gəlmişdir. Kitabələr hərəkələnmiş, nöqtələr qoyulmuş, boş qalan yerlər isə çiçək yarpaqları ilə bəzədilmişdir. İstər kitabələrin və istərsə nəbatı naxışların həkk olunmasında həkkakın diqqətli olmasına baxmayaraq, materialın sərtliyi nəticəsində bəzi yerlərdən qəlpələr qopmuşdur. Bu xırda nöqsanlara baxmayaraq, Nuxa abidələri incəsənət nöqteyi-nəzərindən, eləcə də tarixi abidə kimi Azərbaycan memarlığı tarixində əhəmiyyətli yer tuta biləcək dərəcədə qiymətli abidələrdən sayıla bilər.

***Həmçinin, bax: Şəki Xan Qəbristanlığı (Veb-bələdçi)***

---

*[1] Məqalədəki ərəb kitabələri bizim tərəfimizdən M. Nemətin 2001-ci ildə nəşr olunmuş «КОРПУС ЭПИГРАФИЧЕСКИХ ПАМЯТНИКОВ АЗЕРБАЙДЖАНА» (ТОМ II) kitabındakı müvafiq mətnlə tutuşdurulmuş və bir neçə küçik səhv aradan qaldırılmışdır. Fotolar da bizim tərəfimizdən yenidən çəkilmiş və hamısı dəyişdirilmişdir. Məmm.*

*[2] M. S. Nemətova. Mosul kəndindəki «Cümə məscidinin kitabələri». Azərb. SSR EA Məruzələri, 1959, №8.*





*[3] Н. М. Миклашевская. Стенные росписи Азербайджана XVIII-XIX вв. Архитектура Азербайджана, Bakı , 1952, səh. 469.*

*[4] Vaxtilə, Nuxa şəhərinin yuxarı hissəsində olmuş «Gilək məscidi» 1956-cı ilin avqust ayında, müəllif orada olduğu zaman, ancaq yarımuçulmuş minarə və binanın özülü qalmışdı.*

*[5]Hacı Əbdürrəhman bəy doğrudanmı, Səlim xanın oğludur? Mümkündür ki müəllif səhvə yol verir. Məmm.*

*[6] N ə r g i z Ə s g ə r o v a . Xalq sənətinin gözəl nümunələri, «Ədəbiyyat və incəsənət qəzeti», noyabr, 1957-ci il.*

*[7] M. S. Nemətova. İki Gəncə həkkak-xəttatının işi haqqında. «Azərb. SSR EA Xəbərləri», 1953, №3.*

*[8]*

*[9] Ə b d ü l l ə t i f Ə f ə n d i. Şəki xanlarının ixtisar üzrə tarixi, «Maarif işçisi» məcmuəsi, 1929, №2-3 (43-44), səh. 10, 89; H a c ı S e y i d Ə b d ü l h ə m i d. Şəki xanları və onların nəsilləri. Azərbaycan tarixinə dair materiallar, 3-cü buraxılış, Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutu, 1930. səh. 6-8, 16-17.*

*[10] H a c ı S e y i d Ə b d ü l h ə m i d. Göstərilən əsəri, səh. 18;*

*[11] Müəllif hicri tarixi miladiyə çevirmədə, birdən-birə düz 1 il səhvə yol verir; hicri 1230-cu il camadiülaxır ayının 2-si miladi 1815-ci il may ayının 11-dir! Məmm.*

*[12] S ə l m a n M ü m t a z . Şəki xanlarının ixtisar üzrə tarixi (tənqidi), «Maarif işçisi» məcmuəsi, № 2 – 3 (43 – 44), Bakı, 1929, səh. 11 – 12.*

*[13] Yenə orada, səh. 89.*

*[14] Burada hicridən miladiyə çevirmədə xətaya yol verilir; əslidə: «10.12.1858» olmalıdır. Məmm.*

*[15] S ə l m a n M ü m t a z . Göstərilən əsəri, səh. 89.*

*[16] Hicridən miladiyə vaxtilə Salman Mümtaz tərəfindən edilmiş bu çevirmədə 1 il səhvə yol verilib!. Əslində: 24.05.1829. Məmm.*

*[17] K ə r i m a ğ a . Şəki xanlarının ixtisar üzrə tarixi.*

*Azərbaycan tarixinə dair materiallar, I, 1926, səh. 12.*

*[18] Əslində, bu, sözügedən əsərin yazılma tarixidir. Kərim ağa isə Özünün yazdığı kimi Cəfərqulu xanın vaxtında (1806-1816) Nuxaya qayıtmışdır! Məmm.*

*[19] Olmalıdır:* ﺍﻟﺘﺎﻟﻚ

*[20] Həm də oxuna bilər:* ﺗﺮﻫﻢ

*[21] Burada da hicridən miladiyə çevirmədə xətaya yol verilir; əslidə: «26.07.1835» olmalıdır. Məmm.*

*[22] Əslində, hicri 1265-ci il ilin rəcəb ayı, miladi 1849-cu il 23 may tarixində başlayır. Məmm.*

*[23] Quran, LV - 26; 27.*

*[24] Hicri 1271-ci il, miladi 1854-cü ilin 24 sentyabrında başlayır. Məəmm.*

*[25] H a c ı S e y i d Ə b d ü l h ə m i d. Şəki xanları və onların nəsilləri. Azərbaycan tarixinə dair materiallar, 3-cü buraxılış, Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutu, 1930. səh. 19.*

*[26] Qeyd: Hədis yarımçıqdır.*

*[27] Hacı Tutu ağanın dəqiq ölüm tarixi hicri 1276-cı il rəbiülaxır ayının 27-si – miladi 1859-cu il noyabrın 23-dür. Bax: Ədalət Tahirzadə, Şəkinin tarixi qaynaqlarda, Bakı-2005, səh. 223. Məmm.*

*[28] H a c ı S e y i d Ə b d ü l h ə m i d. Şəki xanları və onların nəsilləri. Azərbaycan tarixinə dair materiallar, 3-cü buraxılış, Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutu, 1930. səh. 19.*

*[29] Quran, LV – 26, 27.*

*[30] Quran, XXIX – 57.*

*[31] Ola bilsin ki bu müddəa səhvdir; belə ki Telli bəyim, Əbdülhəmid ağa Əbdül Haşım ağa oğlunun ayaqları altında dəfn edilmişdir, başqa sözlə, Teli bəyimin məzarı, Əbdülhəmid ağa Haşım ağa oğlunun məzarı qarşısındadır. Buna əsasən isə güman etmək mümkündür ki, Telli bəyim, Kərim ağanın oğlu Əbdülhəmid ağanın yox, Haşım ağanın oğlu Əbdülhəmid ağanın qızıdır. Məmm.*

*[32] Bax: Yuxarıdakı qeydə! Məmm.*





## 10.7. MƏHƏMMƏDHÜSEYN XAN MÜŞTAQİ'NİN AQİBƏTİ

*Məhəmmədhüseyn xanın aqibəti barədə dörd material – edam ərəfəsidə özünün yazdığı qoşma, anonim şəxsin qələmə aldığı hekayət, M. V. Vidadinin qələmə aldığı müxəmməs və həmçinin hadisənin tarixinin dəqiqləşdirilməsi üçün bir rusdilli sənəd*

### Müştaqi'nin son şeiri

Ey ağalar, düşdüm təxtü-tacımdan,
Dağıldı nökərim, həm malım mənim.
Neçə kərə əzmi-səfər eylədim,
Tərsə təbdil oldu iqbalım mənim.

Fələk bükdü belim, oxşatdı yaya,
Axıtdı yaşımı döndərdi çaya,
Axır gündə ömrüm keçdi ah-vaya,
Lap pərişan oldu əhvalım mənim.

Oldum zarü-giryan, vardım hər yana,
Bir kimsənə imdad qılmadı mənə,
Müzəyyən otağım qaldı düşmənə,
Tarac oldu taxtım, həm malım mənim.

Qırıldı bəylərim, cümlə havadar,
Üzüldü, əlimdən getdi ixtiyar,
Məclisimdə sayılmayan adamlar
Geydilər atlasım, həm şalım mənim.

Nuxalı eylədi canım qəsdimi,
Yığılıb yer-yerdən tutdular məni,
Kəsdi yağı cəllad başım üstünü,
Yetdi yaman yerə, vay halım mənim.

Üz tutdum, çağırdın o zülcəlalı,
Muradım əksini mən gördüm, vəli.
Xəstə **Müştaqi**'yəm, qaldı üzülü
Əziz balam sarı, ah, əlim mənim.

## 10.8. ANONİM ŞƏXSİN QƏLƏMƏ ALDIĞI HEKAYƏT

Hüseyn xanın əyyami-hökuməti iyirmi iki il olduqda, Hacı Əbdülqadir fürsət tapıb, qəflətən bir gün məxfi gəlib, yanında olan Ərəş və Şəki bəyləri ilə. Ərəş bəylərindən yanında olan bəylər Məlik Əlinin əqrəbalarından imiş, hansı ki Məlik Əlini qətlə yetirməkli ədavətinə. Şəkidən olan bəylər Hacı Şeyx Əli nəslindən olub, onların da Hacı Rəsul bəy ki, Hacı Şeyx Əlinin oğlu və (Məhəmmədhüseyn xanın) yeznəsidir, bunu qətlə yetirməyi cəhətindən kinədar olublar imış. Hacı Rəsul bəyi qətl etməyinə bağışladar ki, mərhumda Hüseyn xanın həmşirəsi (–yəni: bacısı) olub və Hüseyn xan bacısına hörmət edərmiş və amma Hacı Rəsulun qəlbindən xanlıq keçirmiş. Bir gecə öz hərəminə – xanın həmşirəsidir, söhbətində sual edir ki sən xan həmşirəsi olmaq, yaxud xan hərəmi olmaq istərsən? Hərəmi nə cavab veribsə naməlumdur. Ancaq məxfi, qardaşı xana bu keyfiyyəti xəbər edib. Xan xəbərdar olduqda Hacı Rəsul bəyin hərəkətinə diqqət edib görür ki, həqiqətən də xanlıq tədarükündədir. Bir gün hüzuruna tələb ed ib boğdurmaq ilə qətlə yetirir.

Əz an in cümlə (–yəni: o cümlədən), ismi məlum Zaman bəy də (?) bu ittifaqda ki, cümlətani ki altmış adam olurlar, gecə ilən gəlib dağda gizlənib. Səhərdən, adamlar divandan dağılandan sonra qala ki boşallanir və o vaxt da qarovul və ya müstəhfiz (–yəni: mühafizəçi) bərqərar olmayır imiş. Əminlik cəhətinə, qalanın yuxarı qapısından daxil olub, qapıları içəridən bağlayırlar. Qalada ancaq hərəmxanalara məxsus xidmətkarlardan rast gələni qətlə yetirib, xanın üstünə hücum edirlər. Bu vaxt xan da





hərəmxanasına mütəssil (–yəni: bitişik) qurğuşunlu otaqda imiş. Bu əhvalatdan xəbərdar olub, içəridən qapıları bağladıqdan sonra bunlar ilə atışmaq başlayır. Ancaq yanında ikinci oğlu Fətəli xan uşaq, tüfəng doldurub verir imiş. Bir neçə saat atışmadan və bir neçəsini qətlə yetirtdəndən sonra, özünə yara yerləşib, ixtiyardan düşür. Axirələmür (yəni: nəhayət), qapını sındırıb və xanı qətlə yetiriblər (Bu yəqin ki səhvdir! Əslində onu bir həftə saxladıqdan və hansisa müqaviləyə imza atdırdıqdan sonra boğdurmaq yolu ilə edam etmışdilər. Bax: M. V. Vidadinin aşağıdakı müxəmməsinə!). Xan vəfat etmiş, Şəki əhli xəbərdar olub bir parası qalaya hücum edirlər, qapını bağlı görüb. Və içəridən düşmüş adamları cavab verirlər ki xan qətlə yetişibdir və Hacı Əbdülqadir taxtda əyləşib, bir nəsildir, siz əbəs yerə səy edib təzə xana asi olmayın. Bu söz ilə əhli-Şəki rücu' (yəni:–dağılışmaq) edirlər və xan da vəfat edir: tarix-i min yüz doxsan dörddə, hicrətdə (yəni: 1780-cı ildə).

## 10.9. M.V.VİDADİNİN MÜXƏMMƏSİ

Gəl, könül, bir ibrət al, bu gərdişi-dövranə bax!
Cami-heyrətdən dəmi məxmur olub, məstanə bax!
Tut təfəkkür damənin, bir dəm dili-heyranə bax!
Kimsəyə qılmaz vəfa, bu dəhri-bipayanə bax!
Olma məmurinə rağib, axiri viranə bax!

Bivəfadır mülki-dünya, malına aldanma çox,
İzzü cahü dövlətü iqbalına aldanma çox,
Tutma ümmid, əqlü fəhm əhvalına aldanma çox,
Qövmü qərdaşü rəfiq əqvalına aldanma çox,
Hər biri bir rəmz ilə səndən olur bıganə, bax!

Şərhi bimümkün gəlib getmiş cahana çox hümam,
Hər biri əsrində bir sahibhünər, aliməqam,

Şah ola, istər gəda, divanə ya əhli-nizam,
Yetməmiş məqsudinə aləmdə heç ərbabi-nam,
Cümləsin məqtul edib, bu bisərü samanə bax!

Dinlə, ey tüğyani-möhnət, bir hekayət söyləyim,
Didələr giryan edən şərhi-məlalət söyləyim,
Dərdi-bidərmanü daği-binəhayət söyləyim,
Bu sözə nisbət sənə, gəl, bir hekayət söyləyim,
Lütf edib, qıl bir nəzər, bu müxtəsər dəstanə bax!

Noldu gör ol sərvəri-dövran, əmiri-möhtərəm,
Mənbəi-cudü səxavət, mədəni-lütfü kərəm,
Mərdi-meydan, əhli-ürfan, sahibi-tiğü qələm,
Ərseyi-rifətdə guya kim, tikilmiş bir ələm,
Hakimi-Şirvan, Şəki, yəni Hüseyn xanə bax!

Şirdil bir mərd idi kim, şövkətü şəni əzim,
Səfşikən, ədafikən, şəmşirzən, bixövfü bim,
Sərvəri-sahibhəşəm, ətbai çox, mülkü qədim,
Xoşnüma, xəndanliqa, şirinsüxən, təbi həlim,
Neylədi, gəl gör, müqəddər, hikməti-yəzdanə bax!

Həqpərəst, əhli-təvəkkül, pakdil, safcigər,
Baki yox heç kimsədən, cahü cəlalı bikədər,
Bilməmiş rəşkü həsəd insanı eylər dərbədər,
Bağlamış onunla kin əlavü ədna sərbəsər,
Saldılar hər rəng dəvalar tutub böhtanə bax!

Hacı Əbdülqadirü Hacı Məhəmməd kinədar
Saldılar yüz dürlü dəva, oldular ondan fərar,
Etdilər ol dəmdə Dardoqqazı səngər üstüvar,
Tapdı düşmən hər tərəf, yüz oldu qovğa aşikar,
Buldular fürsət, təmami girdilər meydanə, bax!





Kəndxudalar göndərib oğluyla çox and eylədi,
Etmədi bir sud hərçənd əhdü peyvənd eylədi,
Hacı Əbdülqadir ol dəm gör necə fənd eylədi,
Tutdu onları təmamən yerbəyer bənd eylədi,
Verdi İbrahim xana, həm saldılar zindanə, bax!

Gör nələr gəldi o dəm Hacı Məhəmməd başına,
Tutdurub həm anı dəxi qoydu qələ daşına,
Qaldı bir il, verdi can axır əcəl pərxaşına,
Böylədir, hər kim olursa xain öz yoldaşına,
Getdi hər nə var isə mərdümliyi məccanə, bax!

Ol Qarabağ hakimi dövlətli İbrahim xan
Əvvəl-axır onun ilə ta yaman idi yaman,
Gördü fürsət gəldi, fövt etmək deyil əqlə nişan,
Oldu Əbdülqadir ilə müttəfiq həm ol zəman,
Yığdılar bihədd ləşkər, car edib hər yanə, bax!

Qılbu sərriştədə hər hal ol səyü əmək,
Etmədi təqsir, hər dəm verdi simü zər demək,
Gəldilər Carü Tala bəylər təmami binəmək,
Keçdi çox dava-döyüşlər, tul olur şərh eyləmək,
Öldu əvvəl Hacı xan tək novcəvan fərzanə, bax!

Çəkdi Ümmə xanü Əhməd xani-Cöngətay cəri,
Hər biri Dağıstan içrə külli ləşkər sərvəri,
Biləsincə neçə başçı, cümləsi meydan əri,
Bir tərəfdən göndərib topxanə, verdi ləşkəri,
Arxa durdu onlara valiyi-Gürcüstanə bax!

Eylədi hər bir qoşun gəldikcə bir dürlü savaş,
Hər tərəfdən qoydular can almağa meydanə baş,
Keçdi müddət, düşdü xəlqə öylə bir qəhti-məaş,
Olmayıb bir böylə zillət mütləqa aləmdə faş,
Gəlməyib böylə müsibət Rumə, ya İranə, bax!

Artdı qovağa üz verib hər ləhzə bir cəngü cidal,
Öylə kim, gəlməz hesabə oldu məqtulü qital.
Gördü kim, ol mərdi-meydani-bəla, ol pürməlal

Günbəgün etməkdədir əyyam onu aşüftəhal,
Dəmbədəm salmaqdadır dövran onu nöqsanə, bax!

Fətəli xan yanına əzm eyləyib, hicrət qılıb,
Neylədi ol mərd gör ədа ikən hörmət qılıb,
Çəkdi ləşkər biləsincə neçə yol qeyrət qılıb,
Etdi məyus onu həm iqbali-binüsrət qılıb,
Neyləsin insan əgər yar olmasa sübhanə, bax!

Gah Ağası xan Şirvan hakimilə bir zaman
Baş qoyub ədayə qarşı atdılara meydanə can,
Öylə bir cəng etdilər kim, su yerinə axdı qan,

Hasili ol dərdməndə vermədi nüsrət inan,
Atəşi-meydanlara etdi özün pərvanə, bax!

Döndü çün iqbali-dövlət, gəlmədi pərva ona,
Olmadı hər yanə üz tutdusa bir məva ona,
Hər nə var yarü müsahib oldular ədа ona,
Hər tərəfdən verdilər qətl etməyə fitva ona,
Cümlə xunxarü nəməksiz ol Şəki, Şirvanə bax!

Gör necə döndü, təmaşa qıl onun əqranına,
Aşikaravü nihan qəsd etdilər ta canına,
Duydu halı, hər tərəfdən yığdı ləşkər yanına,
Olmadı, çün çarə yox həqdən işin imkanına,
Hər nə tədbir ilə səy etdisə ol mərdanə, bax!

Cəm olub qətlinə onun bir neçə əşrarlər,
Bilməyən nanü nəmək, bihörmətü biarlər,
Ölməyə, öldürməyə bərk etdilər iqrarlər,





Cümlə öz əqvamü əqranı təmam xunxarlər,
Qövm-qardaşa inan, gəl dosta bax, yaranə bax!

Bir günorta vaxtı xali buldular fürsət məgər,
Qalmamış, getmiş dərində hiç dərbandan bəşər.
Doldular ol xabi-qəflətdə yatarkən bixəbər,
Böylədir təqdir: «iza cəəl-qəza əməl-bəsər»,
Özgə fikrə düşmə çox, həqdən gələn fərmanə bax!

Çıxdı ta olcaq xəbər ədayə qarşı bidirəng,
Bir zaman naçar, tənha eylədi şiranə cəng,
Neyləsin yox dəsti-bəxt, iqbali-nüsrət, payi ləng.
Hər tərəfdən üstünə yağdırdılar tiğü tüfəng,
Aqibət məcruh olub qərq oldu əlvan qanə, bax!

Etdilər sülh üzrə ol dəm bir neçə qövlu qərar,
Oldu razı, bildi yalan olduğun biixtiyar,
Saxlayıb bir həftə axır qətl edib məcruhü zar,
Külli-varın etdilər taracü yəğma, tarümar,
Əhli beyti cümlə düşdü növhəvü nalanə, bax!

Əl qoyub cümlə fəsadə tikdilər şeytan evin,
Etdilər guya xərabə din evin, iman evin,
Açdılar babi-fəsad, bağladılar ehsan evin,
Qırdı öz övladını, yıxdı onun sübhan evin,
Hacı Qadir tək caharın fitnəsi şeytanə bax!

Gəl, yetər, ey zülmə rağib, səngdil, səxtcigər,
Bunca xunriz olma, eylə zülmi-nahəqdən həzər,
Yadına gəlməz məgər ruzi-cəza, ey bixəbər,
Noldu, həqdən bir zaman şərm eylə, çıx şamü səhər,
Guş edib məzlumlardan ol gələn əfqanə bax!

Ah kim, ta aləm olmuş mehrü mahın mənzili,
Eyləmiş rövşən dili ahi-siyahın mənzili,

Gah düşər nisbət gədayə padşahın mənzili,
Gah şiri-nər yerin eylər rubahın mənzili,
Dövri-bərəksə nəzər qıl, çərxi-kəcrəftarə bax!

Kimsə qalmaz nikü bəd, ancaq qalır aləmdə ad,
Namurad eylər cahan, hər kim ki, istər bir murad,
Bu musibətnamə tarixin bil, ey fərruxnihad,
İki yeddi, iki qırx olmuşdu min yüzdən ziyad.
Oldu mərhumü şəhid ol kövhəri-yektayə bax!

Böylədir dövran işi, hər gündə bir al eyləmiş,
Aqili nadan ilə pəjmurdəəhval eyləmiş,
Üz verib namərdə, hər dəm mərdi pamal eyləmiş,
Ey Vidadi, gəl ki, bu heyrət məni lal eyləmiş,
Gör nələr qıldı fələk Müştaqi tək insanə, bax!

## 10.10. BİR QƏBİR KİTABƏSİNİN İZİ İLƏ, YAXUD F. X. XOYSKİNİN ƏSLİ-NƏCABƏTİNƏ DAİR TARİXİ FAKTLAR[1]

### ŞƏKİDƏKİ XAN QƏBRİSTANLIĞINDA DƏFN OLUNMUŞ SƏLTƏNƏT BƏYİM F. X. XOYSKİNİN BACISIDIRMI ?

Keçmiş SSRİ-də kommunist rejimi süqut edəndən sonra onun bütün respublikaları kimi Azərbaycanda da, o cümlədən Azərbaycanın bütün şəhərləri kimi Şəkidə də bir sıra prospekt, küçə və s.lərin adlarına «əl gəzdirildi». Məsələn, burada əvvəlki K. Marks prospektinə indi Azərbaycanın görkəmli dövlət xadimi F. X. Xoyskinin adını verdilər...

Lakin həmin addəyişmə əməliyyatı zamanı heç kimin ağlına belə gəlməmişdir ki, yeni F.X.Xoyski prospektində, məhz, eyni şəxslə bağlı təfərrüat mövcud ola bilər. Bəli, biz müəyyənləşdiririk ki, sözügedən prospektin lap başlanğıcında, üz cənub-şərqə doğru sağda yerləşən «Xan qəbristanlığı»nda F.X.Xoyskinin atabir bacısı – 1869-cu ildə dünyasını dəyişmiş





Səltənət bəyim dəfn edilmişdir. Düzdür, mərhuməyə məxsus baş daşı kitabəsində yalnız ərəbcə həkk olunub ki, «*bu qəbir ali rütbəli İsgəndər xanın qızı Səltənət bəyimindir.*»[2] və onun həqiqətən Fətəli xanın bacısı olduğu barədə hər hansı bir tutarlı mülahizənin irəli sürülməsi üçün isə bir qədər geniş araşdırma aparılmasına ehtiyac var. Biz həmin işi bu sətirlərdən sonra daha bir neçə yarımbaşlıq altında görəcəyik. Və eyni zamanda xoyskilərlə bağlı bəzi qaranlıq məqamlara aydınlıq gətirmək, bir sıra maraqlı və əhəmiyyətli tarixi faktları üzə çıxarmaq niyyətindəyik. Lakin bəri başdan qeyd etməliyik ki, ciddi cəhdlərimizə baxmayaraq F. X. Xoyskinin nəsil şəcərəsini tam öyrənmək üçün lazımi qədər məlumat əldə edə bilmədik. Həmin səbəbdən də bu məqalədə dəqiqləşdirilməmiş bəzi şeylərin, məsələn, sözügedən şəxsin anasının, o cümlədən ana tərəfdən baba və nənəsinin, həmçinin, atasının ana nənəsinin adlarının, atasının bizdə mübahisəli vəziyyətdə qalacaq təvəllüd və ölüm tarixlərinin və sairlərin öyrənilməsi işini, bu mövzunu araşdıracaq daha sonrakı tədqiqatçıların öhdəsinə buraxacağıq...

### F. X. XOYSKİNİN NƏSİL ŞƏCƏRƏSİNİN AZ ÖYRƏNİLMƏSİ VƏ BUNUNLA ƏLAQƏDAR OLARAQ ORTAYA ÇIXMIŞ BƏZİ YANLIŞLIQLAR

Belə ki bu məqaləmizə və Pərvin Xəyyam oğlu Mirzəzadənin köməkliyi ilə ingilis dilində İnternet səhifəsinə yerləşdirilmiş Xoy xanlarının nəsil şəcərəsi barədə digər bir materialadək, xoyskilərin genealoji cədvəli tərtib edilməmişdi. Həmin səbəbdən də Azərbaycan dövlətçiliyinin görkəmli simalarından olan F. X. Xoyski haqqında nəşr olunmuş bütün tədqiqat materialları üzrə bir qayda olaraq, onun əsli-nəcabətindən ya heç bəhs olunmur, ya da ki ötəri, həddindən artıq konkret bəhs olunur və bu zaman bəzən səhvə yol verilərək 1814-19-cu illərdə Şəkidə səltənət sürmüş İsmayıl xan onun babası hesab edilir[3]. Halbuki, əslində İsmayıl xanın oğul övladı olmamışdır. Bu qəbil yazılarda F. X.

Xoyskinin atası İsgəndər xanın təvəllüdünün 23-24 il xəta ilə (!) göstərilməsi halına da rast gəlmək mümkündür[4] (İsgəndər xanla bağlı bəzi müəmmalar və təzadlı məlumatlardan isə bir qədər aşağıda, onun adı olan müvafiq yarımbaşlıq altında bəhs ediləcək).

Qəribədir ki, ADC-nin 80 illiyinin keçirilməsi ilə əlaqədar sabiq mərhum prezident H. Əliyev cənablarının 30 yanvar 1998-ci il tarixli sərəncamına əsasən yaradılmış Dövlət Komissiyasının qərarı ilə eyni ildə Bakıda nəşr edilmiş *«Fətəli xan Xoyski – həyat və fəaliyyəti»* adlı kitab Baş Arxivlər İdarəsi tərəfindən tərtib olunsa da, orada da Fətəli xanın əsli-nəcabəti barədə ətraflı elə bir məlumat yoxdur. Halbuki, bu barədə həmin İdarənin nəzdindəki Dövlət Tarix Arxivində bir çox sənədlər olmalıdır və biz aşağıda onlardan şəxsən tanış olduğumuz bir qisminə istinad edəcəyik.

O ki qaldı qeyd olunan İnternet səhifəsindəki materiala, burada xoyskilərlə bağlı xeyli maraqlı və əhəmiyyətli informasiya vardır ki, onların da bir qismi, artıq, öz tədqiqatımızın nəticələri ilə üst-üstə düşmüşdür. Məqaləmizin təqdim olunan indiki redaktəsinə daxil edilmiş bəzilərinin isə haradan götürülməsi bizim üçün məlum olmasa da hər halda nəzərə alınmalıdır ki, onları ciddi qəbul etməməyimiz üçün də əsasımız yox idi.

## F. X. XOYSKİNİN ULU CƏDDİ: HƏSƏN BƏR-MƏKLİ; O, ABBASİ XƏLİFƏSİ HARUN ƏR-RƏŞİDİN HƏMDÖVRÜ OLMUŞDUR!

İlk xoyskilər bu familiyanı qəbul etməzdən əvvəl, Xoy xanları kimi (həm də *«dünbülü»* adlanan kürd tayfasının başçıları kimi) və ya bunların nəslindən olan şəxslər kimi tanınırdılar[5]. Özlərinin rəvayətlərinə görə isə onlar Abbasi xəlifəsi Harun ər-Rəşidin dövründə (786 – 809) yaşamış və adı çəkilənin təqibi nəticəsində 803-cü ildə İrana qaçıb gəlmiş Həsən Bər-Məklidən başlanan *«bərmənidlər»* sülaləsinə mənsubdurlar[6]. Məlumat üçün əlavə edək ki, əslində söhbət *bərməkilər* sülaləsindən gedir və Abbasilər dövründə vəzirlər nəsli kimi tanınan bu sülalənin ən məşhur nümayəndəsi isə Xəlifə Harun ər-Rəşidin vəziri olmuş Cəfər Bərməkidir, hansı ki adına məşhur «Min bir gecə» nağıllarında təsadüf edirik.





## F. X. XOYSKİ NƏSİL ŞƏCƏRƏSİ ÜZRƏ KİMLƏRİN NƏTİCƏSİDİR:

***1.) Xoy hakimi Əhməd xan və onun arvadı Səltənət bəyim Hüseynəli xan Qacar qızının[7];***

1763 – 1786-cı illərdə Xoy hakimi olmuş Əhməd xan, hakimiyyəti dövründə ətraf xanlıqların bir çoxunu da öz nüfuz dairəsi altına sala bilmişdi[8]. Buna görə Türk sultanı ona Azərbaycanın ali sərəsgəri (–baş komandanı) titulunu verib[9]. Əhməd xan 1786-cı ildə öz qardaşı Şahbazın oğlanlarının sui-qəsdi nəticəsində öldürülmüşdür.

Əhməd xanın arvadlarından biri olan Səltənət bəyim isə İrəvan hakimi Məhəmmədqulu xan Qacarın[10] bacısı idi. Bəzi tarixi sənədlərdən məlum olur ki, (əgər heç bir dolaşıqlıq yoxdursa!) o, Əhməd xanın ölümündən sonra qaynı Cəfərqulu xana ərə gedibmiş.

*Əhməd xanla Səltənət bəyimin oğulları Kəlbəli bəy, F. X. Xoyskinin babasıdır – başqa sözlə, atasının atasıdır.*

***2.) Xoy, daha sonra Şəki hakimi olmuş General – leytenant Cəfərqulu xan Xoyskinin və onun arvadı «.?.»n;***

Əhməd xandan sonra qardaşı Cəfərqulu xan Xoy hakimi oldu. Bir müddət sonra (1797-ci ildə?) onun 300 nəfərlə ova getməsindən istifadə edən İran şahı Xoya qoşun göndərib oğlunu, arvadını və qardaşını girov götürdü. Cəfərqulu xan İrəvana getdi. Lakin tezliklə, vəliəhd Abbas Mirzə ordusunun oraya üz tutduğunu eşidib həmin şəhəri də tərk etməyə məcbur oldu. 1804-cü ildə ruslar İrəvanı ələ keçirdikləri vaxt Cəfərqulu xan 200 nəfərlə onların qərargahına gəlib sədaqət andı içdi. Əvəzində general-leytenant rütbəsi və çar Aleksandrın adından qiymətli hədiyyələrlə mükafatlandırıldı[11].

1806-cı ilin axırlarında isə ruslar Şəkinin xanı olmaq üçün Cəfərqulu xanı «dilə tutdular» (– bu ölkənin yerli xan sülaləsinə mə-

nsub şəxslərdən artıq heç birisinin səmimiyyətinə inanmadıqlarına görə!) və çar Aleksandrın 10 dekabr 1806-cı il tarixli[12] fərmanı ilə onu rəsmi şəkildə Şəki xanı təyin etdilər[13]. Yeri gəlmişkən, qeyd edək ki, Cəfərqulu xan hələ 1802-ci ildə, o vaxtkı Şəki hakimi Məhəmməd Həsən xanla müttəfiqlik nümayiş etdirmişdi[14]. Onun yeni təyinatı ilə əlaqədar isə 10 minə yaxın tərəfdarı, yaxud rəiyyət və qohum-əqrəbası Şəki xanlığı ərazisində məskunlaşdı.

Tarixçiliyimizdə Cəfərqulu xanla bağlı bir qədər inandırıcı olmayan belə bir müddəa da var ki, guya o, Xoydan xeyli erməni köçürmüş və bunlar Şəki xanlığı ərazisində 4-5 yeni kənd salıblarmış[15]. Əslində isə biz 1824-cü il Şəki əyalətinin siyahıyaalma aktlarında yalnız Cəfərabad kəndi üzrə 93, Nuxa şəhəri üzrə isə 65 xoy mənşəli erməni ailəsinin qeydə alındığını görürük[16].

Cəfərqulu xan 8 ilə yaxın Şəki xanı olduqdan sonra 22 avqust 1814-cü ildə isitmə xəstəliyindən ölmüşdür[17].

*Cəfərqulu xanın qızı Sara bəyim, F. X. Xoyskinin nənəsidir – başqa sözlə, atasının anasıdır.*

*3.) «.?;.»;* *4.) «.?.».*

## F. X. XOYSKİ KİMLƏRİN NƏVƏSİDİR:

***1.) Əhməd xanın oğlu General-mayor Kəlbəli xan (1775 – 1734) və onun arvadı Sara bəyim Cəfərqulu xan qızının;***

Cəfərqulu xanın ölümündən sonra oğlu İsmayıl xan Şəkidə hakimiyyətə başladı. Və çar Aleksandrın 10 may 1815-ci il tarixli fərmanı ilə rəsmi şəkildə Şəki xanı kimi təsdiqləndi[18]. Lakin o, Rus hakimiyyət dairələrinin ümidlərini doğrultmamışdı. Yüksək çinli Rus məmurlarının öz aralarındakı raportlarında İsmayıl xanı hətta «великий дурак»[19] da adlandırmışdılar[20]. Nəhayət, İsmayıl xan xəstələndi və bir həftəlik yataq vəziyyətindən sonra 24 iyul 1819-cu ildə öldü. Belə bir fürsət gözləyən ruslar isə onun oğul varisinin olmamasını bəhanə edərək Şəki xanlığının ləğv edildiyini və yerində Şəki əyalətinin yaradıldığını elan etdilər[21]. Şamaxı hakimi Mustafa xan o vaxt iddia etmişdir ki İsmayıl xanı ruslar öldürüblər. Ruslar isə öz növbələrində onun, bacısı Sara bəyim





tərəfindən zəhərlənməsindən şübhələndiklərini bildirirdilər[22].

Şəki xanlığının ləğv edilməsindən az sonra, ruslar mərhum xanın qohum-əqrəbasının bir qisminə illik təqaüd kəsdilər. Məsələn, *«Kiçik ağa»* ləqəbi ilə tanınan əmisi oğlu Kəlbəli bəyə (– təvəllüdü 1775-ci ildir[23].) əvvəl 1300, sonra isə 2300; onun anası Səltənət bəyimə 1200 manat və s[24]. Lakin bununla yanaşı, həm də onlara Nuxanı tərk etmək «məsləhət» görüldü.

Bu arada, İran şahının vəliəhdi Abbas Mirzə rəsmi şəkildə Kəlbəli bəyin İrana qayıtmasını istəyirdi. Həmin işin nə vaxt və nə dərəcədə realizə olması barədə hələlik əlimizdə elə bir informasiya yoxdur. Yalnız məlumumuzdur ki, 28 noyabr 1828-ci il tarixli sənəddə onun titulu xan, özü isə *«Xoyu idarə edən şəxs»* kimi göstərilir[25]. Eyni vaxtda Xoy Rus işğalı altında idi və Kəlbəli xanın onlara xidmət etməsinin müqabilində, 10 avqust 1829-cu il tarixdə rütbəsi (–20 ildən artıq idi ki polkovnik idi) artırıldı – general-mayor oldu[26].

Daha sonralar, 26 noyabr 1831-ci il tarixli sənəddə, həmin vaxt Dərbəndən Dağıstanın içərilərinə doğru hərbi missiyaya başlamış rus qoşunlarının komandanlarından biri kimi Kəlbəli xanın da adına təsadüf edirik[27]. Kəlbəli xan 29 iyul 1834-cü ildə Yelizavetpolda (– Gəncə şəhərində) dünyasını dəyişmişdir[28].

**Kəlbəli xan və arvadı Sara bəyimin oğlu İsgəndər xan, F. X. Xoyskinin atasıdır.**

***2.) Şəkili Hacı Molla Zeynalabdin? və onun arvadı «.?.».***

## F.X.XOYSKİNİN VALİDEYNLƏRİ KİMLƏRDİR:

***1.) Atası: General-leytenant İsgəndər xan Xoyski; (O, 1819-cu ilin sentyabr ayında Nuxa (– Şəki) şəhərində anadan olmuşdur, ya 1820-ci il may ayının 25-də başqa bir yerdə?)***

1819-cu ildə xoyluların Nuxadan çıxarılması ilə bağlı yuxarıda bir neçə kəlmə yazdıq. İndi yeri gəlmişkən, bu işin bəzi təfərrüatı barədə: Həmin vaxt Kəlbəli bəy və arvadı Sara bəyim hələ bir müddət burada qalmalı oldular. Belə ki eyni ilin 25 avqustunda

tərtib edilmiş sənəddə onların ləngimələri və bunun səbəbi göstərilmişdir: Sara bəyim 20 günə doğmalıdır, səhhətinin pisləşə biləcəyindən çəkinərək Nuxanı tərk etmək istəmir[29]. Bu fakt bizə imkan verir ki, İsgəndər xanın təvəllüd tarixi və doğulduğu yer barədə nəsə bir mülahizə irəli sürə bilək. Beləliklə, istinad etdiyimiz mənbədə proqnozlaşdırıldığı kimi həqiqətən də Sara bəyim hamiləlik yükündən 20 gün ərzində azad olubsa və bu vaxta qədər yaşadığı şəhəri tərk etməyibsə, deməli, onun övladı 1819-cu ilin sentyabr ayında, özü də Nuxa şəhərində dünyaya göz açmalı idi. Bəs bu hadisə baş verdimi? Körpənin adını nə qoydular?

Nuxa şəhərinin 1848-cu il siyahıyaalma aktlarında 30 yaşlı qvardiya proporşiki İsgəndər xan Kəlbəli oğlu qeydə alınıb[30]. Deməli, onun təvəllüdü 1819-cu il olmalıdır. Buradan da belə çıxır ki, göstərilən ilin təqribən sentyabrında Sara bəyimin Nuxa şəhərində dünyaya gətirdiyi uşaq, İsgəndər xan imiş. 1860-cı ildə tərtib olunmuş ikinci – analoji sənəddə də eyni şəxs 42 yaşında və qvardiya polkovniki rütbəsində göstərilmişdir[31]. Onun təvəllüdü bu dəfə də 1819-ci il kimi alınır. Deməli, 1819-cu ilin sentyabr ayı tarixini, tərəddüd etmədən İsgəndər xanın anadan olduğu vaxt hesab etmək mümkündür! Lakin deyilənə görə, Gürcüstan Respublikasındakı hansısa arxivdə saxlanılan 19-cu əsrin sonlarına aid belə bir sənəddə sözügedən şəxsin təvəllüdü birbaşa 1820-ci il kimi göstərilmişdir[32]. Üstəlik, P. X. Mirzəzadənin hansısa mənbələrə əsasən tərtib etdiyi İnternet səhifəsində İsgəndər xanın təvəllüdü bir qədər də qəti surətdə – 1820-ci il mayın 25-kimi kimi təqdim edilir[33]. Sonuncu tarix tutalım ki daha doğrudur. Və sözügedən şəxs də, ailənin ikinci uşağı kimi, məhz, həmin vaxt altıaylıq da olsa, dünyaya gəlmişdir. Bəs onda, bundan qabaq yuxarıda istinad etdiyimiz 1848-ci və 1860-cı illərdə tərtib edilmiş sənədlərdə nə üçün onun 40 deyil, 42 yaşında olması göstərilmişdir?! Hər halda, razılaşın ki, İsgəndər xan Xoyskinin 1819-cu ilin sentyabr ayında Nuxa şəhərində anadan olması barədə bizim göstərdiyimiz dəlillər kifayət qədər inandırıcıdır və müvafiq tarixi xronologiyaya elə belə





də tətbiq oluna bilər:

**«İsgəndər xan Xoyski 1819-cu ilin sentyabr ayında Nuxa şəhərində anadan olmuşdur.»**

İsgəndər xan, İsmayıl xanın qızı Səadət xanımla ailə qurmuşdu. Səadət bəyimin anası, yəni İsgəndər xanın qaynanası Tuti ağa isə Şəkinin sabiq hakimi Məhəmmədhəsən xanın qızı idi. Yeri gəlmişkən qeyd edək ki, biz bir münşəatda Tuti ağanın öz kürəkəni İsgəndər xana yazdığı məktubuna da rast gəlmişik[34]. O ki qaldı Səadət bəyimin F. X. Xoyskinin anası olub-olmamasına, bu ehtimal üçün, yalnız mənfi fikir söyləmək mümkündür. Belə ki Fətəli xan 1875-ci ildə dünyaya göz açanda, 1819-cu il təvəllüdlü Səadət xanım (o, İsmayıl xanın ölümündən 3-4 gün sonra anadan olmuşdur) ömrünün 56-cı ilini yaşamalıydı. Belə ahıl yaş dövrü də qadınların dünyaya uşaq gətirə bilməsi üçün münasib vaxt hesab edilmədiyinə görə, F. X. Xoyskinin, İsgəndər xanın hansısa yaşca cavan arvadından doğulduğuna inanmağa məcburuq. Məlumat üçün əlavə edək ki, internet səhifəsində – *www.almanach.be/search/i/iran_khoy.html* -də, İsgəndər xanın Səadət bəyimdən başqa daha iki arvadının da olması göstərilir. Və bunlardan da yalnız birinin – Şəkili hacı Molla Zeynalabdinin qızı Şəhrəbani xanımın adı açıqlanır. Eyni mənbədə İsgəndər xanın 1871-ci ildə *Müqəddəs Anna* və *Müqəddəs Vladimir* ordenləri ilə təltif olunması da qeyd edilib. Həmçinin, onun 16.12.1889-cu il tarixdə general-leytenant rütbəsi alması da göstərilmişdir. Biz isə Şəki şəhər sakini Əşrəf Cəfərova məxsus «*Şəkixanovların arxivi*»-ni nəzərdən keçirərkən 19-cu əsrin 75-ci ilinə aid bir məhkəmə sənədi ilə tanış olduq ki, burada həmin vaxt İsgəndər xanın Nuxada *barışdırıcı hakim* vəzifəsində işləməsi və polkovnik rütbəsində olması qeyd edilmişdir[35].

İsgəndər xanın ölüm tarixi də mübahisəlidir. Belə ki mərhum akademik Z. Bünyadov və M. Əliyev onun 1908-ci ildə vəfat etdiyini göstərdikləri halda[36], məlum saytda bu hadisənin tarixi qəti olaraq «*16. 07. 1894-cü il*» hesab edilir[37].

***2.) Anası: Şəhrəbani xanım şəkili hacı Zeynalabdin qızı?***

## XOYSKİLƏRİN MƏZARLARI

*Onlar Kərbəlada torpağa tapşırılırdılar, amma qəbirləri sonralar dünyanın müxtəlif şəhərlərinə səpələndi: Şəkiyə, Gəncəyə, Tiflisə, Moskvaya...*

Məlum olduğu kimi F. X. Xoyski 1920-ci ilin iyun ayında Tiflisdə öldürülüb. Eləcə də, onun qəbri hal-hazırda Tbilisinin müsəlman məzarlığındadır. (20-ci əsrin yalnız son illərində, Şəmkir rayonun sabiq İH başçısı A. Aslanov öz şəxsi vəsaiti hesabına F. X. Xoyskinin qəbrinin üstündə mərhumun büstünü ucaldırmış və abidənin açılış mərasimində isə Azərbaycanın o vaxtkı prezidenti, mərhum H. Əliyev cənabları şəxsən iştirak etmişdir.)

Fətəli xanın bacısı Tuti bəyim (1871– ?) və bir qardaşı Cahangir xan (09.09.1849 –1920; Anası Səadət bəyimdir[38].) Gəncənin *«Səbskar»* məzarlığındakı məqbərədə dəfn ediliblər[39]. Onların ADC dövründə Gəncə general-qubernatorunun müavini olmuş 22.09.1869–cu il təvəllüdlü Hüseynqulu xan adlı qardaşları isə 07.12.1955-ci ildə İstanbulda vəfat etmiş və qəbri də yəqin ki, oradadır. Eləcə də digər qardaş – 15.11.1888-ci təvəllüdlü Rüstəm xan (F. X. Xoyski kimi o da Moskva Universitetinin hüquq fakültəsini bitirmişdir (1901-ci ildə)[40]. ADC-də və Az. SSR-də müxtəlif yüksək vəzifə postlarını tutmuş, 1920-ci ilin sonunda Moskvaya köçərək ailə həyatı qurmuş və orada da müxtəlif dövlət vəzifələrində çalışmışdır.) doğrudan da 1939-cu ildə Moskvada dünyasını dəyişmişdirsə, deməli, onun da qəbrini, yəqin ki, məhz, həmin şəhərdə axtarmaq lazımdır, Başqa bir internet səhifəsində – Azərbaycan MEA Azərbaycan Tarixi Muzeyinin elmi işlər üzrə direktor müavini, tarix elmləri namizədi Kamil Muxtarovun təqdimatında isə oxuyuruq ki, həqiqətən də R. X. Xoyski Moskvadakı Novodeviçye qəbristanlığında dəfn olunmuşdur. Lakin bu tədqiqatçı Rüstəm xanın 1948-ci ildə vəfat etdiyini göstərir[41].





1878-ci il təvəllüdlü başqa qardaşın – Abbasqulu xan Xoyskinin, həmçinin, təvəllüdünü bilmədiyimiz, adını və rütbəsini 1873/1874-cü illərin «*Kavkazskiy kalendar*»ından öyrəndiyimiz[42] polkovnik İsmayıl xan İsgəndər xan oğlu Xoyskinin həyatları kimi, aqibətləri barədə də hələlik, əlimizdə heç bir məlumat yoxdur. 2004-cü ilin yazında Azərbaycan KİV-nin yaydığı bir xəbərə əsasən isə biz, F. X. Xoyskinin Adil xan adlı daha bir qardaşının da adını öyrənmiş olduq. Belə ki, qeyd edilən vaxt, Türkiyədən Azərbaycana təşrif buyurmuş İstanbuldakı Azərbaycan diasporunun fəal üzvü İbrahim xan Xoyski bildirmişdir ki, onun atası Adil xan Xoyski Fətəli xan Xoyskinin qardaşıdır. Amma hələlik, bu məlumatı dəqiqləşdirmək bizə müyəssər olmayıb və mümkündür ki, həmin xəbər hazırlanarkən, nəsə, dolaşıqlığa yol verilmişdir.

O ki qaldı F. X. Xoyskinin Səltənət bəyim adlı bacısına, hansı ki biz məqalənin əvvəlində onun dəfn olunduğu yer barədə artıq yazmışıq, lakin nəyə görə, məhz, Şəkinin yerli xanlarına məxsus qəbristanlıqda torpağa tapşırılması haqqında izahat verməmişik, zənnimizcə, bu sətirlərədək oxucu artıq öz-özünə başa düşməlidir ki, sözügedən mərhumə, ana nənəsi Tuti ağanın Şəkinin yerli xanları nəslindən olması səbəbindən həmin qəbristanlıqda dəfn edilmişdir. Belə ki biz bir qədər əvvəl həm də qeyd etdik ki, İsgəndər xanın qaynanası, Şəkinin yerli xanlarından olan Məhəmmədhəsən xanın qızıdır. 2009-cu ilin əvvəllərində isə bu sətirlərin müəllifi, Şəki «Xan qəbristanlığı»nda xoyskilərə aid ikinci bir baş daşını – İsmayıl xanın qızı və İsgəndər xan Xoyskinin arvadı olmuş Səadət bəyimin baş daşısını ilk dəfə olaraq aşkar etdi[43]. Maraqlıdır ki, bu baş daşı, mərhumənin qızı Səadət bəyimin baş daşı ilə eyni üslubda və eyni materialdan hazırlanmışdır və bu baxımdan, onlar həmin qəbristanlıqdakı digər baş daşılardan fərqlənirlər.

Fətəli xanın atası, İsgəndər xanın məzarının harada olması məsələsinə gəlincə isə, əgər tam dəqiqləşdirmək mümkündürsə ki onun nəşi Gəncədəki Səbskar məqbərəsində deyil, bu halda

güman edə bilərik ki, sözügedən şəxs də ata-babaları kimi son nəhayətdə Kərbəlada torpağa tapşırılıb. Belə ki İsgəndər xanın atası Kəlbəli xanın ölümündən bir ay sonra – 1834-cü il avqustun 30-da cənazəsi Kərbəlaya göndərilmiş[44], eləcə də 1819-cu ildə İsmayıl xanın ölümündən də sonra həmin bu Kəlbəli bəy rus hakimiyyət dairələrinə rəsmən müraciət edərək mərhumun nəşinin Kərbəlaya aparılması üçün təşkilati köməklik göstərilməsini istəmişdir[45].

## FƏTƏLİ XAN XOYSKİ AİLƏSİNİN GENEALOJİ CƏDVƏLİ








*[1]Bu məqalə «Şəkinin səsi» qəzetindən əlavə, həm də Azərmaycan MEA-nın «Elm « qəzetində (4 oktyabr, 2002-ci il) və Almaniyada nəşr olunan «Jahrbuch Aserbaidschanforschung» məcmuəsində (2007) də dərc olunub. Məqalənin indi, bu saytda yerləşdirilmiş variantı isə 06.05.2009-cu il tarixdə redaktə edilmişdir və heç yerdə nəşr olunmayıbdır!*

*[2]M. S. Nemətova, Nuxa Xan qəbr. **Azərb. EA Xəbərləri** , 1961, № 6, səh. 32 və M. C. Неймат, **Корпус эпиграфических памятников Азербайджана**, Bakı, 2001, 2-ci cild, səh.128, №710. (Bax: Veb-də )*

*[3]a) D. Seyidzadə / A. Rüstəmli, Fətəli xan Xoyskinin., **Dirçəliş**, 1998, №5; b) Ə. İsayev, **Gəncə üsyanı**, Bakı, 1997, səh. 55–56.*

*[4]Z. Bünyadov, M. Əliyev, **Fətəli xan Xoyski**, Bakı, 1997, səh. 3.*

*[5] N. Mustafayeva, **Cənubi Azərbaycan xanlıqları**, Bakı, 1995, səh. 56.*

*[6] И. Л. Сегаль, **Елисаветпольская губерния**, Tiflis, 902, səh. 11.*

*[7] Hüseynəli xan Qacar 1762-1783-cü illərdə İrəvan hakimi olmuşdur.*

*[8] N. Mustafayeva, **Cənubi Azərbaycan xanlıqları**, Bakı, 1995, səh. 48.*

*[9] N. Mustafayeva, **Cənubi Azərbaycan xanlıqları**, Bakı, 1995, səh. 56.*

*[10] 1784–1805-ci illərdə hakmiyyətdə olub.*

*[11] N. Mustafayeva, **Cənubi Azərbaycan xanlıqları**, Bakı, 1995, səh. 69.*

*[12] Bu və aşağıda 1920-ci ildən əvvələ təsadüf edən bütün tarixlər Yuli təqvimilədir!*

*[13] **АКАК (– Акты, собранные Кавказской Археографической Комиссией)**, T. III. Тифлис, 1869, səh. 271, № 488.*

*[14] **АКАК**, T. I . Тифлис, 1866. səh. 380, № 494.*

*[15] R. B. İsmayılov, **Azərbaycan tarixi**, Bakı, 1993, səh. 31.*

